# SƏQƏLEYN

## TƏRK EDİLMİŞ PEYĞƏMBƏR VƏSİYYƏTİ

إني تارك فيكم الثقلين
كتاب الله وعترتي أهل بيتي
وإنهما لن يتفرقا
حتى يردا علي الحوض

Toyib Olavuyi

# SƏQƏLEYN

## TƏRK EDİLMİŞ PEYĞƏMBƏR VƏSİYYƏTİ

TOYİB OLAVUYİ

BAKI - 2017





**Kitabın adı:** Səqəleyn hədisi: tərk edilmiş peyğəmbər vəsiyyəti

**Müəllif:** Toyib Olavuyi

**Tərcüməçi**: Kollektiv

**Elmi redaktor:** Əli Abdullah

**Dizayn:** Xəlil Məmmədov




Bu tədqiqat işimizdə Səqəleyn hədisi barədə fərqli fikirləri bir-bir nəzərdən keçirmiş və xüsusilə İbn Teymiyyənin iddialarını ən detallı şəkildə incələmişik. Biz çox sayda mənbələrlə "Səqəleyn" və "Xəlifəteyn" hədislərinin mövcudluğunu və etibarlılığını isbat etmiş, "Səhih Müslim"dən tutmuş bütün ən mötəbər əhli-sünnə kitablarından dəlillər təqdim etmişik. Biz bu rəvayətlərin müxtəlif sənədlərini diqqətlə araşdırmış, həmçinin öndəgedən əhli-sünnə hədis alimlərindən, o cümlədən Əllamə əl-Əlbani, Şeyx əl-Ərnaut  və s.-dən rəvayətlərin etibarlılıq dərəcələri barədə sitatlar gətirmişik. Eynilə də, hər iki rəvayətin mətnini incəliklə tədqiq etmiş, onların həqiqi mənalarını üzə çıxarmaq üçün köməkçi rəvayətlərdən istifadə etmişik. Məqsədimiz budur ki, insanların Qiyamət günün bilməmək, eşitməmək, görməmək kimi bəhanələri olmasın.

Səmimi qəlbdən inanırıq ki, bu kitab həqiqətən Allahın doğru yolunu axtaran hər bir insana çox faydası olacaq. Allahdan bütün günahlarımızın bağışlanmasını və bu işi bizdən layiqli ibadət olaraq təhvil almasını diləyirik.

Allahın salamı və salavatı Peyğəmbər və onun pak itrətinin üzərinə olsun.





# MÜNDƏRİCAT







بسم الله الرحمن الرحيم

هو الحبيب الذي ترجي شفاعته

لكل هول من الأهوال مقتحم

مولاي صلي وسلم دائماً ابدا

على حبيبك وعترته أهل بيته

خير خلقك كلهم

**Bu kitab İmam Həsən (ə) və İmam Hüseynə (ə) həsr edilir.**





## TƏŞƏKKÜRNAMƏ

**Dəstəklərindən ötrü xüsusi təşəkkürlərimi Tural İslam, Anila Sultan, Əli Bakir, Nadir Zaveri, Əmmar Müslim, Əhməd Olavuyi, Səaduddin Mahmud, Loğman İbrahimə, o cümlədən aşağıdakı qardaş və bacılara çatdırmaq istəyirəm: Şeyx Muhəmməd Nura Dass, Şeyx Muhibullah Əli, Şeyx Əbu Bəkr Bello Səlati, Vahid Afolabi, Dr.Əbdüllətif Saliu, Makayıl Zəkəriyyə, Rauf Əlizadə, Cəfər Mer, Stiv Deyvis, Cəfər Abbas, Cəbrayıl ibn Mıkayıl, Muhəmməd Əli Xəlil, Əhməd Hakim, Həsən Buxari, Seyid Cerri Heydər, Omidiju Nurəddin, İbrahim Olasunkonmi Bello, Qasim Aqbonika Salihu, İlani Əbu Bəkr, Munir Bəhsun, Kamal İsmayıl, Bilal Bernard Nolan, Dilan Esteban, Aquib Mehdi Rizvi, Seyid Əli Rza, Səccad Əbu Cəfər Bektaş, rizvan Həmud, Əkrəm Abbas, Əli Husneyn, Nadir Karun, Henna Rai, Rizziandr Zeyrul, Nasir Həsən, Seyid Ömər Kazımi və Hüseyn Əli Nasir. Allah onların hamısını, o cümlədən imami şiə və əhli-sünnədən olan sevgili qardaş-bacılarımızı salamat eləsin.**

**Qeyd: Təşəkkürnamə siyahısında həmyerlilərimizin adlarını görmək ayrıca bir qürurdur.**





# ÖN SÖZ

Əhli-sünnə vəl-cəmaat, bir qayda olaraq, Əhli-beyt (ə.s) imamlarının doktrinasını qəbul etmirlər. Hətta İbn Teymiyyə bu düşüncə ilə fəxr edir:

**قال الرافضي و في الفقه الفقهاء يرجعون إليه**

**و الجواب أن هذا كذب بين فليس في الأئمة الأربعة و لا غيرهم من أئمة الفقهاء من يرجع إليه في فقهه**

**أما مالك فان علمه عن أهل المدينة و أهل المدينة لا يكادون يأخذون بقول علي بل اخذوا فقههم عن الفقهاء السبعة عن زيد و عمر و ابن عمر و نحوهم**

**أما الشافعي فانه تفقه أولا على المكيين أصحاب ابن جريج كسعيد بن سالم القداح و مسلم بن خالد الزنجي و ابن جريج اخذ ذلك عن أصحاب ابن عباس كعطاء و غيره و ابن عباس كان مجتهدا مستقلا و كان إذا أفتى بقول الصحابة أفتى بقول أبي بكر و عمر لا بقول علي و كان ينكر على علي أشياء ثم أن الشافعي اخذ عن مالك ثم كتب كتب أهل العراق و اخذ مذاهب أهل الحديث و اختار لنفسه**

**و أما أبو حنيفة فشيخه الذي اختص به حماد بن أبي سليمان و حماد عن إبراهيم و إبراهيم عن علقمة و علقمة عن ابن مسعود و قد اخذ أبو حنيفة عن عطاء و غيره**

**و أما الإمام احمد فكان على مذهب أهل الحديث اخذ عن ابن عيينة و ابن عيينة عن عمرو بن دينار عن ابن عباس و ابن عمر و اخذ عن هشام بن بشير و هشام عن أصحاب الحسن و إبراهيم النخعي و اخذ عن عبد الرحمن بن مهدي و وكيع بن الجراح و أمثالهما و جالس الشافعي و اخذ عن أبي يوسف و اختار لنفسه قولا و كذلك إسحاق بن راهويه وابو عبيد ونحوهم**

**و الاوزاعي و الليث اكثر فقههما عن أهل المدينة و أمثالهم لا عن الكوفيين**

**Rafizi[1] deyir: "Fiqhdə (sünni) fəqihlər ona (Əliyə) müraciət edirlər."**

**Cavabında deyirik ki, bu aşkar yalandır. Dörd imam arasından və digər fiqh imamlarından heç kim fiqhi məsələlərdə ona (Əliyə) müraciət etmir.**

**Malik elmini Mədinə əhalisindən götürmüşdür. Mədinəlilər isə demək olar ki, Əlidən bir şey öyrənməyiblər. Onlar öz fiqhlərini yeddi fəqihdən - Zeyd, Ömər, İbn Ömər və digər bu kimi şəxslərədən götürürdülər.**

**Şafei fiqhi əsasən Məkkəlilərdən-İbn Cüreycin əshabından məsələn, Səid ibn Səlim əl-Qədah və Müslim ibn Xəlid əl-Zənci kimi səhabələrindən öyrənmişdi. İbn Cüreyc isə öz növbəsində İbn Abbasın Əta və s. kimi səhabələrindən öyrənmişdi. İbn Abbasa gəldikdə, o, müstəqil müctehid idi və səhabələrin sözləri əsasında fətva verərkən də Əlinin yox, Əbu Bəkr və Ömərin sözlərinə əsaslanardı. Həmçinin, o (İbn Abbas), Əlidən gələn bəzi məsələləri inkar edərdi. Bundan başqa, Şafei Malikdən (fiqh) öyrənmiş, daha sonra İraq əhlinin kitablarını yazaraq əhli-hədisin məzhəbini qəbul etdi və özü üçün yol müəyyən etdi.**

**Əbu Hənifənin əsas şeyxi Həmmad ibn Əbi Süleyman idi. Həmmad is öz növbəsində İbrahimdən, o, Əlqəmədən, Əlqəmə özü isə İbn Məsuddan elm almışdır. Əbu Hənifə həmçinin Əlta və digərlərindən də elm götürüb.**

**İmam Əhməd isə əhli-hədis məzhəbinə tabe olub. O, elmi İbn Uyeynədən, İbn Uyeynə isə öz növbəsində İbn Abbas və İbn Ömərdən elm öyrənmiş Əmr ibn Dinardan əxz etmişdir.**

[1] Əllamə Hillini nəzərdə tutur.





**Həmçinin, o, Hişam ibn Başirdən də elm öyrənmişdir. Hişam isə Həsən (əl-Bəsri) və İbrahim ən-Nəxainin səhabələrindən elm almışdır. Bundan əlavə, o (Əhməd) Əbdür-Rəhman ibn Mehdi, Vəki ibn əl-Cərrah və bu kimi şəxslərdən elm əxz etmişdir. O, paralel olaraq, Şafeinin yığıncaqlarında iştirak etmiş, Əbu Yusufdan elm götürmüş və özü üçün bir yol seçmişdir. Həmçinin İshaq ibn Rəhaveyh, Əbu Ubeyd və bu kimi şəxslərdən də elm əxz etmişdir.**

**Əvzai və əl-Leysin fiqhlərinin əksər hissəsi isə Kufə əhalisindən yox, Mədinə əhalisi və bu kimi şəxslərdən əxz olunmuşdu.[2]**

Qısaca desək, heç bir sünni fiqh məktəbi Əli, Həsən, Hüseyn və Peyğəmbər (s) nəslindən gələn digər imamların fikirlərini mənimsəməmişdir. Sünni imamları adətən onların fiqh barədə rəvayətlərini görməzdən gəlmişlər.

Lakin, əhli-sünnənin bu münasibəti təkcə fiqhlə kifayətlənməmişdir. İbn Teymiyyəyə görə əhli-sünnə imamları Quran təfsiri və hədisdə də Əhli-beyt imamlarına etibar etməmişlər.

**وهذه كتب الحديث والتفسير مملوءة بالآثار عن الصحابة والتابعين والذي فيها عن علي قليل جدا**

**Bu hədis və təfsir kitabları səhabə və tabeindən gələn rəvayətlərlə zəngindir, lakin Əlidən çox az (rəvayət) qeyd edilmişdir.[3]**

Həmçinin yazır:

**قال الرافضي أما المالكية فاخذوا علمهم عنه و عن أولاده**

**و الجواب أن هنا كذب ظاهر فهذا موطأ مالك ليس فيه عنه و لا عن أحد أولاده إلا قليل جدا و جمهور ما فيه عن غيرهم فيه عن جعفر تسعة أحاديث و لم يرو مالك عن أحد من ذريته إلا عن جعفر و كذلك الأحاديث التي في الصحاح و السنن و المساند منها قليل عن ولده و جمهور ما فيها عن غيرهم**

**Rafizi deyir: "Malikilər öz elmlərini ondan (Əlidən) və onun övladlarından götürmüşlər."**

**Cavabında deyirik ki, bu, açıq-aşkar yalandır. Malikin "Muvatta" kitabında ondan və onun övladlarından çox az şey nəql edilmişdir. Əksər hissəsi digərlərinə məxsusdur. Orada Cəfərdən 9 rəvayət var və Malik onun (Əlinin) övladları arasında Cəfərdən başqasından rəvayət nəql etməmişdir. "Səhih", "Sünən" və "Müsnəd" kitablarında da vəziyyət eyni cürdür. Yəni, onun (Əlinin) övladlarından çox az şey qeyd edilib. Məlumatların əksəriyyəti digərlərindən nəql edilib.[4]**

İbn Teymiyyə bununla da kifayətlənməyərək yazır:

---

[2] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.7, s.529-531
[3] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.8, s.43
[4] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.7, s.531





**والمتقدمون منهم كعلى بن الحسين وابنه أبي جعفر وابنه جعفر بن محمد قد نقل عنهم من العلم قطعة معروفة وأخذ عن غيرهم أكثر من ذلك بكثير كثير وأما من بعدهم فالعلم المأخوذ عنهم قليل جدا/**

**Onların mütəqəddimləri Əli ibn Hüseyn (Zeynəlabidin), oğlu Əbu Cəfər (əl-Baqir), onun da oğlu Cəfər ibn Muhəmməd (əs-Sadiq) hesab edilirlər ki, onlardan bir para məlum şeylər nəql edilmişdir. Ancaq (əhli-beytdən olmayan) digərlərindən rəvayət olunanlar qat-qat çoxdur. Onlardan sonra gələnlərdən (əhli-beyt imamlarından) əxz olunmuş elm isə çox az miqdardadır.**[5]

Bəli, Əhli-beyt irsi əhli-sünnə vəl-cəmaat tərəfindən əməlli başlı boykota məruz qalmışdır. Hətta bu gün hər hansı bir əhli-sünnə mənsublu şəxs Əhli-beytə tabe olmaq istəsə, bunu öz sünni kitabları ilə etmək mümkünsüz olacaq. Belə ki, əhli-sünnə kitablarında onların fikirlərinə çox az yer verilb və onlardan çox az sayda rəvayət nəql edilib.

Onu da nəzərə alsaq ki, Allah Rəsulu (s) özündən sonra bütün ümmətin Quran və sünnə üzərində sabit qalmaları üçün Əlini və onun övladlarını xəlifə olaraq qəbul edərək hər bir məsələdə onlara tabe olmalarını bildirib, o zaman vəziyyət daha da mürəkkəbləşir. Sual yaranır ki, bəs əhli-sünnə mənsublu şəxs öz məzhəbini tərk etmədən Peyğəmbər (s) buyuruqlarına necə tabe olsun? Veriləcək cavabı müəyyən etmək çox çətindir. Belə çıxır ki, sünni islamı Peyğəmbərə (s) tabesizlik üzərində inşa edilib. Bəs əhli-sünnə mənsubları bu çaşqınlıqdan necə baş çıxarırlar?

Əhli-sünnə alimləri "Səqəleyn" və "Xəlifəteyn" hədislərinə münasibətdə 4 fərqli görüş nümayiş etdirmişlər. Bəziləri, İbn Teymiyyə kimi daha asan yolu seçərək bu rəvayətin əhli-sünnə mənbələrində zəif olduğunu bildirmişlər. Görünür belə etməklə Əhli-beyti tərk etməyin problemli nəticələri ilə qarşılaşmırlar.

Digər bir qrup alim isə hədisin səhihliyini, doğruluğunu qəbul edir, lakin "möhkəm sarılın" ifadəsini Peyğəmbərin itrətinə (nəslinə) "sevgi, məhəbbət bəsləmək" və onlara qarşı "mehriban olmaq" mənasında izah edirlər.

Üçüncü dəstə əhli-sünnə alimləri bu hədislərin səhih olduğunu və həqiqətən də bütün ümmətə Peyğəmbərin (s) itrətinə tabe olmaq və onların ardınca getməyin

[5] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.4, s.108





vacib olduğunu qəbul edir, həmçinin, iddia edirlər ki, onlar əslində Əhli-beytin həqiqi ardıcıllarıdırlar.

Əhli-sünnə alimləri arasındakı dördüncü qrup mənsubları isə ən ucuz yolu seçərək hədis barədə ölüm səssizliyinə üz tuturlar. Onlar heç bir halda Səqəleyn və Xəlifəteyn hədisləri barədə danışmır və yazmırlar. Çox güman ki, bu yol da "təhlükəni" xeyli azaldır və əhli-sünnənin öz yolunda axsamadan addımlamasına şərait yaradır.

Bu tədqiqat işimizdə sadalanan hər dörd fərqli fikri bir-bir nəzərdən keçirmiş və xüsusilə İbn Teymiyyənin iddialarını ən detallı şəkildə incələmişik. Biz çox sayda mənbələrlə "Səqəleyn" və "Xəlifəteyn" hədislərinin mövcudluğunu və etibarlılığını isbat etmiş, "Səhih Müslim"dən tutmuş bütün ən mötəbər əhli-sünnə kitablarından dəlillər təqdim etmişik. Biz bu rəvayətlərin müxtəlif sənədlərini diqqətlə araşdırmış, həmçinin öndəgedən əhli-sünnə hədis alimlərindən, o cümlədən Əllamə əl-Əlbani, Şeyx əl-Ərnaut və s.-dən rəvayətlərin etibarlılıq dərəcələri barədə sitatlar gətirmişik. Eynilə də, hər iki rəvayətin mətnini incəliklə tədqiq etmiş, onların həqiqi mənalarını üzə çıxarmaq üçün köməkçi rəvayətlərdən istifadə etmişik. Məqsədimiz budur ki, insanların Qiyamət günün bilməmək, eşitməmək, görməmək kimi bəhanələri olmasın.

Səmimi qəlbdən inanırıq ki, bu kitab həqiqətən Allahın doğru yolunu axtaran hər bir insana çox faydası olacaq. Allahdan bütün günahlarımızın bağışlanmasını və bu işi bizdən layiqli ibadət olaraq təhvil almasını diləyirik.

Allahın salamı və salavatı Peyğəmbər və onun pak itrətinin üzərinə olsun.





Allahın Rəsulu (s) hicrətin 10-cu ilində (milad tarixilə 632-ci ildə) sonuncu həcc ziyarətinə -Vida Həccinə yola düşdü. O zamankı İslam dünyasının hər bir yerindən müsəlmanlar onun rəhbərliyi və öndərliyində həcc əməllərini yerinə yetirmək üçün Ərəfatda cəmləşmişdilər. Həmin gün Allah Rəsulu (s) insanlıq tarixinin ən mühüm xütbəsini etmişdi. İmam ət-Tirmizi (ö.279 h.) bu barədə yazır:

**حدثنا نصر بن عبد الرحمن الكوفي حدثنا زيد بن الحسن هو الأنماطي عن جعفر بن محمد عن أبيه عن جابر بن عبد الله قال رأيت رسول الله صلى الله عليه و سلم في حجته يوم عرفة وهو على ناقته القصواء يخطب فسمعته يقول يا أيها الناس إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا كتاب الله وعترتي أهل بيتي**

**Nəsr ibn Əbdürrahman əl-Kufi – Zeyd ibn əl-Həsən əl-Ənmati – Cəfər ibn Muhəmməd – atası Muhəmməd – Cabir ibn Abdullah sənədi ilə nəql edilir ki, Cabir dedi:**

**Allah Rəsulunu (s) Həcc vaxtı Ərəfə günü Qəsvə adlı dəvəsinin üzərində xütbə oxuyarkən gördüm. Onun belə dediyini eşitdim: "Ey insanlar! Sizin üzərinizdə[6] elə iki əmanət qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və itrətim-Əhli-beytim."[7]**

Ət-Tirmizi rəvayət haqqında deyir:

**وهذا حديث حسن غريب من هذا الوجه و زيد بن الحسن قد روى عنه سعيد بن سليمان وغير واحد من أهل العلم**

**Hədis bu şəkliylə həsən ğəribdir. Zeyd ibn əl-Həsənə gəldikdə, Səid ibn Süleyman və digər elm əhli də ondan rəvayət nəql etmişdir.[8]**

Əllamə əl-Əlbani də qısa olaraq demişdir:

**صحيح**

**Səhihdir.[9]**

Əl-Əlbani özünün "Silsilətul-əhadisis-səhihə" kitabına deyir:

**"يا أيها الناس! إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا، كتاب الله**

[6] Burada "fikum" sözü istifadə edilmişdir. Səqəleyn hədisinin tərcüməsində bu ifadə adətən "aranızda" kimi tərcümə edilir. Ancaq müəllifin fikrincə, klassik ərəb dilçiliyində "fi" önsözünün "üzərində", "üstündə", "arasında" mənaları var. Məsələn, Əllamə Əlbani (ö. 1420 h.) "fi" önqoşması barədə özünün "Silsilətul-əhadisis-səhihə" kitabında (c.2, səh.715, №925-12) yazır:

قوله تعالى: {أأمنتم من في السماء}؛ أي: على السماء؛ أي: فوق العرش، وبذلك فسرها علماء السلف والخلف -ومنهم ابن عبد البر في "التمهيد"، والبيهقي في كتابيه: "الأسماء" و"الاعتقاد"

Allahın-Taalanın "Əminsiniz ki, göydə olan..." (67:16) buyuruğu: yəni, səmanın üzərində, yəni, ərşin fövqündə. Keçmiş (sələf) və sonrakı (xələf) alimlər - onlardan İbn Əbdül-bərr "Təmhid" kitabında, əl-Beyhəqi "əl-Əsma vəl-İtiqad" kitabında - bu cür izah etmişlər.

İmam əz-Zəhəbi (ö.748 h.) özünün "Müxtəsərul-Uluv lil-Aliyyul-əzim" əsərində (səh.245-246, №298) yazır:

قال أبو عبد الله الحاكم: قال الفقيه أبو بكر أحمد بن إسحاق الضبعي النيسابوري: قد تضع العرب "في" موضع "على" قال الله تعالى: {فسيحوا في الأرض} وقال: {ولأصلبنكم في جذوع النخل} ومعناه على الأرض وعلى النحل، فكذلك قوله: {من في السماء} أي من على العرش، كما صحت الأخبار عن رسول الله صلى الله عليه وسلم.

Əbu Abdullah əl-Həkim dedi: Fəqih olan Əbu Bəkr Əhməd ibn İshaq əd-Dəbi ən-Nisaburi buyurdu: "Ərəblər bəzən "fi"ni "üzərində" mənasında istifadə edirlər. Allah-Taala buyurub: "Elə isə yer üzündə sərbəst gəzib dolaşın..." (9:2). Həmçinin buyurub: "Mən də sizin əl-ayağınızı çarpaz kəsdirib xurma ağaclarının kötüklərindən asacağam." (20:71). Bunların mənası (müvafiq olaraq), "yer üzərində" və "xurma ağacları üzərində" deməkdir. Həmçinin, Onun " göydə olan..." buyuruğu da bu qəbildəndir, yəni ALlah Rəsulunun (s) səhih rəvayətlərinə əsasən "ərşin üzərində" deməkdir.

Eyni ifadə "Səqəleyn" hədisində də istifadə edilmişdir. Fikrimizcə, sözügedən hədisdə Allah Rəsulu (s) Quranı və öz itrətini bizim aramızda qoymaqla bizimlə bərabərləşdirmir, əksinə onları bizim rəhbərlərimiz elan etməklə onlara tabe olmağımızı əmr edir. Ona görə də "fi" ön qoşması burada məna etibarilə "aranızda" yox, "üzərinizdə" tərcümə edilir.

[7] Əbu İsa ət-Tirmizi, əl-Cami' əs-Sahih Sünən ət-Tirmizi c.5, s.662, №3786

[8] Həmin mənbə

[9] Həmin mənbə





وعترتي أهل بيتي ".

أخرجه الترمذي (2 / 308) والطبراني (2680) عن زيد بن الحسن الأنماطي عن جعفر عن أبيه عن جابر بن عبد الله قال: " رأيت رسول الله صلى الله عليه وسلم في حجته يوم عرفة، وهو على ناقته القصواء يخطب، فسمعته يقول: " فذكره، وقال: " حديث حسن غريب من هذا الوجه، وزيد بن الحسن قد روى عنه سعيد بن سليمان وغير واحد من أهل العلم ".

قلت: قال أبو حاتم، منكر الحديث، وذكره ابن حبان في " الثقات ". وقال الحافظ: " ضعيف ".

قلت: لكن الحديث صحيح، فإن له شاهدا من حديث زيد بن أرقم

**"Ey insanlar! Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və itrətim, Əhli-beytim."**

**Ət-Tirmizi (2/308) və ət-Təbərani (2680) (öz kitablarında) rəvayət etmişlər ki, Zeyd ibn əl-Həsən əl-Ənmati, Cəfərdən, o da atasından, o da Cabir ibn Abdullahdan nəql edir ki: "Allah Rəsulunu (s) Həcc vaxtı Ərəfə günü Qəsvə adlı dəvəsinin üzərində xütbə oxuyarkən gördüm. Belə deyirdi..." Sonra (Tirmizi) onu (hədisi) qeyd edir və deyir: "Hədis bu şəkli ilə həsən ğəribdir. Zeyd ibn əl-Həsənə gəldikdə, Səid ibn Süleyman və digər elm əhli də ondan rəvayət nəql etmişdir."**

**Mən (Əlbani) deyirəm: Əbu Hatim deyib: "Munkərul-hədisdir". İbn Hibban onu "əs-Siqat" əsərində qeyd etmişdir. Əl-Hafiz deyib: "Zəifdir".**

**Mən (Əlbani) isə deyirəm: "Lakin hədis səhihdir. Belə ki, onun Zeyd ibn Ərqəm hədisindən şahidi vardır."[10]**

Bu sözlər əl-Əlbaninin hədisləri səhih hesab etməsi üslubunu göstərir. Tirmizidən fərqli olaraq, o, rəvayətin sənədini Zeyd ibn əl-Həsən əl-Ənmati səbəbindən zəif hesab edir. Ancaq o, bu hədisin həqiqətən Peyğəmbər (s) tərəfindən deyilməsinə inanır, çünki Zeyd ibn Ərqəmin Ərəfatdakı hədisindən əlavə şahidi də var.

Peyğəmbərin "Səqəleyn" hədisini digər məkanlarla yanaşı Ərəfatda da deməsinin dəlili yalnız əl-Ənmati yolu ilə nəql edilən hədisə əsaslanır. Belə olduqda, əgər bu hədisin sənədi zəifdirsə, onun Peyğəmbər (s) tərəfindən deyilməsi sübut edilsə də, məhz Ərəfatda deyilməsinin isbatı mümkünsüz olur. Bununla belə, İmam ət-Tirmiziyə görə Allah Rəsulu (s) bu hədisi əvvəlcə Ərəfatda, daha sonra isə Qədir-Xumda[11] deyib. Əllamə əl-Əlbani bunu belə izah edir:

أقول: وجه ذلك أن جمع الترمذي بين لفظتي " غريب " و" حسن " إنما يعني في اصطلاحه أنه حسن لذاته

---

[10] Nasiruddin əl-Əlbani, Silsilətul-əhadisis-səhihə, c.4, səh.355-356, №1761

[11] Biz daha sonra hədisin Qədir-Xumda deyilməsini əhli-sünənin səhih rəvayətləri ilə isbat edəcəyik. Nasiruddin əl-Əlbani, Silsilətul-əhadisid-daifə, c.2, səh.185, №764





**Deyirəm: Bunun səbəbi budur ki, ət-Tirmizi "həsən" və "ğərib" sözlərini birlikdə işlətdikdə, bu onun özünəməxsus bir termini olaraq, sənədinin özü-özlüyündə həsən dərəcəsində olduğu deməkdir.**[12]

Deməli, ət-Tirmizi hədisin sənədindəki əl-Ənmati adlı ravini etibarlı hesab edir, sənədi isə həsən dərəcəsində qiymətləndirib. Araşdırmamızdan bu nəticəyə gəlirik ki:

1. ət-Tirmizi hədisin əl-Ənmati yolu ilə nəlq olunan sənədini müstəqil olaraq həsən dərəcəsində qiymətləndirib. Ancaq əl-Əlbani həmin sənədin zəif olduğunu bildirib.

2. Hədisin Ərəfatda deyilməsini isbat edən sənəd yalnız əl-Ənmati yolu ilə nəql edilib.

3. Ət-Tirmiziyə görə Allah Rəsulu (s) hədisi əvvəlcə Ərəfatda, daha sonra isə Qədir-Xumda deyib. Ancaq əl-Əlbaninin fikrincə, Peyğəmbərin (s) Ərəfatda bu cür xütbə deməsi sübut edilməyib, lakin Qədir-Xumda deyilməsi doğrudur.

Zeyd ibn əl-Həsən əl-Ənmatinin zəif ravi olduğunu iddia etmək üçün Əllamə əl-Əlbaninin əsas dəlili Əbu Hatimin (ö. 277 h.q.) sözləridir:

**"وزيد بن الحسن قد روى عنه سعيد بن سليمان وغير واحد من أهل العلم ".**

**قلت: قال أبو حاتم، منكر الحديث، وذكره ابن حبان في " الثقات ". وقال الحافظ: " ضعيف ".**

**(ət-Tirmizi dedi:) "Zeyd ibn əl-Həsənə gəldikdə, Səid ibn Süleyman və digər elm əhli də ondan rəvayət nəql etmişdir."**

**Mən (əl-Əlbani) deyirəm: Əbu Hatim deyib: "münkərul-hədisdir". İbn Hibban onu özünün "əs-Siqat" ("Güvənilən ravilər") əsərində qeyd edib. Əl-Hafiz deyib: "Zəifdir".**

Beləliklə, əl-Ənmati barədə aşağıdakı məlumatları öyrənmiş olduq:

1. İbn Hibban onu siqə (güvənilən) hesab etmiş və özünün "əs-Siqat" əsərinə daxil etmişdir.

2. İmam ət-Tirmizi onun hədislərini qəbul etmiş və müstəqil şəkildə həsən hesab etmişdir. Buradan aydın olur ki, o, əl-Ənmatini etibarlı və böyük ehtimalla "səduq" ravi hesab edir.

[12] Nasiruddin əl-Əlbani, Silsilətul-əhadisid-daifə, c.2, səh.185, №764





3. İmam Əbu Hatim onu "münkərul-hədis" adlandırır, yəni hədisləri tərk edilmiş, çox zəif hesab edir.

4. Əl-Hafiz İbn Həcər əl-Əsqəlani də onu zəif hesab edir.

Şübhəsiz ki, əl-Ənmatini etibarsız hesab edən yeganə qədim əhli-sünnə alimi Əbu Hatimdir. Görünür, nisbətən sonrakı əhli-sünnə alimi Hafiz əl-Əsqəlani həmin mənfi rəyi sadəcə təsdiq edib.

Belə olduqda, əl-Ənmatini əleyhinə ola tənqidin ilkin, təsdiqlənməmiş mənbəsi Əbu Hatimdir. Belə ki, o, əl-Ənmatinin yeganə qədim tənqidçisi olub. daha sonra əhli-sünnə alimi Hafiz əl-Əsqəlani həmin ravinin "zəif" olması barədə qeydini Əbu Hatimə istinadla götürüb.

Bütün bu qeydlər bir məsələni bizim üçün aydınlaşdırır: Əbu Hatim əl-Ənmatini tənqid edən ilk şəxsdir. Ondan başqa heç bir alim əl-Ənmatini cərh etməmişdir. Odur ki, əgər Əbu Hatimin tənqidi qüvvdən düşsə, əl-Ənmatiyə qarşı yönəlmiş digər tənqidlər də qüvvəsini itirəcək. Beləliklə, sual veririk: Əbu Hatimin ravilərə qarşı digərləri tərəfindən dəstəklənməyən fikirlərinin hökmü nədir? İmam əz-Zəhəbi yazır:

**إذا وثق أبو حاتم رجلا فتمسك بقوله، فإنه لا يوثق إلا رجلا صحيح الحديث، وإذا لين رجلا، أو قال فيه: لا يحتج به. فتوقف حتى ترى ما قال غيره فيه، فإن وثقه أحد، فلا تبن على تجريح أبي حاتم، فإنه متعنت في الرجال**

**Əbu Hatim bir şəxsi "siqə" adlandıranda, onun sözündən möhkəm yapış, çünki o, hədisləri səhih olmayan heç bir ravini "siqə" adlandırmayıb. Əgər bir ravini zəiflətsə və ya onun barəsində "höccət olaraq qəbul edilmir" desə, o zaman dayan və digərlərinin onun barəsində dediyinə bax. Əgər onu siqə hesab edən başqa bir nəfər də varsa, onda Əbu Hatimin tənqidini tərk elə, çünki o, ricalda mütəənnit (çox eyib axtaran) şəxs idi.**[13]

Hafiz İbn Həcər də bir ravi barədə danışarkən deyir:

**وفي الميزان أن أبا حاتم قال لا يحتج به فينتظر في ذلك وأبو حاتم عنده عنت وقد احتج به الجماعة**

**"əl-Mizan"da qeyd edilmişdir ki, Əbu Hatim deyib: "höccət olaraq qəbul edilmir". Ancaq diqqətli ol. Əbu Hatimdə eyib axtarmağa meyllilik var idi.O (sözügedən ravi), bir çoxları tərəfindən höccət hesab edilir.**[14]

Hər şey ortadadır:

[13] Şəmsuddin əz-Zəhəbi, Siyəru əlamin-nubəla, c.13, s.260, h.129
[14] İbn Həcər əl-Əsqəlani, Hadius-sari muqəddimətu Fəthul-bari, s.441





Əgər Əbu Hatim bir ravinin yeganə klassik tənqidçisidirsə, o zaman başqa bir klassik alimin həmin ravi barədə əks fikrinin olub-olmaması barədə araşdırma aparılmalıdır. Əgər Əbu Hatimin bu tənqidinə qarşı bircə dənə də əks fikir olsa, onun fikri tərk edilər. Beləliklə, əl-Ənmatinin yeganə klassik tənqidçisi Əbu Hatimdir və ona qarşı ət-Tirmizi və İbn Hibban əks fikir söyləyiblər.

Belə olduğu təqdirdə, Əbu Hatimin tənqidi heç bir əhəmiyyət kəsb etmir və əlbəttə ki, "siqə" yaxud "səduq" olmasından asılı olmayaraq əl-Ənmati etibarlı ravidir.

Nəticədə məlum oldu ki, əl-Ənmati yolu ilə gəlmiş sənəd səhihdir yaxud ən azı İmam ət-Tirmizinin də qeyd etdiyi kimi həsəndir. Bu da öz növbəsində isbat edir ki, Peyğəmbər (s) "Səqəleyn" hədisini digər məkanlarla yanaşı Ərəfatda da demişdir.





Qeyd etdiyimiz kimi, heç şübhəsiz Allah Rəsulu (s) son Vida Həcci zamanı Ərəfatda ikən camaata bu sözləri demişdir:

**يا أيها الناس إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا كتاب الله وعترتي أهل بيتي**

**"Ey insanlar! Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldığınız müddətdə əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və itrətim-Əhli-beytim."**

Bəs görəsən, Peyğəmbər (s) bu sözlərlə dünyaya hansı mesajı vermək istəyib? İmam əl-Mübarəkfuri (ö.1282 h.q) bu hədisin şərhində yazır:

**قال القاري والمراد بالأخذ بهم التمسك بمحبتهم ومحافظة حرمتهم والعمل بروايتهم والاعتماد على مقالتهم وهو لا ينافي أخذ السنة من غيرهم لقوله صلى الله عليه وسلم أصحابي كالنجوم بأيهم اقتديتم اهتديتم ولقوله تعالى فاسألوا أهل الذكر إن كنتم لا تعلمون**

**Əl-Qari deyib: Onlara sarılmaqda məqsəd onların məhəbbətindən yapışmaq, onlara hörmət etmək, onların hədislərinə əməl etmək, onların sözlərinə etimad etməkdir. Lakin bu o demək deyil ki, sünnə onlardan başqasından qəbul edilə bilməz. Buna səbəb Allah Rəsulunun (s) "Mənim səhabələrim ulduzlar kimidir. Hansının ardınca getsəniz, hidayətə çatarsınız" sözləri və Allah-taalanın "Əgər bilmirsinizsə, zikr əhlindən soruşun" buyuruğudur.**[15]

Göründüyü kimi, əl-Qari etiraf edir ki, Səqəleyn hədisi ümmətə Peyğəmbərdən (s) sonra onun Əhli-beytinin ardınca getməyi əmr edir, lakin Əhli-beytlə yanaşı səhabələrin də ardınca getməli olduğumuzu bildirir. Onun bu təqdimatında iki kobud səhv mövcuddur.

Birincisi, istinad etdiyi rəvayət etibarsızdır. Əllamə əl-Əlbani bu rəvayəti movdu (uydurma) adlandırıb.[16]

İkincisi, Səqəleyn hədisi bütün insanlığa xitab edir və təbii olaraq, səhabələri, tabeinləri, ətbaut-tabeinləri, 4 imamı (Əbu Hənifə, Şafei, Malik, Əhməd ibn Hənbəl), əl-Buxari, Müslim, İbn Teymiyyə, Muhəmməd ibn Əbdül-Vəhhab, İbn Baz, İbn əl-Üseymin və digərlərini də əhatə edir. Onların hamısı, heç bir istisna olmadan, hər bir şeydə Peyğəmbər (s) itrətinə tabe olmaqda ciddi ilahi öhdəliyə malikdirlər. Hədis ümumi şəkildə ifadə edilib və hökmündən heç bir şey istisna edilməyib.

[15] Əbul-Əla əl-Mübarəkfuri, Tuhfətul-əhvazi bi şərh Camiut-Tirmizi, c.10, s.196
[16] Nasiruddin əl-Əlbani, Silsilətul-əhadisud-daifə vəl-movdua, c.1, s.144, №58





Beləliklə, Peyğəmbər (s) dünyadan köçən andan Qiyamətədək bütün insanlar hər bir şeydə Əhli-beytə (ə) tabe olmalıdırlar. Deməli, insanlara səhabələrin ardıcılı olmaq göstərişi verilməyib, əksinə səhabələrə Əhli-beyt (ə) ardıcılı olmaq əmr edilib.

Bununla belə, kimsə yenə də səhabələrə tabeçilikdə inad etsə, İslamda itaətin yalnız mütləq şəkildə Allaha olduğunu desə, bu halda yalnız və yalnız Səqəleyn hədisindəki Allahın göstərişinə tam şəkildə əməl edən səhabələrə tabe olmaq mümkündür.

Bundan əlavə, əl-Mübarəkfurinin daha bir qeydi var:

**وقال ابن الملك التمسك بالكتاب العمل بما فيه وهو الائتمار بأوامر الله والانتهاء عن نواهيه ومعنى التمسك بالعترة محبتهم والاهتداء بهديهم وسيرتهم زاد السيد جمال الدين إذا لم يكن مخالفا للدين**

**İbn əl-Malik deyib: "Allahın kitabına sarılmaq onda yazılan hər bir şeyə əməl etməkdir. Bu isə Allahın əmrlərinə tabe olmaq və qadağalarından çəkinməkdir. İtrətə sarılmaq isə onları sevmək, onların rəhbərliyi və sirəsi (həyat yolu) vasitəsilə hidayət axtarmaqdır." Seyid Cəmaləddin əlavə edərək deyib: "Dinə zidd olmadığı təqdirdə".[17]**

İbn əl-Malik də razılaşır ki, Peyğəmbər itrətinə Səqəleyn hədisi çərçivəsində tabe olunmalıdır. Bu tabeçiliyin yolu və süni şərtlərin həlli barədə isə heç bir söz demir. Ancaq Seyid Cəmaləddin bir addım daha irəli gedərək bildirir ki, Əhli-beytin rəhbərliyi və sirəsinə yalnız dinə zidd olmadıqda tabe oluna bilər. Beləliklə, o inanır ki, Peyğəmbərin itrəti də azğınlığa düşə və İslama zidd gedə bilər. Seyyid Cəmaləddinin bu qəribə fikri rəvayətin açıq-aşkar mətninə zidd gedir:

**يا أيها الناس إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا كتاب الله وعترتي أهل بيتي**

**"Ey insanlar! Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və itrətim-Əhli-beytim."**

Nə qədər ki, Əhli-beyti (ə) hidayət rəhbəri müəyyən edib onlara tabe olursunuz, əsla yolunuzu azmayacaqsınız. Əsla! Bu, Allah və Rəsulundan (s) bizim üçün zəmanətdir. Bu da öz növbəsində o deməkdir ki, hədisdə qeyd edilən Peyğəmbərin itrəti, Əhli-beyti heç bir vaxt azmır və azdırmırlar. Onlar hər zaman - bütün fikirlərində, sözlərində, əməllərində və sükutlarında - Quranın və Peyğəmbər

[17] Əbul-Əla əl-Mübarəkfuri, Tuhfətul-əhvazi bi şərh Camiut-Tirmizi, c.10, s.196





sünnəsinin həqiqi mahiyyəti üzərindədirlər. Hər kim bütün işlərində onların ardınca getsə, heç vaxt yolunu azmaz.

Buna baxmayaraq, bəzi əhli-sünnə, xüsusən sələfi nümayəndələri iddia edirlər ki, bu hədis sadəcə Qurani-Kərimə tabe olmağı vurğulayır. Buna dəlil olaraq isə rəvayətdə keçən "به" ifadəsinin tək halda işlənməsini qeyd edirlər:

إني قد تركت فيكم ما إن أخذتم به

**Mən sizin üzərinizdə elə bir şey qoyub gedirəm ki, əgər ona sarılsanız...**

Onların iddialarına görə, əgər Peyğəmbər (s) həm Qurana, həm də öz itrətinə birlikdə tabe olmağı nəzərdə tutsaydı, o "əgər onlara sarılsanız" - deyərdi. Ancaq bu, çox cahilcə irəli sürülmüş bir iddiadır. Belə ki, buradakı "ona" (ه) özündən qabaq gələn "əgər" (ما) ədatına aiddir. Ərəb dilində, hətta milyard ədəd obyekt də olsa, bu iki ifadə birlikdə işlənə bilər. Məsələn, Allah-Taala buyurur:

إن الذين كفروا لو أن لهم ما في الأرض جميعا ومثله معه ليفتدوا به من عذاب يوم القيامة ما تقبل منهم ولهم عذاب أليم

**İnnəlləzinə kəfəru ləu ənnə ləhum ma fîl ardi cəmian və misləhu məahu li yəftədu bihi min əzabi yəvmil qiyaməti ma tuqubbilə minhum, və ləhum əzabun əlimun.**

**[Tərcüməsi:] Şübhəsiz ki, kafirlər olanlar, əgər yer üzündə olanların hamısına, üstəlik də bir o qədərinə sahib olsaydılar və onlar bunu qiyamət gününün əzabından qurtarmaq üçün fidyə versəydilər, yenə də onlardan (fidyə) qəbul olunmazdı. Onları şiddətli bir əzab gözləyir![18]**

Buradan görürük ki, "bu" ifadəsi Yer üzərindəki hər bir şeyə - bütün heyvanlara, ərazilərə, tikililərə və s. aiddir. Digər nümunəyə baxaq:

إن تجتنبوا كبائر ما تنهون عنه نكفر عنكم سيئاتكم وندخلكم مدخلا كريما

**İn təctənibu kəbaira ma tunhəvnə anhu nukəffir ankum səyiatikum və nudhılkum mudhalən kərimən.**

**[Tərcüməsi:] Əgər sizə qadağan olunmuş böyük günahlardan çəkinsəniz, Biz də sizin qəbahətlərinizin (kiçik günahlarınızın) üstünü örtər və sizi şərəfli bir mənzilə çatdırarıq.[19]**

Burada (ما) birbaşa böyük günahlara aid olub. Aydındır ki, həmin ifadəni "Səqəleyn" hədisində həm Quran, həm də Əhli-beyt üçün işlədilməsinə hər hansı bir maneə yoxdur. Bu insanlar necə düşünürlər görəsən?

[18] Maidə, 5:36
[19] Nisa, 4:31





Çox maraqlıdır ki, əhli-sünnə qardaşlarımızın sitat gətirməyi sevdikləri hədisdə də eyni ifadələr keçir: İmam əl-Beyhəqi (ö. 458 h.q) yazır:

**أخبرنا أبو عبد الله الحافظ أخبرني إسماعيل بن محمد بن الفضل الشعراني ثنا جدي ثنا بن أبي أويس ثنا أبي عن ثور بن زيد الديلي عن عكرمة عن بن عباس رضي الله عنهما أن رسول الله صلى الله عليه و سلم خطب الناس في حجة الوداع فقال يا أيها الناس أني قد تركت فيكم ما إن اعتصمتم به فلن تضلوا أبدا كتاب الله وسنة نبيه**

**Əbu Abdullah əl-Hafiz - İsmayıl ibn Muhəmməd ibn əl-Fəzl əş-Şərani - babası əl-Fəzl əş-Şərani - İbn Əbi Üveys - atası - Səvr ibn Zeyd əd-Dəyli - İkrimə - İbn Abbas sənədi ilə nəql edilir:**

**Allah Rəsulu (s) Vida Həccində insanlara xütbə oxudu və buyurdu: "Ey insanlar! Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və Peyğəmbərinin sünnəsi."[20]**

Şübhəsiz ki, buradan hər bir sünni müsəlman - sələfilər də daxil olmaqla - həm Qurana, həm də sünnəyə tabe olmağın lazım olduğunu anlayır. Bəs o zaman nə üçün Səqəleyn hədisinə qarşı ikili standartlarla yanaşılır?

Təəssüf edirik ki, əhli-sünnə standartlarına görə əl-Beyhəqinin rəvayəti zəif sənədə malikdir, çünki sənədində yaddaşı çox zəif olan İbn Əbi Uveys var. Əl-Hafiz deyir:

**إسماعيل بن عبد الله بن عبد الله بن أويس بن مالك بن أبي عامر الأصبحي أبو عبد الله بن أبي أويس المدني صدوق أخطأ في أحاديث من حفظه**

**İsmayıl ibn Abdullah ibn Abdullah ibn Üveys ibn Malik ibn Əbi Amir əl-Əsbəhi Əbu Abdullah ibn Əbi Üveys əl-Mədəni: səduqdur, (zəif) yaddaşı səbəbilə hədislərdə xəta edib.[21]**

Şübhəsiz ki, onun yaddaşında çox ciddi problemlər olub. Əl-Hafiz başqa yerdə yazır:

**إسماعيل بن أبي أويس عبد الله بن عبد الله بن أويس بن مالك بن أبي عامر الأصبحي ... قلت وروينا في مناقب البخاري بسند صحيح أن إسماعيل أخرج له أصوله وأذن له أن ينتقى منها ... ما أخرجه البخاري عنه هو من صحيح حديثه لأنه كتب من أصوله وعلى هذا لا يحتج بشئ من حديثه غير ما في الصحيح من أجل ما قدح فيه النسائي وغيره إلا أن شاركه فيه غيره فيعتبر فيه**

**İsmayıl ibn Əbi Üveys Abdullah ibn Abdullah ibn Üveys ibn Malik ibn Əbi Amir əl-Əsbahi... Deyirəm: "Mənaqibul-Buxari"də səhih sənədlə qeyd etdik ki, İsmayıl öz əlyazmasını ona (əl-Buxariyə) verdi və ona oradan seçim etməyə icazə verdi... Buxarinin ondan rəvayət etdiyi hər bir hədis səhihdir, çünki o (əl-Buxari) həmin hədisləri İbn Uveysin əlyazmasından köçürüb. Belə**

[20] Əbu Bəkr əl-Beyhəqi, Sünənül-kübra, c.10, səh.114, №20123
[21] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, səh.96, №461





**olduqda, İbn Üveysin "əs-Səhih"də olmayan heç bir hədisi - Nəsai və digərlərinin onun tənqid etməsi səbəbindən - höccət olaraq qəbul edilmir. Onun başqası tərəfindən (eyni məzmunlu hədislə) dəstəkləndiyi hallar isə istisnadır, belə ki, bu zaman dayaq istinad olaraq qəbul edilir.**[22]

Deməli, o, hədisdə çox sayda səhvlər edirdi. Belə olduğu təqdirdə, başqa bir ravi tərəfindən dəstəklənməyənə qədər onun şifahi olaraq nəql etdiyi rəvayətlər zəifdir. Maraqlıdır ki, əl-Beyhəqinin yuxarıda qeyd etdiyimiz rəvayəti atası Əbu Üveys tərəfindən dəstəklənmir. Bundan əlavə, əl-Buxarinin "Səhih"i istisna olmaqla, İsmayılın bütün rəvayətləri şifahi, yəni yaddaşından nəql edilib. Nəzərə alsaq ki, əl-Beyhəqinin rəvayəti də "Səhihül-Buxari"də yoxdur, deməli dəstəklənmir və heç şübhəsiz zəifdir.

Şeyx İbn Baz (ö.1420 h.) da rəvayəti olduğu kimi nəql edir:

**اني تارك فيكم ما لن تضلوا إن اعتصمتم به :كتاب الله و سنتي**

**"Ey insanlar! Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və Peyğəmbərinin sünnəsi."**[23]

Daha sonra, çox qəribə bir gediş edərək yazır:

**أخرجها الحاكم بسند جيد**

**Əl-Hakim bunu ceyyid (yaxşı) sənədlə rəvayət etmişdir.**[24]

Görəsən həqiqətən belədir? Gəlin İmam əl-Hakimin (ö. 403 h.q) özünün nəql etdiyi rəvayətin sənədinə baxaq:

**حدثنا أبو بكر أحمد بن إسحاق الفقيه أنبأ العباس بن الفضل الأسفاطي ثنا إسماعيل عن أبي أويس وأخبرني إسماعيل بن محمد بن الفضل الشعراني ، ثنا جدي ، ثنا ابن أبي أويس حدثني أبي عن ثور بن زيد الديلي عن عكرمة عن ابن عباس أن رسول الله صلى الله عليه وسلم خطب الناس في حجة الوداع فقال : قد يئس الشيطان بأن يعبد بأرضكم ولكنه رضي أن يطاع فيما سوى ذلك مما تحاقرون من أعمالكم فاحذروا يا أيها الناس إني قد تركت فيكم ما إن اعتصمتم به فلن تضلوا أبدا : كتاب الله وسنة نبيه صلى الله عليه وسلم**

**Əbu Bəkr Əhməd ibn İshaq əl-Fəqih - əl-Abbas ibn əl-Fədl əl-Əsfati - İsmayıl - Əbu Üveys; Həmçinin İsmayıl ibn Muhəmməd ibn əl-Fədl əş-Şərani - babası Fədl əş-Şərani - İsmayıl - Əbu Üveys-Səvr ibn Zeyd əd-Dəyli - İkrimə - İbn Abbas sənədləri ilə nəql edilir ki:**

**Allah Rəsulu (s) Vida Həccində insanlara xütbə oxuyaraq belə dedi: "Həqiqətən Şeytan sizin torpaqlarda ona ibadət edilməsindən ümidini itirmişdir, lakin sizin dəyərsiz hesab etdiyiniz bəzi**

[22] İbn Həcər əl-Əsqəlani, Hadius-sari müqəddimə Fəthul-bari, s.338
[23] Əbdül-Əziz ibn Baz, Məcmu Fətava, c.24, s.182
[24] Həmin mənbə.





**əməllərinizdə ona ibadət edilməsindən razı qalmışdır ki, siz onlardan da çəkinin. Ey insanlar, sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və Peyğəmbərinin (s) sünnəsi.[25]**

Sələfi alimi Şeyx Müqbil "əl-Müstədrək" kitabının təhqiqində bu hədis barədə yazır:

**حديث ضعيف لأنه من طريق إسماعيل بن أبي أويس عن أبيه وفيهما كلام .وشاهده من طريق صالح بن موسى الطالحي وهو متروك**

**Bu zəif hədisdir, çünki İsmayıl ibn Əbi Üveysin atasından nəql etdiyi yolla gəlmişdir və onların hər ikisi tənqid edilmişdir. Bu hədisin şahidi Salih ibn Musa ət-Talihi yolu ilə nəql edilmişdir, o isə mətrukdur (tərk edilmişdir).[26]**

Təəssüflər olsun ki, əhli-sünnə alimlərinin əksəriyyəti saxta hədisi həqiqi hədislə əvəz etməyə cəhd etmir, öz xütbələrində, kitab və məqalələrində tərəfdarlarına Peyğəmbərin (s) ümmətə tapşırdığı həqiqi əmanəti çatdırmırlar. Əvəzində, saxta bir rəvayəti Peyğəmbərin bizə son göstərişi kimi nəql etməyə davam edirlər. Bu vəziyyətdən ciddi şəkildə narahatçılıq keçirdən müasir əhli-sünnə hədisçilərindən biri Seyyid Həsən əs-Səqqafdır. O, öz narazılığını aşağıdakı sərt sözlərlə ifadə edir:

**وأما حديث [تركت فيكم ما إن تمسكتم بهما لن تضلوا بعدي أبدا كتاب وسنتي] الذي يردده الناس فيما بينهم ويقوله الخطباء على المنابر فحديث موضوع مكذوب وضعه الأمويون وأتباعهم ليصرفوا الناس عن هذا الحديث الصحيح في العترة، فانتبه لذلك جد !!وقد ذكرت جميع طرقه وبينت ما في أسانيده من الكذابين والوضاعين في آخر كتابي} صحيح صفة صلاة النبي صلى الله عليه وآله وسلم {ص (289)**

**İnsanların öz aralarında təkrar-təkrar rəvayət etdikləri, xətiblərin minbərlərdə nəql etdikləri hədisə (Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və Peyğəmbərinin sünnəsi) gəldikdə isə, bunun saxta və uydurma olduğunu deməliyik. Bu hədis Əməvilər və onların ardıcılları tərəfindən insanları "İtrət" barədəki səhih hədisdən uzaqlaşdırmaq üçün uydurulmuşdur. Ona görə də ehtiyatlı olun. Mən "Səhih sifət salatun-Nəbi" adlı kitabımın sonunda səhifə 289-da onun bütün sənədlərini qeyd etmiş, oradakı yalançı və saxtakar raviləri ifşa etmişəm.[27]**

Hər bir halda, bizim araşdırmamızda əsas məsələ zəif hədis barədə sünni anlayışını tədqim etməkdir. Onlara görə - hətta ərəb dilini bir az başa düşən hər bir

[25] Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-Səhiheyn, c.1, s.171, №318
[26] Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-Səhiheyn, c.1, s.161, №318
[27] Həsən əs-Səqqaf, Səhih şərhul-əqidətit-Təhaviyyə, s.654, haşiyə №385





şəxs üçün - o hədis düzgün yolda olmağın yeganə şərti olmaqla, bütün insanları istənilən hal və şəraitlərdə qeyd-şərtsiz Quran və sünnəyə birlikdə itaət etməyə göstəriş verir. Eynilə, saxta hədislə əksərən üst-üstə düşən ifadələrə malik əsil hədis də hər zaman, istənilən vəziyyətdə, hər cür şəraitdə açıq-aşkar bizə Quran və Peyğəmbərin (s) itrətinə, Əhli-beytinə birlikdə tabe olmağı əmr edir. Kim buna əməl etməsə, yolunu azmış olur.





Vida-Həccindən dərhal sonra paytaxt şəhəri olan Mədinəyə geri dönərkən Qədir-Xum adlanan yerdə Allah Rəsulu (s) Ərəfatda insanlara təlimatını təkrarladı. İmam Əbi Asim (ö. 287 h.q.) yazır:

**حدثنا سليمان بن عبيد الله الغيلاني، حدثنا أبو عامر، حدثنا كثير بن زيد، عن محمد بن عمر بن علي، عن أبيه، عن علي رضي الله عنه أن رسول الله صلى الله عليه وسلم قال :إني تركت فيكم ما إن أخذتم به لن تضلوا :كتاب الله، سببه بيد الله، وسببه بأيديكم، وأهل بيتي.**

**Süleyman ibn Übeydullah əl-Geylani - Əbu Amir - Kəsir ibn Zeyd - Muhəmməd ibn Ömər ibn Əli - atası Ömər ibn Əli - Əli (r.a.) sənədilə nəql edilir ki:**

**Allah Rəsulu (s) buyurdu: "Sizin üzərinizdə elə iki şey qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Bir ucu Allahın, digər ucu sizin əlinizdə olan Allahın kitabı və Əhli-beytim."[28]**

Birinci ravi barədə əl-Hafiz deyir:

**سليمان بن عبيد الله بن عمرو بن جابر الغيلاني المازني أبو أيوب البصري صدوق**

**Süleyman ibn Übeydullah ibn Əmr ibn Cabir əl-Geylani əl-Mazini, Əbu Əyyub əl-Bəsri: Səduqdur.[29]**

İkinci ravi barədə isə belə yazır:

**عبد الملك بن عمرو القيسي أبو عامر العقدي بفتح المهملة والقاف ثقة**

**Əbdül-Malik ibn Əmr əl-Qeysi, Əbu Amir əl-Əqədi: siqədir.[30]**

Əl-Hafiz İbn Həcərə görə üçüncü ravi də etibarlıdır:

**كثير بن زيد الأسلمي أبو محمد المدني بن مافنه بفتح الفاء وتشديد النون صدوق يخطئ**

**Kəsir ibn Zeyd əl-Əsləmi, Əbu Muhəmməd əl-Mədəni ibn Mafənna: Səduqdur, xətaları olub.[31]**

O, çox səhv etməyib. Buna görə də onun səhvləri ciddi olmayıb və hədislərinin keyfiyyətinə təsir etməyib.

Əl-Hafiz bizə dördüncü ravi barədə də məlumat verir:

**محمد بن عمر بن علي بن أبي طالب صدوق**

**Muhəmməd ibn Ömər ibn Əli ibn Əbi Talib: Səduqdur.[32]**

Nəhayət, beşinci ravi barədə yazır:

**عمر بن علي بن أبي طالب الهاشمي ثقة**

---

[28] Əbu Bəkr ibn Əbi Asim, Kitabus-sunnə, c.2, s.644-645, №1558
[29] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.389, №2598
[30] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.617, №4213
[31] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.38, №5628
[32] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.117, №6190





**Ömər ibn Əli ibn Əbi Talib əl-Haşimi: Siqədir.**[33]

Beləliklə, bütün ravilər güvənilləndir və aralarında heç bir qopuqluq yoxdur. Hədisin etibarlılıq dərəcəsi ən azı həsəndir. Şeyx əl-Ərnaut da bu barədə belə deyir:

**وثالث من حديث علي عند ابن أبي عاصم في "السنة" (1558) ، والطحاوي في "شرح مشكل الآثار" (1760) من طريقين عن أبي عامر العقدي، عن كثير بن زيد، عن محمد بن عمر بن علي، عن أبيه، عنه، مرفوعاً، بلفظ: "إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا: كتاب الله، سببه بيد الله، وسببه بأيديكم، وأهل بيتي"، وإسناده حسن.**

**Üçüncüsü Əlinin, İbn Əbi Asimin "əs-Sünnə" (1558) və ət-Təhavinin "Şərh Müşkilil-asar" (1760) əsərində iki yolla Əbu Amir əl-Əqədinin Kəsir ibn Zeyddən, onun da Muhəmməd ibn Ömər ibn Əlidən, onun da atasından, onun da ondan (Əlidən), onun da Peyğəmbərdən (s) nəql etdiyi "Sizin üzərinizdə elə bir şey qoyuram ki, ona sarıldıqca əsla azğınlığa düşməzsiniz: Bir ucu Allahın, digər ucu sizin əlinizdə olan Allahın kitabı və Əhli-beytim." hədisidir. Sənədi həsəndir.**[34]

Yuxarıdakı hədis daha geniş bir hədisin sadəcə qısaldılmış versiyasıdır. İmam İshaq ibn Rəhaveyh (ö. 238 h.q.) və digər bəzi klassik əhli-sünnə alimləri tam versiyasını nəql ediblər. Məsələn, İmam ət-Təhavi (ö. 321 h.q.) yazır:

**حدثنا إبراهيم بن مرزوق قال : حدثنا أبو عامر العقدي قال : حدثنا كثير بن زيد، عن محمد بن عمر بن علي ، عن أبيه ، عن علي ، أن النبي صلى الله عليه وسلم حضر الشجرة بخم فخرج آخذا بيد علي فقال :يا أيها الناس، ألستم تشهدون أن الله عز وجل ربكم؟ قالوا: بلى، قال: ألستم تشهدون أن الله ورسوله أولى بكم من أنفسكم، وأن الله عز وجل ورسوله مولياكم؟ قالوا: بلى، قال: فمن كنت مولاه فإن هذا مولاه، أو قال: فإن عليا مولاه ـ شك ابن مرزوق ـ إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا :كتاب الله سببه بأيديكم، وأهل بيتي.**

**İbrahim ibn Mərzuq - Əbu Amir əl-Əqədi - Kəsir ibn Zeyd - Muhəmməd ibn Ömər ibn Əli - atası Ömər ibn Əli - Əli sənədi ilə rəvayət edilir ki:**

**Həqiqətən, Peyğəmbər (s) (Qədir) Xumda ağacın altında dayandı. Daha sonra çıxıb Əlinin əlindən tutaraq buyurdu: "Ey insanlar! Şəhadət verirsiniz ki, Allah - əzzə və cəll - sizin rəbbinizdir? Dedilər: "Bəli". O dedi: Şəhadət verirsiniz ki, Allah və Rəsulu (s) sizə özünüzdən daha övladır (işlərinizdə ixtiyar sahibidir) və Allah və Rəsulu sizin mövlanızdır? Dedilər: "Bəli". O dedi: "Onda Mən kimin mövlasıyamsa, bu da - yaxud Əli də - onun mövlasıdır. Mən sizin üzərinizdə elə şey qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Bir ucu sizin əlinizdə olan Allahın kitabını və Əhli-beytimi.**[35]

Şeyx əl-Ərnaut deyir:

**إسناده حسن**

[33] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.724, №4967
[34] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.17, s.172, №11104
[35] Əbu Cəfər Əhməd ibn Muhəmməd ət-Təhavi, Şərhu Muşkilul-asar, c.5, s.13, №1760





**Sənədi həsəndir.**[36]

Əl-Hafiz İbn Həcər əl-Əsqəlani də İshaq ibn Rəhaveyhin bu rəvayətini olduğu kimi nəql edir:

**وقال إسحاق: أنا أبو عامر العقدي، عن كثير بن زيد، عن محمد بن عمر بن علي، عن أبيه، عن علي، قال: إن النبي صلى الله عليه وسلم حضر الشجرة بخم، ثم خرج آخذا بيد علي قال :ألستم تشهدون أن الله ربكم؟ قالوا: بلى، قال: ألستم تشهدون أن الله ورسوله أولى بكم من أنفسكم، وأن الله ورسوله أولياؤكم؟ فقالوا: بلى، قال: فمن كان الله ورسوله مولاه، فإن هذا مولاه، وقد تركت فيكم ما إن أخذتم به لن تضلوا: كتاب الله سببه بيده، وسببه بأيديكم، وأهل بيتي**

**İshaq - Əbu Amir əl-Əqədi - Kəsir ibn Zeyd - Muhəmməd ibn Ömər ibn Əli - atası Ömər ibn Əli - Əli sənədi ilə rəvayət edilir ki:**

**Həqiqətən, Peyğəmbər (s) (Qədir) Xumda ağacın altında dayandı. Daha sonra çıxıb Əlinin əlindən tutaraq buyurdu: "Ey insanlar! Şəhadət verirsiniz ki, Allah - əzzə və cəll - sizin rəbbinizdir? Dedilər: "Bəli". O dedi: Şəhadət verirsiniz ki, Allah və Rəsulu (s) sizə özünüzdən daha övladır və Allah və Rəsulu sizin övliyanızdır? Dedilər: "Bəli". O dedi: "Onda Allah və Rəsulu kimin mövlasıdırsa, bu da (yəni, Əli də) onun mövlasıdır. Mən sizin üzərinizdə elə şey qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Bir ucu Onun əlində, digər ucu isə sizin əlinizdə olan Allahın kitabı və Əhli-beytim.**[37]

Daha sonra İbn Həcər yazır::

**هذا إسناد صحيح**

**Bu sənəd səhihdir.**[38]

İmam Əhməd əl-Busiri (ö. 840 h.q.) həmçinin yazır:

**عن علي بن أبي طالب، رضي الله عنه: أن النبي صَلَّى الله عَلَيه وسَلَّم حضر الشجرة بخم ثم خرج آخذًا بيد علي فقال: ألستم تشهدون أن الله ربكم؟ قالوا: بلى قال: ألستم تشهدون أن الله ورسوله أولى بكم من أنفسكم وأن الله ورسوله مولاكم؟ قالوا: بلى قال: فمن كان الله ورسوله مولاه فإن هذا مولاه وقد تركت فيكم ما إن أخذتم به لن تضلوا كتاب الله سببه بيده وسببه بأيديكم وأهل بيتي.**

**Əli ibn Əbi Talibdən (r.a) nəql edilir ki, Peyğəmbər (s) (Qədir) Xumda ağacın altında dayandı. Daha sonra çıxıb Əlinin əlindən tutaraq buyurdu: "Ey insanlar! Şəhadət verirsiniz ki, Allah - əzzə və cəll - sizin rəbbinizdir? Dedilər: "Bəli". O dedi: Şəhadət verirsiniz ki, Allah və Rəsulu (s) sizə özünüzdən daha övladır və Allah və Rəsulu sizin mövlanızdır? Dedilər: "Bəli". O dedi: "Onda Allah və Rəsulu kimin mövlasıdırsa, bu da (yəni, Əli də) onun mövlasıdır. Mən sizin**

---

[36] Həmin mənbə
[37] İbn Həcər əl-Əsqəlani, əl-Mətalibul-aliyyə, c.4, s.65, №3972
[38] Həmin mənbə





**üzərinizdə elə şey qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Bir ucu Onun əlində, digər ucu isə sizin əlinizdə olan Allahın kitabı və Əhli-beytim.**[39]

Sonda isə əl-Busiri qısa bir qeyd yazır:

**رواه إسحاق بسند صحيح**

**Bunu İshaq səhih sənədlə rəvayət etmişdir.**[40]

Əllamə əl-Müttəqi əl-Hindi (ö. 975 h.q.) də həmçinin, bu hədisi öz kitabında qeyd etmişdir:

**عن علي أن النبي صلى الله عليه و سلم حضر الشجرة بخم ثم خرج آخذا بيد علي فقال : أيها الناس ألستم تشهدون أن الله ربكم ؟ قالوا : بلى قال : ألستم تشهدون أن الله ورسوله أولى بكم من أنفسكم وأن الله ورسوله مولاكم ؟ قالوا : بلى قال : فمن كان الله ورسوله مولاه فإن هذا مولاه وقد تركت فيكم ما إن أخذتم به لن تضلوا بعده : كتاب الله سببه بيده وسببه بأيديكم وأهل بيتي**

**Əli ibn Əbi Talibdən (r.a) nəql edilir ki, Peyğəmbər (s) (Qədir) Xumda ağacın altında dayandı. Daha sonra çıxıb Əlinin əlindən tutaraq buyurdu: "Ey insanlar! Şəhadət verirsiniz ki, Allah - əzzə və cəll - sizin rəbbinizdir? Dedilər: "Bəli". O dedi: Şəhadət verirsiniz ki, Allah və Rəsulu (s) sizə özünüzdən daha övladır və Allah və Rəsulu sizin mövlanızdır? Dedilər: "Bəli". O dedi: "Onda Allah və Rəsulu kimin mövlasıdırsa, bu da (yəni, Əli də) onun mövlasıdır. Mən sizin üzərinizdə elə şey qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Bir ucu Onun əlində, digər ucu isə sizin əlinizdə olan Allahın kitabı və Əhli-beytim.**

Daha sonra yazır:

**ابن راهويه وابن جرير وابن أبي عاصم والمحاملي في أماليه وصححه**

**İbn Rəhaveyh, İbn Cərir, İbn Əbi Asim və əl-Muhamili "Əmali" əsərində rəvayət etmiş və o (əl-Muhamili) hədisi səhih hesab etmişdir.**[41]

Bu hədislərdə Peyğəmbərin (s) çatdırmaq istədiyi mesaj açıq-aşkar ifadə edilmişdir. Müsəlmanlar Peyğəmbərdən sonra yalnız Quran və Əhli-beytə birlikdə sarıldıqları halda haqq yolda ola bilərlər. Əks təqdirdə, avtomatik olaraq bu şansdan məhrum olacaqlar.

---

[39] Əhməd ibn Əbi Bəkr əl-Busiri, İthaful-xirat, c.7, s.210, №6683
[40] Həmin mənbə
[41] Əl-Müttəqi əl-Hindi, Kənzül-ümmal, c.13, s.121, №36441





İmam Müslimin (ö. 261 h) "Səhih" əsərində belə nəql olunur:

**حدثني زهير بن حرب وشجاع بن مخلد جميعا عن ابن علية قال زهير حدثنا إسماعيل بن إبراهيم حدثني أبو حيان حدثني يزيد بن حيان قال انطلقت أنا وحصين بن سبرة وعمر بن مسلم إلى زيد بن أرقم فلما جلسنا إليه قال له حصين لقد لقيت يا زيد خيرا كثيرا رأيت رسول الله صلى الله عليه و سلم وسمعت حديثه وغزوت معه وصليت خلفه لقد لقيت يا زيد خيرا كثيرا حدثنا يا زيد ما سمعت من رسول الله صلى الله عليه و سلم قال يا ابن أخي والله لقد كبرت سني وقدم عهدي ونسيت بعض الذي كنت أعي من رسول الله صلى الله عليه و سلم فما حدثتكم فاقبلوا وما لا فلا تكلفونيه ثم قال قام رسول الله صلى الله عليه و سلم يوما فينا خطيبا بماء يدعى خما بين مكة والمدينة فحمد الله وأثنى عليه ووعظ وذكر ثم قال أما بعد ألا أيها الناس فإنما أنا بشر يوشك أن يأتي رسول ربي فأجيب وأنا تارك فيكم ثقلين أولهما كتاب الله فيه الهدى والنور فخذوا بكتاب الله واستمسكوا به فحث على كتاب الله ورغب فيه ثم قال وأهل بيتي أذكركم الله في أهل بيتي أذكركم الله في أهل بيتي أذكركم الله في أهل بيتي فقال له حصين ومن أهل بيته؟ يا زيد أليس نساؤه من أهل بيته ؟ قال نساؤه من أهل بيته ولكن أهل بيته من حرم الصدقة بعده قال وهم؟ قال هم آل علي وآل عقيل وآل جعفر وآل عباس قال كل هؤلاء حرم الصدقة؟ قال نعم**

**Züheyr ibn Hərb və Şücaə ibn Məxləd - İbn Uləyyə; Züheyr - İsmayıl ibn İbrahim - Əbu Həyyan - Yezid ibn Həyyan yolu ilə rəvayət edilir ki,**

**“Mən, Həsin ibn Səbrə və Ömər ibn Müslimlə birlikdə Zeyd ibn Ərqəmin yanına getdik. Onunla birlikdə əyləşdikdə Həsin ona dedi: “Ey Zeyd, sən bir çox xeyirlərə şahid olmusan, Peyğəmbəri görmüsən, hədislərini eşitmisən, onunla birgə müharibələrdə iştirak etmisən, arxasında namaz qılmısan. Həqiqətən də bir çox xeyirlərə şahid olmusan. Ey Zeyd, Peyğəmbərdən (s) eşitdiklərindən bizə də danış”.**

**Zeyd dedi: “Ey qardaşımın oğlu! Allaha and olsun, qocalmışam, yaşım ötüb, Peyğəmbərdən eşidib yadda saxladıqlarımın bəzisini unutmuşam. Sizə söyləyəcəyimi qəbul edin, danışmayacaqlarımı isə tələb etməyin. Bir gün Peyğəmbər (s) Məkkə ilə Mədinə arasında (Qədir) Xum deyilən bir quyunun yanında bizim üçün xütbə söylədi. Allaha həmd və səna söylədikdən sonra moizəyə başladı, ardınca buyurdu: “Ey camaat, mən də bir bəşərəm, Rəbbimin elçisinin (ölüm mələyinin) gələcəyi və mənim də ona müsbət cavab verəcəyim gün ola yaxındır. Sizin aranızda iki ağır əmanət qoyuram: Onlardan birincisi Allahın kitabıdır ki, onda hidayət və nur vardır. Allahın kitabını götürün və ondan bərk-bərk yapışın”. Sonra bəzi sözlərlə insanları Allahın kitabına rəğbətləndirdi. Sonra buyurdu: “Və Əhli-Beytim. Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram!”**

**Həsin dedi: “Ey Zeyd, onun Əhli-Beyti kimlərdir? Qadınları onun Əhli-Beyti deyilmi?” Zeyd dedi: “Bəli, qadınları evinin əhlindəndir. Lakin onun Əhli-Beyti özündən sonra sədəqənin[42] haram buyurulduğu şəxslərdir”. Həsin onların kim olduğunu soruşduqda Zeyd dedi: “Bunlar Əlinin**

[42] Burada sədəqədən məqsəd şəriətdə vacib olan zəkatdır (red.)





**ailəsi, Əqilin, Cəfərin və Abbasın ailələridir". Həsin dedi: "Bütün bu şəxslərə sədəqə haramdır?" Zeyd "Bəli" - deyə cavab verdi".[43]**

İmam Əhməd həmin rəvayəti[44] nəql etmiş və Şeyx əl-Ərnaut bu barədə demişdir:

**إسناده صحيح على شرط مسلم**

**Sənədi Müslimin şərtlərinə əsasən səhihdir.[45]**

Beləliklə, hədisin etibarlılığında heç bir şübhə yoxdur.

Bununla belə, bu hədisin başa düşülməsində bir neçə məsələ diqqətə alınmalıdır. Belə ki, digər hədislərdən fərqli olaraq burada Yezid ibn Həyyan tərəfindən bəzi əlavələr var.

**أما بعد ألا أيها الناس فإنما أنا بشر يوشك أن يأتي رسول ربي فأجيب وأنا تارك فيكم ثقلين أولهما كتاب الله فيه الهدى والنور فخذوا بكتاب الله واستمسكوا به فحث على كتاب الله ورغب فيه ثم قال وأهل بيتي أذكركم الله في أهل بيتي أذكركم الله في أهل بيتي أذكركم الله في أهل بيتي**

**"Ey camaat, mən də bir başərəm, Rəbbimin elçisinin (ölüm mələyinin) gələcəyi və mənim də ona müsbət cavab verəcəyim gün yaxındır. Sizin aranızda iki ağır əmanət qoyuram: Onlardan birincisi Allahın kitabıdır ki, onda hidayət və nur vardır. Allahın kitabını götürün və ondan bərk-bərk yapışın". Sonra bəzi sözlərlə insanları Allahın kitabına rəğbətləndirdi. Sonra buyurdu: "Və Əhli-Beytim. Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram!"**

Hədisdə Peyğəmbərdən (s) olmayan sözlər var. Bunlar hədis barədə əlavə izahlardır. Ona görə həmin artıq hissələri çıxarıb, yalnız Peyğəmbərin (s) sözlərinə diqqət yetirək ki, həqiqi sünnəyə çata bilək:

**أما بعد ألا أيها الناس فإنما أنا بشر يوشك أن يأتي رسول ربي فأجيب وأنا تارك فيكم ثقلين أولهما كتاب الله فيه الهدى والنور فخذوا بكتاب الله واستمسكوا به وأهل بيتي أذكركم الله في أهل بيتي أذكركم الله في أهل بيتي أذكركم الله في أهل بيتي**

**"Ey camaat, mən də bir başərəm, Rəbbimin elçisinin (ölüm mələyinin) gələcəyi və mənim də ona müsbət cavab verəcəyim gün yaxındır. Sizin aranızda iki ağır əmanət qoyuram: Onlardan birincisi Allahın kitabıdır ki, onda hidayət və nur vardır. Allahın kitabını götürün və ondan bərk-bərk yapışın və Əhli-Beytim. Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram!"**

[43] Müslim ibn əl-Həccac, əs-Səhih, s.4, s.1873, №2408 (36)
[44] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.4, s.366, №19285
[45] Həmin mənbə





Bu məsələni sünni təfsir alimi Molla Huveyş əl-Qazi Əbdül-Qədir də təsdiq edir:

**وروى مسلم عن زيد بن أرقم أن رسول الله صلّى الله عليه وسلم قال إني تارك فيكم ثقلين أولها كتاب الله فيه الهدى والنور فخذوا بكتاب الله واستمسكوا به وأهل بيتي، أذكركم الله في أهل بيتي، أذكركم في أهل بيتي**

**Müslim, Zeyd ibn Ərqəmdən rəvayət edir ki, Allahın Rəsulu (s) buyurdu: "Sizin aranızda iki ağır əmanət qoyuram: Onlardan birincisi Allahın kitabıdır ki, onda hidayət və nur vardır. Allahın kitabını götürün və ondan bərk-bərk yapışın və Əhli-Beytim. Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram!"[46]**

Burada verilmiş mesaj səhvsiz olaraq çatdırılıb. Səhabələr, tabeinlər və ətbaut-tabeinlər də daxil olmaqla bütün insanlara Quran və Əhli-beytin hər ikisinə sarılmaq əmr edilmişdir.

Bunu möhkəmləndirən İmam Əbdül-Həmid bin Humeydin (ö. 249 h.) kitabında Zeyddən nəql edilmiş eyni hədisdir. Bu hədis əlavə izahlar olmadan nəql edilib, yəni əsildir. Əllamə əl-Əlbani yazır ki, Peyğəmbər (s) Qədir-Xumda dedi:

**"أما بعد ألا أيها الناس! فإنما أنا بشر يوشك أن يأتيني رسول ربي فأجيب وأنا تارك فيكم ثقلين أولهما كتاب الله فيه الهدى والنور من استمسك به وأخذ به كان على الهدى ومن أخطأه ضل فخذوا بكتاب الله تعالى واستمسكوا به وأهل بيتي أذكركم الله في أهل بيتي أذكركم الله في أهل بيتي".**

**“Amma sonra... Ey camaat, mən də bir bəşərəm, Rəbbimin elçisinin (ölüm mələyinin) gələcəyi və mənim də ona müsbət cavab verəcəyim gün yaxındır. Sizin aranızda iki ağır əmanət qoyuram: Onlardan birincisi Allahın kitabıdır ki, onda hidayət və nur vardır. Hər kim ona sarılsa və bərk-bərk yapışsa doğru yolda olar və hər kim əhəmiyyətsiz hesab etsə, yolunu azar. Ona görə də Allahın kitabını götürün və ondan bərk-bərk yapışın. Biri də Əhli-Beytimdir. Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram!”[47]**

Əllamə hədis barədə deyir:

**(صحيح) ... [حم عبد بن حميد م] عن زيد بن أرقم.**

**(Səhihdir) ... [Əbd bin Hümeyd yazıb (M - yəni Səhih Müslim) Zeyd ibn Ərqəmdən nəqlən.[48]**

Həmin rəvayəti Əllamə əl-Hindi də yazıb:

[46] Molla Huveyş əl-Qazi Əbdül-Qədir, Bəyanul-məani, c.4, s.37
[47] Nasiruddin əl-Əlbani, Səhihul-camius-səğir, c.1, s.286-287, №1351
[48] Həmin mənbə





**أما بعد أيها الناس فإنما أنا بشر يوشك أن يأتي رسول ربي فأجيب وأنا تارك فيكم ثقلين أولهما كتاب الله فيه الهدى والنور من استمسك به وأخذ به كان على الهدى ومن أخطأه ضل فخذوا بكتاب الله تعالى واستمسكوا به وأهل بيتي أذكركم الله في أهل بيتي**

**“Bundan sonra... Ey camaat, mən də bir başərəm, Rəbbimin elçisinin (ölüm mələyinin) gələcəyi və mənim də ona müsbət cavab verəcəyim gün yaxındır. Sizin aranızda iki ağır əmanət qoyuram: Onlardan birincisi Allahın kitabıdır ki, onda hidayət və nur vardır. Hər kim ona sarılsa və bərk-bərk yapışsa doğru yolda olar və hər kim əhəmiyyətsiz hesab etsə, yolunu azar. Ona görə də Allahın kitabını götürün və ondan bərk-bərk yapışın. Biri də Əhli-Beytimdir. Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram, Əhli-Beytim barəsində sizə Allahı xatırladıram!”[49]**

Mənbəsini aşağıdakı kimi qeyd edir:

**حم وعبد بن حميد م عن زيد بن أرقم**

**Əbd bin Hümeyd yazıb (M - yəni Səhih Müslim) Zeyd ibn Ərqəmdən nəqlən.[50]**

Bu, Yezid ibn Həyyanın əlavələri olmadan Zeydin rəvayət etdiyi Peyğəmbər (s) hədisidir. Bu hadisə Ərəfatdakı xütbədən sonra Qədir-Xumda baş vermişdir. Mesaj müfəssəl, açıq-aydın və qətidir. Heç bir hiyləyə yaxud təhrifə yer qalmır. Biz hamımız ondan sonra Allahın kitabına və Peyğəmbərin Əhli-beytinə tabe olmalıyıq. Təəccüblüdür ki, Zeyd burada "Əhli-beyt" sözünə Peyğəmbərin xanımlarının, Əlinin, Əqilin, Cəfərin və Abbasın ailələrinin də daxil olduğunu deyir. Lakin həmin Zeyd, növbəti fəsildə göstərəcəyimiz kimi, Səqəleyn hədisində nəzərdə tutulan "Əhli-beyt"in məhz Peyğəmbərin itrəti olduğunu deyir.

[49] Əl-Müttəqi əl-Hindi, Kənzül-ümmal, c.1, s.315, №898
[50] Həmin mənbə





Peyğəmbər (s) çatdırmaq istədiyi mesajın camaat tərəfindən qavranılmasını mütləq şəkildə sığortalamaq üçün Səqəleyn hədisini müxtəlif sözlərlə təkrarlamışdır. Ərəfatda belə buyurub:

**يا أيها الناس إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا كتاب الله وعترتي أهل بيتي**

**"Ey insanlar! Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldığınız müddətdə əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və itrətim, Əhli-beytim."**

Bir müddət sonra Qədir-Xumda yenidən buyurmuşdur:

**أنا تارك فيكم ثقلين أولهما كتاب الله فيه الهدى والنور من استمسك به وأخذ به كان على الهدى ومن أخطأه ضل فخذوا بكتاب الله تعالى واستمسكوا به وأهل بيتي**

**Sizin üzərinizdə iki ağır əmanət qoyuram: Onlardan birincisi Allahın kitabıdır ki, onda hidayət və nur vardır. Hər kim ona sarılsa və bərk-bərk yapışsa doğru yolda olar və hər kim əhəmiyyətsiz hesab etsə, yolunu azar. Ona görə də Allahın kitabını götürün və ondan bərk-bərk yapışın. Biri də Əhli-Beytimdir.**

Daha sonra, elə həmin Qədir-Xumda bəzi başqa bəyənatlar da verildi ki, bu da mesajın ünvana çatdırılması üçün daha böyük güc sərfi niyyətindən xəbər verirdi. Əl-Hafiz İbn Kəsir (ö. 774 h.q.) bu məsələni öz təfsir kitabında təsdiq edir:

**و في الصحيح: أن رسول الله صلى الله عليه وسلم قال في خطبته بغَدِير خُمّ: "إني تارك فيكم الثقلين: كتاب الله وعترتي، وإنهما لم يفترقا حتى يردا علي الحوض"**

**Səhih bir rəvayətdə Allah Rəsulunun (s) Qədir-Xumdakı xütbəsində belə dediyi nəql olunur: Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və İtrətimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar.**[51]

Bununla belə, İmam əl-Hakim də bu rəvayəti eynilə qeyd etmişdir və bu, hədisin əsas ravisini təyin edir:

**حدثنا أبو بكر محمد بن الحسين بن مصلح الفقيه بالري ثنا محمد بن أيوب ثنا يحيى بن المغيرة السعدي ثنا جرير بن عبد الحميد عن الحسن بن عبد الله النخعي عن مسلم بن صبيح عن زيد بن أرقم رضي الله عنه قال قال رسول الله صلى الله عليه وسلم إني تارك فيكم الثقلين كتاب الله وأهل بيتي وإنهما لن يتفرقا حتى يردا علي الحوض**

**Əbu Bəkr Muhəmməd ibn Hüseyn ibn Müslih əl-Fəqih - Muhəmməd ibn Əyyub - Yəhya ibn əl-Muğirə əs-Sədi - Cərir ibn Əbdül-Həmid - əl-Həsən ibn Abdullah ən-Nəxai - Müslim ibn Subeyh - Zeyd ibn Ərqəm (r.a.) sənədi ilə nəql edilir ki:**

[51] İbn Kəsir əd-Diməşqi, Təfsirul-Quranil-Əzim, c.7, s.201





**Allah Rəsulu buyurmuşdur: "Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[52]**

Əl-Hakim yazır:

**هذا حديث صحيح الإسناد على شرط الشيخين**

**Bu hədisin sənədi iki şeyxin (Buxari və Müslimin) şərtlərinə əsasən səhihdir.[53]**

İmam əz-Zəhəbi yazır:

**على شرط البخاري ومسلم**

**Əl-Buxari və Müslimin şərtlərinə əsasəndir.[54]**

İmam ət-Təbəraninin (ö. 360 h.q.) də hədis üçün əlavə sənədi var:

**حدثنا علي بن عبد العزيز ثنا عمرو بن عون الواسطي ثنا خالد بن عبد الله عن الحسن بن عبيد الله عن أبي الضحى عن زيد بن أرقم قال قال رسول الله صلى الله عليه و سلم : إني تارك فيكم الثقلين كتاب الله وعترتي أهل بيتي وإنـهما لن يتفرقا حتى يردا علي الحوض**

**Əli ibn Əbdül-Əziz - Əmr ibn Aun əl-Vasiti - Xalid ibn Abdullah - əl-Həsən ibn Übeydullah - Əbul-Düha - Zeyd ibn Ərqəm sənədi ilə rəvayət olunur ki,**

**Allah Rəsulu buyurmuşdur: "Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[55]**

Şeyx əl-Ərnaut hədis barədə yazır:

**وهو صحيح**

**Bu səhihdir.[56]**

Adətən belə hədislərə istəksiz yanaşan "şeyximizin" bu hədisi tamamilə səhih hesab etməsi çox şey deməkdir. Ancaq biz yenə də ravilərin tərcümeyi-hallarını araşdırmağı lazım bilirik ki, heç bir şəkk-şübhə yeri qalmasın.

Birinci ravi barəsində əz-Zəhəbi yazır:

**علي بن عبد العزيز ابن المرزبان ابن سابور: الامام، الحافظ، الصدوق، أبو الحسن البغوي**

**Əli ibn Əbdül-Əziz ibn Mərzəban ibn Sabur: imamdır, hafizdir, səduqdur. Əbul-Həsən əl-Bəğəvi (kimi də tanınır).[57]**

---

52 Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn, c.3, s.160, №4711
53 Həmin mənbə
54 Həmin mənbə
55 Süleyman ibn Əhməd at-Təbərani, Mucəmul-kəbir, c.5, s.169, №4980
56 Muhəmməd ibn İbrahim əl-Vəzir əl-Yəmani, əl-Əvasim vəl-qəvasim, c.1, s.178, haşiyə №1
57 Şəmsuddin əz-Zəhəbi, Siyəru əlamin-nubəla, c.13, s.348, №164





Digər bir kitabında yazır:

**علي بن عبد العزيز البغوي الحافظ المجاور بمكة. ثقة، لكنه يطلب على التحديث، ويعتذر بأنه محتاج. قال الدارقطني: ثقة مأمون.**

**Əli ibn Əbdül-Əziz əl-Bəğəvi: hafizdir, Məkkə yaxınlığında (yaşayıb). Siqədir, lakin hədis demək üçün (pul) tələb edərdi. Ehtiyaclı olduğu üçün üzrlü hesab edilir. Əd-Darəqutni deyib: "o siqədir, məmundur (hədis nəql etmədə əmanətdardır)."[58]**

İkinci ravi barədə Əl-Hafiz belə deyir:

**عمرو بن عون بن أوس الواسطي أبو عثمان البزاز البصري ثقة ثبت**

**Əmr ibn Aun ibn Əvs əl-Vasiti, Əbu Osman əl-Bəzzaz əl-Bəsri: siqədir, səbtdir (hədis nəql etmədə möhkəmdir).[59]**

Üçüncü raviyə gəldikdə, əl-Hafiz yazır:

**خالد بن عبد الله بن عبد الرحمن بن يزيد الطحان الواسطي المزني مولاهم ثقة ثبت**

**Xalid ibn Abdullah ibn Əbdür-Rəhman ibn Yəzid əl-Təhhan əl-Vasiti əl-Muzənni: Onların (əl-Vasiti ailəsinin) azad etdiyi kölə olub. Siqədir, səbtdir.[60]**

Dördüncü ravinin də etibarlılıq dərəcəsi çox yüksəkdir:

**الحسن بن عبيد الله بن عروة النخعي أبو عروة الكوفي ثقة فاضل**

**Əl-Həsən ibn Ubeydullah ibn Ürvə ən-Nəxai, Əbu Urvə əl-Kufi: Siqədir, fəzilətli şəxsdir.[61]**

Nəhayət, sonuncu ravi barədə əl-Hafiz İbn Həcərin sözlərini oxuyuruq:

**مسلم بن صبيح بالتصغير الهمداني أبو الضحى الكوفي العطار مشهور بكنيته ثقة فاضل**

**Müslim ibn Subəyh əl-Həmədani, Əbud-Duha əl-Kufi Əl-Əttar. Künyəsi (Əbud-Duha) ilə məşhurdur. Siqədir. fəzilətli şəxsdir.[62]**

İmam Müslim (ö. 261 h.q.) də onun barəsində yazır:

**أبو الضحى مسلم بن صبيح سمع ابن عباس والنعمان بن بشير وزيد بن أرقم روى عنه الأعمش وحبيب بن أبي ثابت**

**Əbud-Duha, Müslim ibn Subəyh: O, İbn Abbasdan, ən-Numan ibn Bəşirdən və Zeyd ibn Ərqəmdən (rəvayət) eşidib. Əl-Aməş və Həbib ibn Əbi Sabit isə ondan (hədis) nəql ediblər.[63]**

Beləliklə, hədisin bütün ravilərin etibarlı və sənədinin tam, qopuqsuz olması aydın olur. Bu da o deməkdir ki, hədisin səhih olmasını deyənlər yanılmamışlar.

Bundan əlavə, İmam ət-Təbərani yazır:

[58] Şəmsuddin əz-Zəhəbi, Mizanul-itidal fi-nəqdur-rical, c.3, s.143, №5882
[59] İbn Həcər əl-Əsqəlani, Təqributt-təhzib, c.1, s.742, №5104
[60] İbn Həcər əl-Əsqəlani, Təqributt-təhzib, c.1, s.259, №1652
[61] İbn Həcər əl-Əsqəlani, Təqributt-təhzib, c.1, s.206, №1258
[62] İbn Həcər əl-Əsqəlani, Təqributt-təhzib, c.2, s.179, №6653
[63] Müslim ibn əl-Həccac, əl-Kuna vəl-əsma c.1, s.455, №1722





**حدثنا معاذ بن المثنى ثنا علي بن المديني ثنا جرير بن عبد الحميد عن الحسن بن عبيد الله عن أبي الضحى عن زيد بن أرقم قال قال رسول الله : إني تارك فيكم الثقلين كتاب الله وعترتي أهل بيتي وإنهما لن يتفرقا حتى يردا علي الحوض**

**Muaz ibn əl-Musənna - Əli ibn əl-Mədini - Cərir ibn Əbdül-Həmid - əl-Həsən ibn Ubeydullah - Əbud-Duha - Zeyd ibn Ərqəm yolu ilə nəql edilir ki,**

**Allah Rəsulu (s) buyurub: "Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və itrətimi, Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[64]**

Burada bizə tanış olmayan sadəcə 3 yeni ravi var.

Birinci ravi barədə əz-Zəhəbi yazır:

**معاذ بن المثنى أبو المثنى: ثقة، متقن.**

**Muaz ibn əl-Musənna, Əbul-Musənna:siqədir, mutqindir (çox güvənilləndir).[65]**

İkinci ravi barədə əl-Hafiz yazır:

**علي بن عبد الله بن جعفر بن نجيح السعدي مولاهم أبو الحسن بن المديني بصري ثقة ثبت إمام أعلم أهل عصره بالحديث وعلله**

**Əli ibn Abdullah ibn Cəfər ibn Nəcih əs-Sədi. Onların azad edilmiş köləsi idi. Əbul-Həsən ibn əl-Mədini əl-Bəsri: siqədir, səbtdir, imamdır, hədis və onun illətləri barədə öz dövrünün ən savadlı şəxsi idi.[66]**

Üçüncü ravi də əl-Hafizin qeydlərinə əsasən yüksək etibarlılığa malikdir:

**جرير بن عبد الحميد بن قرط بضم القاف وسكون الراء بعدها طاء مهملة الضبي الكوفي نزيل الري وقاضيها ثقة صحيح الكتاب قيل كان في آخر عمره يهم من حفظه**

**Cərir ibn Əbdül-Həmid ibn Qurt əd-Dəbi əl-Kufi: Rey şəhərində yaşayıb və oranın qazisi olub. Siqədir, səhihul-kitabdır (öz kitabından nəql etdiyi hər bir hədis səhihdir). Deyirlər ki, ömrünün son dövrlərində yaddaşındakı problemlərə görə vəhmə düşmüşdü.[67]**

Əl-Hafizin bu ravi barədə son tənqidi "deyirlər ki" ifadəsi üzərində qurulub və təbii olaraq, bu, şübhə yaratmaqdan başqa bir şey deyil. Başqa sözlə, əl-Hafiz Cəririn həqiqətən vəhmə düşməsini təsdiq etmir. İkincisi, hətta bu iddia qəbul edilsə belə, Cərir üçün heç bir problem yaratmayacaqdı. Belə ki, onun vəhmə düşməsi deyilib, lakin hədislərdə problem yaradacaq qədər çox deyil. Hər bir halda, Cərir üçün Xalid ibn Abdullahın mutəbəəsi mövcuddur. Yəni, Cərirdən başqa bu rəvayəti Xalid ibn

[64] Süleyman ibn Əhməd ət-Təbərani, Mucəmul-kəbir, c.5, s.170, №4981
[65] Şəmsuddin əz-Zəhəbi, Siyəru əlamin-nubəla, c.13, s.527, №259
[66] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.697, №4776
[67] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.158, №918





Abdullahda da məhz Əbud-Duhadan nəql etmiş və həmin sənəd də özü-özlüyündə tamamilə səhihdir.





Allah Rəsulu (s) Qədir-Xumda bütün insanlara elan etdi ki:

**إني تارك فيكم الثقلين كتاب الله وعترتي أهل بيتي وإنهما لن يتفرقا حتى يردا علي الحوض**

**Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar.**

Quran və Peyğəmbərin itrəti hədisdə "iki ağır əmanət" ("səqəleyn") kimi vəsf edilib. Hər ikisi Peyğəmbər (s) tərəfindən ümmətə əmanət olunaraq, Qiyamət gününə qədər bir-birindən ayrılmayacaqları müjdə verilib. Bəs görəsən Allah Rəsulu (s) bu ifadə ilə nə demək istəyib?

Hər hansı bir cəmiyyətin, yaxud millətin rəhbəri camaatına "Mən tezliklə öləcəyəm, lakin özümdən sonra sizə filan şeyi və filan şeyi qoyuram" deyərsə, onun nə demək istədiyi ehtimal edilə bilər? Əlbəttə ki, bu çox aşkar bir şeydir. Camaata sarılmaları üçün əmanət edilən seçilmiş şəxs onun yerinə namizəddir və onun vəzifələrini icra edəcək. Səqəleyn hədisi də açıq-aşkar bu mənadadır. Peyğəmbər özündən sonra Quran və itrətini öz ümməti üzərində əvəzedci olaraq bəyan etmişdir. Bu barədə Şeyx əl-Ərnautdan bir qeydi diqqətinizə çatdırmğı lazım bilirik:

**قال السندي: قوله: "إني تارك فيكم"، أي: بعد موتي.**

**الثَّقلين: الثقل، بفتحتين: كل شيء نفيس مصون، ومنه هذا الحديث، كذا في "القاموس."**

**أحدهما أكبر: هو الكتاب، لأنه إمام الكل: العترة، وغيرهم...**

**وعترتي: كأنه صلى الله عليه وسلم جعلهم قائمين مقامه، فكما كان في حياته القرآن والنبي، كذلك بعده القرآن وأهل بيته، ولكن قيامهم مقامه في وجوب المحبة والمراعاة والإحسان، لا في العمل بأقوالهم وآرائهم، بل المرجع في العمل: الكتاب والسنة، والله تعالى أعلم.**

**Əs-Sindi demişdir: Onun "sizin üzərində ... qoyub gedirəm" sözləri: yəni, ölümümdən sonra.**

**"İki ağır əmanət": hər bir qiymətsiz xəzinə "ağır əmanət" adlanır. Bu hədisdəki (həmin söz) də o mənadadır. "əl-Qamus lüğətində də bu cür yazılıb.**

**"Biri digərindən daha böyükdür": bu Qurandır, çünki o hər bir kəsə rəhbərdir - istər itrət olsun, istərsə də digərləri...**

**"və mənim itrətim": Sanki, Peyğəmbər (s) sağlığında onları öz məqamına təyin etmişdir. Öz sağlığında Quran və Peyğəmbər necə idisə, ondan sonra da Quran və onun Əhli-beyti o cürdür. Ancaq onların Peyğəmbər (s) məqamında olmağı söz və fikirlərinə tabe olmaq mənasında yox,**





**onlara qarşı sevgi və mərhəmət göstərmək, qayğılarına qalmaq mənasındadır. Belə ki, əməl üçün əsas (istinad) Quran və sünnədir. Allah daha yaxşısını bilir.[68]**

Bu fikir Peyğəmbərin Quran və itrətinin hər ikisini birlikdə nəzərdə tutaraq "iki ağır əmanət" deməsi ilə dəstəklənir.

Klassik əhli-sünnə dilçi alimi İmam İbn Mənzur (ö. 711 h.q.) bu ifadənin mənası barədə yazır:

**وروي عن النبي، صلى الله عليه وسلم، أنه قال في آخر عمره: إني تارك فيكم الثقلين: كتاب الله وعترتي، فجعلهما كتاب الله عز وجل وعترته، وقد تقدم ذكر العترة. وقال ثعلب: سميا ثقلين لأن الأخذ بهما ثقيل والعمل بهما ثقيل، قال: وأصل الثقل أن العرب تقول لكل شئ نفيس خطير مصون ثقل، فسماهما ثقلين إعظاما لقدرهما وتفخيما لشأنهما**

**Peyğəmbərdən (s) rəvayət edilmişdir ki, ömrünün sonlarında belə demişdir: "Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və itrətimi". Deməli, o, hər ikisini Allahın (ə.c) kitabını və itrətini ağır əmanət qərar vermişdir. "İtrət" sözü daha əvvəl izah olundu. Saləb demişdir: "(Peyğəmbər) onları ona görə "səqəleyn" adladırmışdır ki, onların hər ikisinə sarılmaq və arxalarınca getmək ağırdır (məsuliyyətlidir)". (Daha sonra) demişdir: "Səqəl sözünün əsli bundan ibarətdir ki, ərəblər hər bir qiymətli şeyə "səqəl" deyirlər. Odur ki, peyğəmbər (s) onları "səqəleyn" (iki ağır əmanət) adlandırmaqla, onların əhəmiyyətini vurğulamaq və mədh etmək istəyib."[69]**

Digər məşhur əhli-sünnə dilçi alimi İmam İbn əl-Əsir (ö. 606 h.q.) də eyni fikirdə olduğunu qeyd edib:

**[إني تارك فيكم الثقلين : كتاب الله وعترت] سماهما ثقلين لأن الأخذ بهما والعمل بهما ثقيل . ويقال لكك خطير نفيس ثقل فسماهما ثقلين إعظاما لقدرهما وتفخيما لشأنهما.**

**"Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və itrət". "(Peyğəmbər) onları ona görə "səqəleyn" adladırmışdır ki, onların hər ikisinə sarılmaq və arxalarınca getmək ağırdır (məsuliyyətlidir)". (Daha sonra) demişdir: "Hər bir qiymətli şeyə "səqəl" deyilir. Odur ki, peyğəmbər (s) onları "səqəleyn" (iki ağır əmanət) adlandırmaqla, onların əhəmiyyətini vurğulamaq və mədh etmək istəyib.[70]**

Baqa bir öndə gələn əhli-sünnə dilçi alimi əz-Zübeydi (ö. 1205 h.q.) yazır:

**وكذلك الحديث {إني تارك فيكم الثقلين، كتاب الله وعترتي} جعلهما ثقلين إعظاما لقدرهما وتفخيما لهما. وقال ثعلب: سماهما ثقلين؛ لأن الأخذ بهما والعمل بهما ثقيل.**

[68] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.17, s.174-175, №11104. Əs-Sindinin təqdimarı həqiqətən də çox qəribədir. Əhli-beyt (ə) Peyğəmbərdən (s) sonra onun yerinə keçib. Buna baxmayaraq, heç kəs onlara tabe olmağa borclu deyil. Bundan əlavə, görünür əs-Sindi Əhli-beytə tabeçiliyin insanı Quran və sünnədən uzaqlaşdıracağını düşünür. Heyhat! Əslində onlar Quran və Peyğəmbərin həqiqi irsini öyrənmək üçün ən pak vasitələrdir.
[69] İbn Mənzur əl-Misri, Lisanul-ərəb, c.11, s.85
[70] İbn əl-Əsir əl-Cəzəri, ən-Nihayə fi ğəribul-hədis vəl-asar, c.1, s.216





**Necə ki, hədisdə gəlib: "Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və itrətimi". Peyğəmbər (s) onları "səqəleyn" (iki ağır əmanət) adlandırmaqla, onların əhəmiyyətini vurğulamaq və mədh etmək istəyib. Saləb demişdir: "(Peyğəmbər) onları ona görə "səqəleyn" adladırmışdır ki, onların hər ikisinə sarılmaq və arxalarınca getmək ağırdır (məsuliyyətlidir)"[71]**

Növbəti sitat əhli-sünnə dilçi alimlərindən olan Əbu Mənsur əl-Əzhəridən (ö. 370 h.q.) olacaq:

**روي عن النبي (صلى الله عليه وسلم) أنَّه قال في مرضه الذي مات فيه: (إني تارك فيكم الثقلين: كتابَ الله وعِتْرتي، ولن يفترقا حتى يردا علي الحوض)، فسَّر النبي (صلى الله عليه وسلم) الثقلين فجعلهما كتاب الله جلّ وعزّ وعِترته عليه السلام؛ وقد فسّرت العترة فيما تقدّم وهم جماعةُ عشيرته الأدْنَوْن. وقال أبو العباس أحمد بن يحيى: سميا ثقلين لأن الأخذ بهما ثقيل، والعمل بهما ثقيل.**

**Peyğəmbərdən (s) rəvayət edilmişdir ki, ağır xəstəliyi zamanında belə demişdir: "Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və itrətimi. Onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar". Peyğəmbər (s) Allahın kitabı və itrətini səqəleyn qərar verməklə bu sözü (səqəleyn sözünü) izah etmişdir. "İtrət" sözü daha əvvəl izah olunduğu kimi, Peyğəmbərin ən yaxın qan qohumlarıdır. Əbül-Abbas Əhməd ibn Yəhya demişdir: "Onlar ona görə "səqəleyn" adlandırılmışlar ki, hər ikisinə sarılmaq və arxalarınca getmək ağırdır (məsuliyyətlidir)".[72]**

Məşhur hədis alimi İmam ən-Nəvəvi (ö. 676 h.q.) klassik əhli-sünnə alimlərinin görüşünü qeyd etmişdir:

**قوله صلى الله عليه وسلم (وانا تارك فيكم ثقلين) فذكر كتاب الله وأهل بيته قال العلماء سميا ثقلين لعظمهما وكبير شأنهما وقيل العمل بهما**

**Peyğəmbərin (s): "Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm" sözlərindən sonra "Allahın Kitabı və Əhli-beytimi" sözlərini qeyd etmişdir. Alimlər demişlər: "Peyğəmbər onların əhəmiyyətinin əzəməti və böyüklüyünə görə "səqəleyn" adlandırmışdır." Həmçinin deyilib: "hər ikisinə tabe olunmalı olduğuna görə".[73]**

Şeyx Əbdül-Baqi özünün "Səhih Müslim"ə təliqində "Səqəleyn" hədisinin altında yazır:

**(ثقلين) قال العلماء سميا ثقلين لعظمهما وكبير شأنهما وقيل لثقل العمل بها**

[71] Muhibbuddin əz-Zubeydi əl-Hənəfi, Tacul-urus min cəvahirul-qamus, c.14, s.85
[72] Əbu Mənsur əl-Əzhəri, Tahzibul-luğət, c.9, s.78
[73] Yəhya ibn Şərəf an-Nəvəvi, Şərh Səhih Müslim, c.15, s.180





**"Səqəleyn": Alimlər demişlər: "Peyğəmbər onların əhəmiyyətinin əzəməti və böyüklüyünə görə "səqəleyn" adlandırmışdır." Həmçinin deyilib: "hər ikisinə tabe olunmalı olduğuna görə".**[74]

Deməli, Peyğəmbərimiz (s) bildirmişdir ki, özündən sonra əvəzedici olaraq Quran və itrətini qoyub gedir. Peyğəmbər (s) onları xüsusi olaraq "Səqəleyn" (iki ağır əmanət) adlandırmaqla işarə etmişdir ki, biz onlardan bərk-bərk yapışmalı və onların həir ikisinin ardınca gedməliyik. Şərtlərdən asılı olmayaraq, bu mesajı nəzərdən qaçırmaq qeyri-mümkündür: Allah Rəsulunun (s) itrəti onun xəlifələridir və özündən sonra bütün ümmətin hidayətedicilərididir.

Bununla bərabər, Allah Rəsulu (s) öz itrətinin Qurandan Qiyamət gününə qədər ayrılmaz olduğunu qeyd etmişdir:

**وانهما لن يفترقا حتى يردا على الحوض**

**Həqiqətən, onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar.**

Nə deməkdir bu?

Şübhəsiz ki, Allahın Rəsulu (s) yaradılanlar içində ən bəlağətli və fəsahətli nitqə malik idi. Məhz bu səbəbdən o, ən mühüm məlumatları bir fikir çərçivəsində çatdıra bilirdi. O, Əhli-beytin (ə) yer üzündə yaşadıqları müddətdə Quranla ayrılıq ehtimalını mütləq şəkildə istisna edirdi.

Beləliklə, biz soruşuruq: Günah iş gördüyümüz müddətdə həmin o günahlar bizim Qurandan aralı düşməyimizə səbəb olur, ya yox? Əlbəttə ki, olur. Buna şübhə yoxdur. Bu o deməkdir ki, Peyğəmbərin (s) itrəti heç vaxt günah iş görmür. Əks təqdirdə, onlar ən azı günah iş gördükləri müddətdə Qurandan ayrı düşmüş olacaqlardı.

Bidət işlər, istər əqidəmizdə olsun, istərsə də əməllərimizdə - bizi Qurandan ayırırmı? Bəli, bunda da heç bir şəkk yoxdur. Hər cür bidət Qurana ziddir və hər kim bu işi görürsə, Allahın kitabına əks getmiş olur.

Beləliklə, Peyğəmbərin itrətinin inandığı, söylədiyi, əməl etdiyi və ya öyrətdiyi hər bir şey haqqdır, Allah və onun Rəsulundan (s) olan pak hidayət yoludur. İtrətin

[74] Müslim ibn əl-Həccac, əs-Səhih, c.4, s.1873, №2408 (36)





istənilən bir şeydə bidət sahibi olması mümkünsüz bir işdir. Belə olmasa, onlar ən azı bidət etdikləri müddətdə Qurandan ayrılmış olarlar.

Allah və Rəsulu (s) Quran və itrəti qovuşdurmaqla onları Qiyamət gününə qədər ayrılmaz qərar vermişlər. Bu, həmçinin hər bir inanclıya da ünvanlanmış göstərişdir ki, şəraitdən asılı olmayaraq onları bir-birindən ayırmasın. Əgər Quranı sevirsinizsə, itrəti də sevməlisiniz. Qurana hörmət edirsinizsə, itrətə də hörmət etməlisiniz. Quranın ardınca gedirsinizsə, itrətin də ardınca getməlisiniz. Qurana tabe olursunuzsa, itrətə də tabe olmalısınız. Əgər Quranı özünüzə imam və rəhbər hesab edirsinizsə, itrəti də özünüzə imam və rəhbər bilməlisiniz. Əgər Quranı bütün işlərinizdə ən böyük nümunə və yolgöstərən hesab edirsinizsə, deməli itrəti də bütün işlərinizdə ən böyük nümunə və yolgöstərən hesab etməlisiniz.

Sonuncu cümlə Əllamə əl-Əlbani tərəfindən də xüsusi vurğulanır. Bir fərqlə ki, əl-Əlbani "Quran və sünnə" barəsində danışır:

**بل يجب اعتبار الكتاب والسنة مصدرا واحدا لا فصل بينهما أبدا كما أشار إلى ذلك قوله صلى الله عليه وسلم : " ألا إني أتيت القرآن ومثله معه " يعني السنة وقوله: " لن يتفرقا حتى يردا علي الحوض"**

**Belə ki, Quran və sünnəni bir-birindən fərqləndirmədən vahid bir mənbə hesab etmək vacibdir. Necə ki, Allah Rəsulu buyurur: "Mənə Quran və onun mislində olan bir şey verilib", həmçinin buyurub: "Onlar Kövsər hovuzunun yanında mənimlə qovuşana qədər bir-birindən ayrılmayacaqlar".**[75]

Əllamə əl-Əlbani "Onlar Kövsər hovuzunun yanında mənimlə qovuşana qədər bir-birindən ayrılmayacaqlar" sözlərini iki şey arasında ayrıseçkilik etməyin əleyhinə dəlil hesab edir. Əlbəttə ki, o, bu ifadəni "sünnə" sözünə aid edib, lakin bu ifadənin səhih sənədli versiyası sadəcə Peyğəmbərin itrəti barədədir. Ona görə də, biz əl-Əlbaninin sözündən belə başa düşürük ki, Quran və Əhli-beyti bir-birindən fərqləndirmədən İslamda hidayət və elmin vahid mənbəyi olaraq götürmək vacibdir. Necə ki, Peyğəmbər (s) "Onlar Kövsər hovuzunun yanında mənimlə qovuşana qədər bir-birindən ayrılmayacaqlar" - deyə buyurub. Belə olduqda, bütün işlərdə Quranın

[75] Nasiruddin əl-Əlbani, Mənzilətus-sünnə fil-İslam, s.22





ardınca gedən, lakin itrətə tabe olmayan hər bir kəs Allah və Rəsulunun (s) sözlərinə müxalifət edərək aşkar bidət etmiş sayılacaq.





Səqələyn hədisinin bəzi mətnlərində xütbənin harada deyilməsi barədə heç bir məlumat verilməyib. Mümkündür ki, Peyğəmbər (s) bu sözləri Qədir-Xumda bəyan etmiş olsun. Bununla belə, həmin sözlərin Qədir-Xumdan əvvəl, yaxud sonra fərqli məkanlarda deyilməsi də istisna hal deyil. Gəlin İmam əl-Fəsavinin (ö. 277 h.q.) rəvayəti ilə başlayaq:

**حدثنا يحيى قال :حدثنا جرير عن الحسن بن عبيد الله عن أبي الضحى عن زيد بن أرقم قال: النبي صلى الله عليه وسلم :إني تارك فيكم ما إن تمسكتم به لن تضلوا كتاب الله عز وجل وعترتي أهل بيتي وإنهما لن يتفرقا حتى يردا علي الحوض.**

**Yəhya - - Cərir - əl-Həsən ibn Ubeydullah - Əbud-Duha - Zeyd ibn Ərqəm sənədilə rəvayət olunur ki:**

**Peyğəmbər (s) buyurub: "Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldığınız müddətdə əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və itrətim, Əhli-beytim. Həqiqətən, onlar Kövsər hovuzunun yanında mənimlə qovuşana qədər bir-birindən ayrılmayacaqlar."[76]**

Əl-Hafiz birinci ravi barədə deyir:

**يحيى بن يحيى بن بكير بن عبد الرحمن التميمي أبو زكريا النيسابوري ثقة ثبت إمام**

**Yəhya ibn Yəhya ibn Bukeyr ibn Əbdür-Rəhman ət-Təmimi, Əbu Zəkəriyya ən-Nisaburi: siqədir, səbtdir, imamdır.[77]**

İkinci ravi barədə isə belə deyir:

**جرير بن عبد الحميد بن قرط بضم القاف وسكون الراء بعدها طاء مهملة الضبي الكوفي نزيل الري وقاضيها ثقة**

**Cərir ibn Əbdül-Həmid ibn Qurt əd-Dəbi əl-Kufi. Rey şəhərində yaşayıb və oranın qazisi olub. Siqədir.[78]**

Üçücü ravi də əl-Hafizə görə etibarlıdır:

**الحسن بن عبيد الله بن عروة النخعي أبو عروة الكوفي ثقة فاضل**

**Əl-Həsən ibn Ubeydullah ibn Urvə ən-Nəxai, Əbu Urvə əl-Kufi: siqədir, fəzilətli şəxsdir.[79]**

Nəhayət sonuncu ravi:

**مسلم بن صبيح بالتصغير الهمداني أبو الضحى الكوفي العطار مشهور بكنيته ثقة فاضل**

**Müslim ibn Subeyh əl-Həmədani, Əbud-Duha əl-Kufi əl-Əttar, künyəsi ilə məşhurdur: siqədir, fəzilətli şəxsdir.[80]**

[76] Əbu Yusuf əl-Fəsəvi, əl-Mərifət vəl-tarix, c.1, s.294
[77] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.318, №7696
[78] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.158, №918. Daha öncə onun etibarlı ravi olduğunu qeyd etdik.
[79] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.158, №918; c.1, s.206, №1258
[80] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.179, №6653





Hədisin bütün raviləri güvəniləndir, sənədi isə tamdır. Bu da o deməkdir ki, hədis tamamilə səhihdir.

Bundan əlavə, İmam ət-Tirmizi bu rəvayət üçün şahid də nəql edib:

**حدثنا علي بن المنذر كوفي حدثنا محمد بن فضيل قال حدثنا الأعمش عن عطية عن أبي سعيد و الأعمش عن حبيب بن أبي ثابت عن زيد بن أرقم رضي الله عنهما قالا : قال رسول الله صلى الله عليه و سلم إني تارك فيكم ما إن تمسكتم به لن تضلوا بعدي أحدهما أعظم من الآخر كتاب الله حبل ممدود من السماء إلى الأرض وعترتي أهل بيتي ولن يتفرقا حتى يردا علي الحوض فانظروا كيف تخلفوني فيهما**

**Əli ibn əl-Munzir Kufi - Muhəmməd ibn Fudeyl - əl-Əməş - Ətiyyə - Əbu Səid (əl-Xudri); və əl-Əməş - Həbib ibn Əbi Sabit - Zeyd ibn ərqəm (r.a) sənədləri ilə rəvayət olunur ki:**

**Allah Rəsulu (s) buyurmuşdur: "Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldığınız müddətdə əsla azğınlığa düşməzsiniz: Onlardan biri digərindən böyükdür: Göydən yerə qədər uzanmış Allahın kitabı və itrətim, Əhli-beytim. Həqiqətən, onlar Kövsər hovuzunun yanında mənimlə qovuşana qədər bir-birindən ayrılmayacaqlar. Məndən sonra onlarla necə davranacağınıza diqqət edin."[81]**

Ət-Tirmizi deyir:

**وهذا حديث حسن غريب**

**Bu hədis həsən ğəribdir (yəni, həsən sənədə malikdir).[82]**

Əllamə əl-Əlbani isə belə yazır:

**صحيح**

**Səhihdir.[83]**

Seyyid Həsən əl-Səqqaf da eyni şərhi verir:

**ورواه الترمذي (5/633) برقم (3788) بسند صحيح بلفظ إني تارك فيكم ما إن تمسكتم به لن تضلوا بعدي أحدهما أعظم من الآخر كتاب الله حبل ممدود من السماء إلى الأرض وعترتي أهل بيتي ولن يتفرقا حتى يردا علي الحوض فانظروا كيف تخلفوني فيهما**

**Ət-Tirmizi (5/663, №3788) bu hədisi səhih sənədlə aşağıdakı mətnlə yazmışdır:**

**"Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldığınız müddətdə əsla azğınlığa düşməzsiniz: Onlardan biri digərindən böyükdür: Göydən yerə qədər uzanmış Allahın kitabı və itrətim, Əhli-beytim. Həqiqətən, onlar Kövsər hovuzunun yanında mənimlə qovuşana qədər bir-birindən ayrılmayacaqlar. Məndən sonra onlarla necə davranacağınıza diqqət edin."[84]**

İmam Əhmədin (ö. 241 h.q.) "əl-Müsnəd" kitabında yazılır:

81 Əbu İsa ət-Tirmizi, c.5, s.663 №3788
82 Həmin mənbə
83 Həmin mənbə
84 Həsən əs-Səqqaf, Səhih şərhul-əqidətit-Təhaviyyə, s.654





**حدثنا عبد الله حدثني أبي ثنا بن نمير ثنا عبد الملك بن أبي سليمان عن عطية العوفي عن أبي سعيد الخدري قال قال رسول الله صلى الله عليه و سلم: اني قد تركت فيكم ما ان أخذتم به لن تضلوا بعدي الثقلين أحدهما أكبر من الآخر كتاب الله حبل ممدود من السماء إلى الأرض وعترتي أهل بيتي الا وانهما لن يفترقا حتى يردا على الحوض**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - İbn Numeyr - Əbdül-Malik ibn Əbi Süleyman - Ətiyyə əl-Aufi - Əbu Səid əl-Xudri sənədi ilə rəvayət edilir ki:**

**Allah Rəsulu (s) buyurub: "Sizin üzərinizdə elə iki əmanət qoyuram ki, onlara sarıldığınız müddətdə əsla azğınlığa düşməzsiniz. İki ağır əmanət. Onlardan biri digərindən böyükdür: Göydən yerə qədər uzanmış Allahın kitabı və itrətim, Əhli-beytim. Həqiqətən, onlar Kövsər hovuzunun yanında mənimlə qovuşana qədər bir-birindən ayrılmayacaqlar."[85]**

Şeyx Şueyb əl-Ərnaut yazır:

**حديث صحيح دون قوله " وإنهما لن يفترقا حتى يردا علي الحوض"**

**"Həqiqətən, onlar Kövsər hovuzunun yanında mənimlə qovuşana qədər bir-birindən ayrılmayacaqlar." ifadəsi istisna olmaqla, hədis səhihdir.[86]**

Göründüyü kimi, əl-Ərnaut hədisin son cümləsini qəbul etmir, digər bütün mətnini isə qəbul edir. Ancaq bu çox qəribədir. Biz artıq bu kitabda həmin ifadənin doğruluğunu isbat edən Zeyd ibn Ərqəmin səhih sənədli rəvayətlərini qeyd etmişik. Açıq-aşkar sezilir ki, Şeyx əl-Ərnaut bu nəticəni lazımi araşdırma aparmadan əldə edib. Bundan əlavə, bu son rəvayətin sənədi də etibarlıdır. Rəvayəti Əhmədin "Müsnəd"indən gətirdikdən sonra hədisin setibarlığını əl-Əlbani də qeyd edir.

**وهو إسناد حسن في الشواهد.**

**Hədisin sənədi şahidlər vasitəsiylə həsəndir.[87]**

Maraqlıdır ki, əl-Ərnaut başqa bir kitabda Ətiyyənin Əbu Səid əl-Xudridən nəql etdiyi eyni sənədli hədis barəsində yazır:

**سنده حسن بالشواهد.**

**Şahidlər vasitəsiylə sənədi həsəndir.[88]**

Deməli, hədisin bütün hissələri tam olaraq səhih sənədlə rəvayət edilmiş və mətnləri sabit olmuşdur.

[85] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.3, s.59, №11578
[86] Həmin mənbə
[87] Nasiruddin əl-Əlbani, Silsilətul-əhadisis-səhihə, c.4, s.357, №1761
[88] Muhəmməd ibn İbrahim əl-Vəzir əl-Yəmani, əl-Əvasim vəl-qəvasim, c.1, s.178, haşiyə №1





İmam əl-Fəsavi (ö.277 h.q.) yazır:

**حدثنا عبيد الله قال: أخبرا شريك عن الركين عن قاسم بن حسان عن زيد بن ثابت قال: قال رسول الله صلى الله عليه وسلم: إني تارك فيكم خليفتي كتاب الله عز وجل وعترتي أهل بيتي وإنهما لن يتفرقا حتى يردا علي الحوض.**

**Ubeydullah - Şərik - əl-Rukeyn - Qasim ibn Həssan - Zeyd ibn Sabit sənədilə nəql edilir ki:**

**Allah Rəsulu (s) buyurub: "Sizin üzərinizdə öz xəlifəmi qoyub gedirəm: Allahın Kitabı və İtrətimi, Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[89]**

Əl-Hafiz birinci ravi barədə yazır:

**عبيد الله بن موسى بن أبي المختار باذام العبسي الكوفي أبو محمد ثقة كان يتشيع**

**Ubeydullah ibn Musa ibn Əbil-Muxtar əl-Ubsi əl-Kufi, Əbu Muhəmməd: siqədir, şiə idi.[90]**

İkinci ravi olan Şərik barədə İmam əl-Mizzi (ö.742 h.q.) yazır:

**استشهد به البخاري في " الجامع " وروى له في " رفع اليدين في الصلاة " وغيره. وروى له مسلم في " المتابعات "، واحتج به الباقون.**

**Əl-Buxari öz "əl-Came" ("Səhihul-Buxari") kitabında onu şahid olaraq gətirmiş, "Namazda hər iki əlin qaldırılması" fəslində və digər fəsillərdə ondan rəvayət nəql etmişdir. Həmçinin, Müslim də ondan "mutabaət" (dəstəkləyici rəvayət) kimi hədis nəql etmişdir. Digərləri ona höccət olaraq etibar etmişlər. [91]**

İmam əz-Zəhəbi onun barəsində oxşar sözlər demişdir:

**قلت: استشهد به البخاري، وخرج له مسلم متابعة، واحتج به النسائي، وغيره.**

**Mən (əz-Zəhəbi) deyirəm: Əl-Buxari onu şahid olaraq gətirmiş, həmçinin, Müslim də ondan "mutabaət" (dəstəkləyici rəvayət) kimi hədis nəql etmişdir. Ən-Nəsai və digərləri ona höccət olaraq etibar etmişlər.[92]**

Klassik əhli-sünnə alimlərinin böyük əksəriyyəti onu fərdi qaydada höccət hesab ediblər. Bununla belə, İmam əl-Hakimin Şərik barədə fikri İmam Müslimdən tamamilə fərqlidir. Məsələn, o, bir rəvayət haqqında yazır:

**وله شاهد على شرط مسلم فقد احتج بشريك بن عبد الله النخعي**

**(Bu rəvayətin) Müslimin şərtlərinə uyğun şahidi var. Belə ki, o, Şərik ibn Abdullah ən-Nəxaini höccət hesab edərək dəlil gətirmişdir.[93]**

O, başqa bir yerdə bu fikrini təkrar edir:

---

[89] Əbu Yusuf əl-Fəsəvi, əl-Mərifət vət-tarix, c.1, s.294
[90] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.640, №4361
[91] Cəmaluddin əl-Mizzi, Təhzibul-kəmal fi əsmair-rical c.12, s.475, №2736
[92] Şəmsuddin əz-Zəhəbi, Tarixul-islam, c.11, s.169
[93] Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn, c.1, s.65, №45





وقد احتج مسلم بشريك بن عبد الله وهو أن يحتج بـه

**Müslim Şərik ibn Abdullahdan dəlil gətirmişdir və o, (höccət olaraq) dəlil gətirilməli şəxsdir.**[94]

Başqa bir yerdə:

وهو غريب صحيح فإن مسلما قد احتج بشريك بن عبد الله

**Bu, qərib səhihdir. Belə ki, Müslim Şərik ibn Abdullahdan dəlil gətirmişdir.**[95]

Sadə dillə desək, Əl-Hakimin fikrincə, Şərikin hədisləri İmam Müslimin şərtlərinə əsasən səhihdir.

Əl-Hafiz də öz növbəsində Şərik barədə bəzi əlavə məlumatlar verir ki, Buxari və Müslimin onun rəvayətlərinə meyl etmə səbəblərinə aydınlıq gətirilə bilər:

شريك بن عبد الله النخعي الكوفي القاضي بواسط ثم الكوفة أبو عبد الله صدوق يخطئ كثيرا تغير حفظه منذ ولي القضاء بالكوفة وكان عادلا فاضلا عابدا وشديدا على أهل البدع

**Şərik ibn Abdullah ən-Nəxai əl-Kufi: Əvvəl Vasitin, sonra isə Kufənin qazisi olmuşdur. (Künyəsi) Əbu Abdullahdır. Səduqdur. çox sayda səhvlər etmişdir. Kufənin qazisi olduqdan sonra yaddaşı pisləşməyə başlamışdır. O, adil, fazil, abid şəxs idi və bidət əhlinə qarşı şiddətli olmuşdur.**[96]

Göründüyü kimi, onun yaddaş problemi Kufə qazisi olandan sonra başlayıb. Bundan əvvəl isə kifayət qədər dəqiq ravi olub. Belə ki, İmam İbn Adiy (ö. 365 h.q.) çox mühüm bir nöqtəyə toxunur ki, mütləq diqqətə alınmalıdır:

والغالب على حديثه الصحة والاستواء والذي يقع في حديثه من النكرة إنما أتي فيه من سوء حفظه

**Onun (şeyxlərindən nəql etdiyi) hədislərin böyük əksəriyyəti səhih və dəqiqdir. Hədislərindəki qeyri-dəqiqlik isə sadəcə zəif yaddaşından irəli gəlir.**[97]

Bununla da bütün daşlar öz yerinə oturmuş olur. Yaddaş problemlərinə baxmayaraq, onun əksər hədisləri səhih və dəqiqdir. Deməli, "çox sayda" səhvlər etməsi sadəcə nisbi deyilmiş bir sözdür. Daha aydın olması üçün gəlin başqa bir əhli-sünnə alimi İmam əl-İclinin (ö. 261 h.q) sözlərini nəzərdən keçirək:

شريك بن عبد الله النخعي القاضي كوفي ثقة وكان حسن الحديث وكان أروى الناس عنه إسحاق بن يوسف الأزرق الواسطي سمع منه تسعة آلاف حديث

---

94 Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn, c.1, s.193, №377
95 Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn, c.1, s.539, №1412
96 İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.417, №2795
97 Abdullah ibn Adiy əl-Cürcani, əl-Kamil fi duafair-rical, c.4, s.22, №888/8





**Şərik ibn Abdullah ən-Nəxai: qazidir, Kufəlidir. Siqədir, hədisləri həsəndir. Ondan ən çox rəvayət nəql edən İshaq ibn Yusif əl-Əzrəq əl-Vasiti olmuşdur. O, Şərikdən 9000 hədis eşitmişdir.**[98]

Göründüyü kimi, Şərik çox məhsuldar bir hədis ravisi olmuşdur. Təkcə İshaq ondan 9000 hədis rəvayət etmişdir. Görün indi digərləri ondan nə qədər nəql edib. Bununla belə, gəlin təsəvvür edək ki, Şərik ömür boyu sadəcə 9000 hədis nəql edib. Belə olduqda, yaddaşındakı problemlərə görə hədislərinin neçəsində səhv etmiş olacaq? İmam İbn Adiy bu suala cavab tapmaqda bizə kömək edəcək:

**حدثنا عمر بن سنان سمعت إبراهيم بن سعيد الجوهري يقول أخطأ شريك في أربع ماية حديث**

**Ömər ibn Sinan bizə rəvayət etdi ki, İbrahim ibn Səd əl-Cövhərinin belə dediyini eşitdim: "Şərik 400 hədisdə xəta edib".**[99]

Başqa sözlə, Şərik hər 90 hədisin 4-ündə zəif yaddaşına görə xəta etmiş olur. Deməli, hər 90 hədisin 86-sı səhih və dəqiq olaraq qalır. Sizi and verirəm Allaha, bu, Şərikin aradan götürülməsinə və bütün hədislərinin tərk edilməsinə - necə ki, bəzi əhli-sünnə nümayəndələri edirlər - kifayət edirmi? Onun haqqındakı şişirdilmiş tənqidlər nəyə lazımdır?

Bu detallı açıqlamalardan sonra onun barəsində şişirdilmiş tənqidlərə son qoyulacağına ümid edirik. Belə ki, onun vəziyyəti bəzilərinin təqdim etdiyi kimi deyil. Təsadüfi deyil ki, klassik əhli-sünnə alimlərinin çoxu öz kitablarında ona etibar etmişlər. İmam əz-Zəhəbi onun barəsində aşağıdakı fikrə gəlir:

**قلت: كان شريك حسن الحديث إماما فقيها ومحدثا مكثرا ليس هو في الاتقان كحماد بن زيد. وقد استشهد به البخاري وخرج له مسلم متابعة. ووثقه يحيى بن معين ... وحديثه من أقسام الحسن.**

**Mən (əz-Zəhəbi) deyirəm: "Şərikin hədisləri həsəndir. O, imam, fəqih və məhsuldar mühəddis idi. Həmmad ibn Zeyd kimi dəqiq olmasa da, əl-Buxari onu şahid kimi gətirmiş, Müslim ondan "mutabaət" qismində nəql etmiş və Yəhya ibn Məin onu siqə hesab etmişdir... Onun hədisləri həsən dərəcəsindədir.**[100]

İmam əl-İcli də bu barəd eyni fikirdədir:

**شريك بن عبد الله النخعي القاضي كوفي ثقة وكان حسن الحديث**

---

[98] Əhməd ibn Abdullah əl-İcli, Marifətus-siqat, c.1, s.453, №727
[99] Abdullah ibn Adiy əl-Cürcani, əl-Kamil fi duafair-rical, c.4, s.8, №888/8
[100] Şəmsuddin əz-Zəhəbi, Təzkirətul-huffaz, c.1, s.170





**Şərik ibn Abdullah ən-Nəxai, qazidir, Kufəlidir. Siqədir və hədisləri həsəndir.**[101]

İmam əl-Heysəmi də həmçinin demişdir:

**رواه كله أحمد ورجال الروايتين رجال الصحيح غير شريك بن عبد الله النخعي وهو حسن الحديث**

**Hədis tam şəkildə Əhməd tərəfindən nəql edilmişdir və hədisləri həsən dərəcəsində olan Şərik ibn Abdullah ən-Nəxaidən başqa iki hədisin də raviləri "əs-Səhih"in raviləridir.**[102]

Beləliklə, Şərik hər 90 hədisində cəmi 4 xəta edən siqə bir ravidir. O, əksər klassik əhli-sünnə alimləri tərəfindən höccət olaraq qəbul edilmişdir. Ancaq bəzi alimlərin fikrincə, xətaları səbəbilə hədisləri həsən dərəcəsindədir. Bizim acizanə fikrimizcə, belə cüzi xətalar onun hədislərinin dərəcəsini səhih mərtəbəsindən aşağı salmaq üçün, yaxud bəziləri kimi ümumən rədd etmək üçün kifayət deyil.

Üçüncü ravi olan ər-Rukeyn də siqədir, necə ki, İbn Şahin bildirir:

**الركين بن الربيع ثقة قاله أحمد**

**Ər-Rukeyn ibn ər-Rəbi: siqədir. Əhməd də o fikirdədir.**[103]

İmam İbn Hibban (ö.354 h.q.) da onu siqə ravilər siyahısına daxil etmişdir.[104] Daha da maraqlısı, o, İmam Müslim tərəfindən höccət hesab edilərək "əs-Səhih"inə daxil edilmişdir.[105] Ona görə də Şeyx əl-Ərnaut sənədində ər-Rukeyn olan müstəqil bir rəvayəti "Müslimin şərtlərinə əsasən səhih" hesab etmişdir.[106]

Nəhayət, dördüncü ravi əl-Qasimə gəlib çatırıq. İmam İbn Şahin yazır:

**القاسم بن حسان الذي روى عن زيد بن ثابت ثقة قاله أحمد بن صالح**

**Zeyd ibn Sabitdən hədis rəvayət edən əl-Qasim ibn Həssan siqədir. Əhməd ibn Salih də bu fikirdədir.**[107]

O, həmçinin, İbn Hibban tərəfindən də siqə hesab edilmişdir.[108] Bundan əlavə, əl-İcli yazır:

**القاسم بن حسان كوفي تابعي ثقة**

**Əl-Qasim ibn Həssan: Kufəlidir, tabeindir, siqədir.**[109]

İmam əz-Zəhəbi yazır:

---

[101] Əhməd ibn Abdullah əl-İcli, Marifətus-siqat, c.1, s.453, №727
[102] Nurəddin əl-Heysəmi, Məcməuz-zəvaid, c.9, s.164, №14712
[103] Əbu Həfs Ömər ibn Şahin, Tarix əsmaus-siqat, s.88, №369
[104] İbn Hibban ət-Təmimi, Kitabus-siqat, c.4, s.243
[105] bax: Müslim ibn əl-Həccac, əs-Səhih, c.3, s.1685, №2136 (11)
[106] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.4, s.69, №16696
[107] Əbu Həfs Ömər ibn Şahin, Tarix əsmaus-siqat, s.189, №1148
[108] İbn Hibban ət-Təmimi, Kitabus-siqat, c.7, s.335
[109] Əhməd ibn Abdullah əl-İcli, Marifətus-siqat, c.2, s.210, №1495





**القاسم بن حسان العامري، عن زيد بن ثابت، وجماعة، وعنه الركين بن الربيع، والوليد بن قيس، وثق.**

**əl-Qasim ibn Həssan əl-Amiri: O, Zeyd ibn Sabitdən və digərlərindən hədis nəql etmişdir. Ər-Rukeyn ibn ər-Rabi və əl-Vəlid ibn Qeys isə ondan rəvayət etmişlər. Siqə hesab edilmişdir.**[110]

Əlavə olaraq qeyd edək ki, əl-Hakim və əz-Zəhəbinin hər ikisi ər-Rukeyn ibn ər-Rabinin müstəqil olaraq əl-Qasim ibn Həssandan, onun da müstəqil olaraq Zeyd ibn Sabitdən nəql etdiyi hədisin sənədini səhih hesab etmişlər.[111] İmam İbn Xuzeymə (ö. 311 h.q.) də həmçinin, bu sənədə etibar etmişdir:

**وحدثني الركين بن الربيع عن القاسم بن حسان عن زيد بن ثابت عن النبي صلى الله عليه و سلم**

**ər-Rukeyn ibn ər-Rabi - əl-Qasim ibn Həssan - Zeyd ibn Sabit - Allahın Rəsulu (s).**[112]

Aydındır ki, İbn Xuzeymə həm ər-Rukeyni, həm də əl-Qasimi siqə, yaxud ən azı səduq hesab edir. Şeyx Əl-Əzami yuxarıda qeyd edilmiş sənədin təhqiqində yazır:

**إسناده صحيح**

**Sənədi səhihdir.**[113]

Beləliklə, bütün ravilər siqədir, hədisin sənədində heç bir qopuqluq yoxdur. Deməli, Xəlifəteyn hədisinin sənədi səhih, ən azı isə həsəndir.

Hədisdə Allah Rəsulu (s) Quran və itrətini açıq-aşkar özünün "xəlifəsi" adlandırır. Bu da deməkdir ki, onlar onun xəlifələridir. "Xəlifə" sözü təkdə işlənməsinə baxmayaraq, həm tək şəxsə, həm də cəmə aid edilə bilər. İmam Rağib əl-İsfahani belə izah edir:

**والخليفة يقال للواحد والجمع ، وهاهنا [هو] جمع ، فإن الخليفة لم يرد به آدم عليه السلام فقط ، بل أريد هو وصالحو أولاده ، فهم خلفاؤه**

**"Xəlifə" sözü həm tək, həm də cəm üçün istifadə edilir. Burada (Bəqərə, 30) cəm üçün işlənmişdir, çünki "xəlifə" sözü təkcə Adəmə yox, həmçinin nəslindəki saleh şəxslərə də aiddir. Deməli, onlar onun xəlifələridir.**[114]

Əlbəttə ki, "xəlifə" (təkdə), yaxud "xulafa" (cəmdə) işlənməsindən asılı olmayaraq, məna eynidir.

[110] Şəmsuddin əz-Zəhəbi, əl-Kaşif, c.2, s.127, №4506
[111] Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn, c.4, s.216, №7418
[112] Muhəmməd ibn Xuzeymə, Səhih, c.2, s.294, №1345
[113] Həmin mənbə
[114] Ər-Rağib əl-İsfəhani, Təfsir ər-Rağib əl-İsfəhani və muqəddimətuh, c.1, s.139





Bundan əlavə, xəlifə, bu və ya digər səbəbdən fiziki olaraq mövcud olmayan birinin yerinə keçən şəxsdir. Böyük əhli-sünnə lüğətşünası İmam İbn əl-Əsir (ö. 606 h.q.) yazır:

**الخليفة من يقوم مقام الذاهب ويسد مسده**

**Xəlifə, fiziki olaraq mövcud olmayan birinin yerinə keçən və onu əvəz edən şəxsdir.**[115]

Deməli, Allah Rəsulu tərəfindən özünün yerinə keçməsi və onu əvəz edərək ümmət üzərində rəhbərliyi həyata keçirməsi üçün qoyub getdiyi şey Quran və itrətdir, Əhli-beytdir.

[115] İbn əl-Əsir əl-Cəzəri, ən-Nihayə fi ğəribul-hədis vəl-asar, c.2, s.69





Bizə aydın oldu ki, Allah Rəsulu (s) Quran və itrətini özündən sonra ümmət üçün xəlifəteyn (iki xəlifə) adlandırmışdır. Bu o deməkdir ki, Allahın kitabı bir xəlifədir, itrət isə digər xəlifə.

Bundan öncəki fəslin sonunda qeyd etdiyimiz kimi, "xəlifə" sözü həm cəmə, həm də təkə aid ola bilər. Beləcə, həm Quran, həm də itrət Hz.Muhəmmədin (s) ümməti üzərində xəlifələridir.

İmam İbn Əbi Şeybə (ö.235 h.q.) iki xəlifə rəvayətini aşağıdakı şəkildə nəql etmişdir:

**أبو داود عمر بن سعد عن شريك عن الركين عن القاسم بن حسان عن زيد بن ثابت يرفعه قال : إني تركت فيكم الخليفتين كاملتين :كتاب الله وعترتي، وإنهما لن يتفرقا حتى يردا علي الحوض.**

**Əbu Davud Ömər ibn Səd - Şərik - ər-Rukeyn - əl-Qasim ibn Həssan - Zeyd ibn Sabit sənədilə nəql edilmişdir ki:**

**Allah Rəsulu (s) buyurub:**

**"Sizin üzərinizdə iki kamil xəlifə qoyub gedirəm: Allahın Kitabı və İtrətimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[116]**

Kitabın mühəqqiqləri hədis barədə deyirlər:

**والحديث صحيح، له شواهد**

**Hədis səhihdir. Onun şahidləri var.[117]**

Hədisin sənədində bizim üçün tanış olmayan yeganə ad Ömər ibn Səddir. Onun barəsində əl-Hafiz yazır:

**عمر بن سعد بن عبيد أبو داود الحفري بفتح المهملة والفاء نسبة إلى موضع بالكوفة ثقة عابد**

**Ömər ibn Səd ibn Ubeyd, Əbu Davud əl-Həfəri: siqədir, abid şəxsdir.[118]**

Beləliklə, sənəd səhihdir, ən azı isə həsəndir.

Bu rəvayət İmam Əhmədin (ö.241 h.q.) "əl-Müsnəd" kitabında da nəql etmişdir:

**حدثنا عبد الله حدثني أبي ثنا الأسود بن عامر ثنا شريك عن الركين عن القاسم بن حسان عن زيد بن ثابت قال قال رسول الله صلى الله عليه و سلم انى تارك فيكم خليفتين كتاب الله حبل ممدود ما بين السماء والأرض أو ما بين السماء إلى الأرض وعترتي أهل بيتي وإنهما لن يتفرقا حتى يردا على الحوض**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - əl-Əsvəd ibn Amir - Şərik - ər-Rukeyn - əl-Qasim ibn Həssan - Zeyd ibn Sabit sənədilə nəql edilir ki:**

[116] Əbu Bəkr Abdullah ibn Əbi Şeybə, Müsnəd ibn Əbi Şeybə, c.1, s.108
[117] Həmin mənbə
[118] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.718, №4920





**Allah Rəsulu (s) buyurdu: "Sizin üzərinizdə iki xəlifə qoyub gedirəm: Göylə yer arasında və ya göydən yerə uzanmış ip olan Allahın Kitabı və İtrətimi, Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[119]**

Şeyx əl-Ərnaut yazır:

**حديث صحيح بشواهده دون قوله : "وإنـهما لن يتفرقا حتى يردا علي الحوض" وهذا إسناد ضعيف لسوء حفظ شريك**

**Hədis şahidlərlə səhihdir. "Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar." ifadəsindən başqa. Bu sənəd Şərikin pis yaddaşı səbəbilə zəifdir.[120]**

Deməli, onun sənədlə yeganə problemi Şərik adlı ravidir. Halbuki, əvvəlki fəsildə isbat etdiyimiz kimi, Şərikin hədisləri ya səhih, ya da həsəndir. Əl-Ərnautun bu mövqeyi lüzumsuz mübaliğədən başqa bir şey deyil.

Əhməd ibn Hənbəlin sənədində tərcümeyi-halının araşdırılmasına ehtiyac olan sadəcə bir ravi var ki, o da əl-Əsvəd ibn Amirdir. Əl-Hafiz onun barəsində deyir:

**الأسود بن عامر الشامي نزيل بغداد يكنى أبا عبد الرحمن ويلقب شاذان ثقة**

**Əl-Əsvəd ibn Amir əş-Şami: Bağdadda yaşayıb. Künyəsi Əbu Əbdür-Rəhman, ləqəbi isə Şazan idi. Siqədir.[121]**

Beləliklə, sənəd səhihdir, Şərikə görə etiraz olsa, ən azı həsən dərəcəsində ola bilər.

"əl-Müsnəd" kitabında qeyd edilən digər bir hədisdə yazılır:

**حدثنا عبد الله حدثني أبي ثنا أبو أحمد الزبيري ثنا شريك عن الركين عن القاسم بن حسان عن زيد بن ثابت قال قال رسول الله صلى الله عليه و سلم إني تارك فيكم خليفتين كتاب الله وأهل بيتي وإنـهما لن يتفرقا حتى يردا على الحوض جميعا**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Əbu Əhməd əz-Zubeyri - Şərik - ər-Rukeyn - əl-Qasim ibn Həssan - Zeyd ibn Sabit sənədilə nəql edilir ki:**

**Allah Rəsulu (s) buyurdu: "Sizin üzərinizdə iki xəlifə qoyub gedirəm: Allahın Kitabı və Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[122]**

Şeyx əl-Ərnaut əvvəlki iddiasını davam etdirir:

**حديث صحيح بشواهده دون قوله : " وإنـهما لن يتفرقا حتى يردا علي الحوض جميعا"**

[119] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.181, №21618
[120] Həmin mənbə
[121] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.102, №504
[122] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.189, №21697





**Hədis şahidlərlə səhihdir. "Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar." ifadəsindən başqa.[123]**

Yeganə tanımadığımız ravi əz-Zubeyridir. Əl-Hafiz onun tərcümeyi-halında yazır:

**محمد بن عبد الله بن الزبير بن عمر بن درهم الأسدي أبو أحمد الزبيري الكوفي ثقة ثبت إلا أنه قد يخطئ في حديث الثوري**

**Muhəmməd ibn Abdullah ibn əz-Zubeyr ibn Ömər ibn Dirhəm əl-Əsədi, Əbu Əhməd əz-Zubeyri əl-Kufi: siqədir, səbtdir, Yalnız əs-Səvrinin hədislərində xəta edir.[124]**

Hədisimiz isə əs-Səvri yolu ilə nəql edilmir. Deməli, onunla bağlı heç bir problem yoxdur və hədisimiz səhih, ən pis halda həsəndir. Beləliklə, əl-Ərnautun etiraz etdiyi ifaədələr də daxil olmaqla, hədisin mətni tam şəkildə sübut edilmişdir.

İmam İbn Əbi Asim (ö.287 h.q.) də bu rəvayəti nəql etmişdir:

**ثنا أبو بكر، ثنا عمرو بن سعد أبو داود الحفري، عن شريك، عن الركين عن القاسم بن حسان، عن زيد بن ثابت قال قال رسول الله صلى الله عليه وسلم: إني تارك فيكم الخليفتين من بعدي، كتاب الله وعترتي أهل بيتي وإنهما لن يتفرقا حتى يردا علي الحوض.**

**Əbu Bəkr - Əmr ibn Səd Əbu Davud əl-Həfəri - Şərik - ər-Rukeyn - əl-Qasim ibn Həssan - Zeyd ibn Sabit sənədilə nəql edilir ki:**

**Allah Rəsulu (s) buyurdu: "Sizin üzərinizdə özümdən sonra iki xəlifə qoyub gedirəm: Allahın Kitabı və İtrətimi, Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[125]**

Əllamə əl-Əlbani (ö.1420 h.q.) yazır:

**حديث صحيح. وإسناده ضعيف لسوء حفظ شريك وهو ابن عبد الله القاضي والقاسم بن حسان مجهول الحال. والحديث أخرجه أحمد 5/181-182 و189 و190 من طريقين آخرين عن شريك به. وإنما صححته لأن له شواهد تقوية**

**Hədis səhihdir, lakin sənədi Şərikin pis yaddaşı səbəbilə zəifdir. O, Abdullahın oğludur, qazidir. Həmçinin, əl-Qasim ibn Həssanın halı məchuldur. Bu hədisi Əhməd (5/181-182, 189 və 190) iki sənədlə Şərikdən rəvayət etmişdir. Mən bu hədisi yalnız onu gücləndirən şahidləri olduğu üçün səhih hesab etmişəm.[126]**

Göründüyü kimi, əl-Əlbani də anti-Şərik xətasına yoluxub. Hər bir halda, Şərikin həsənul-hədis olduğunu bilirik. Bundan əlavə, əl-Qasim ibn Həssanın halı məchul deyil, əksinə, əvvəlki fəsillərdə isbat etdik ki, tanınan və siqə ravidir.

[123] Həmin mənbə
[124] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.95, №6036
[125] Əbu Bəkr ibn Əbi Asim, Kitabus-sunnə, c.2, s.350-351, №754
[126] Əbu Bəkr ibn Əbi Asim, Kitabus-sunnə, c.2, s.351, №754





Burada bizim üçün yeni ad Əbu Bəkrdir. Əl-Hafizin onun barəsində fikri aşağıdakı kimidir:

**عبد الله بن محمد بن أبي شيبة إبراهيم بن عثمان الواسطي الأصل أبو بكر بن أبي شيبة الكوفي ثقة حافظ صاحب تصانيف**

**Abdullah ibn Muhəmməd ibn Əbu Şeybə İbrahim ibn Osman - əslən əl-Vasiti nəslindəndir - Əbu Bəkr ibn Əbi Şeybə əl-Kufi: siqədir, hafizdir, bir sıra kitab müəllifidir.**[127]

Beləliklə, hədisin sənədi ya səhihdir, ya da həsən.

[127] İbn Həcər əl-Əsqəlani, Təqributt-təhzib, c.1, s.528, №3586





Hər bir ümmətin peyğəmbər ailələri vardır. Məsələn, Nuhun (ə) ailəsi onun ümmətinin peyğəmbər ailəsidir. Eynilə də, İbrahimin (ə) ailəsi onun öz ümmətinin peyğəmbər ailəsi idi.

Bizə gəldikdə isə, Hz.Muhəmməd (s) bizim peyğəmbərimizdir və onun ailəsi bizim peyğəmbər ailəmizdir. Bu məsələ əhli-sünnə alimləri tərəfindən də təsdiq edilmişdir. Məsələn, əl-Hafiz İbn Həcər əl-Əsqəlani (ö.852 h.q.) yazır:

**ويستفاد من قصة العباس استحباب الاستشفاع بأهل الخير والصلاح وأهل بيت النبوة**

**Abbasın hekayəsindən məlum olur ki, xoşəməl və saleh şəxslərə, o cümlədən Peyğəmbər əhli-beytinə (ailəsinə) təvəssül etmək bəyənilən əməldir.**[128]

İmam əl-Mubarəkfuri (ö. 1282 h.q.) bir hədisi şərh edərkən yazır:

**{ما اختصنا} أي أهل البيت يريد به نفسه وسائر أهل بيت النبوة**

**"Digər insanlardan ayrı olaraq, bizə", yəni Əhli-beytinə. O, bununla özünü və peyğəmbər ailəsinin digər üzvlərini nəzərdə tuturdu.**[129]

İbrahim Peyğəmbərin ailəsi barədə İmam əz-Zəməxşəri (ö.538 h.q.) yazır:

**وإلى ذلك أشارت الملائكة صلوات الله عليهم في قولهم {رحمت الله وبركاته عليكم أهل البيت} أرادوا أن هذه وأمثالها مما يكرمكم به رب العزة ويخصكم بالإنعام به يا أهل بيت النبوّة**

**Mələklər (s.a)** ***"Ey ev əhli! Allahın rəhməti və bərəkəti sizin üzərinizdə olsun!" (Hud, 73)*** **deyərkən, məhz buna işarə edirdilər. Onlar demək istəyirdilər ki, bu və bu kimi şeylər yenilməz qüvvət sahibi olan Rəbbin sizə layiq gördüyü şeylərdəndir və O, bununla məxsusi olaraq sizi xeyirlə mükafatlandırır, ey Peyğəmbərin əhli-beyti (ailəsi).**[130]

Burada İbrahim Peyğəmbərin ailəsinə mələklər tərəfindən "Əhli-beyt" olaraq xitab edilir. Onlar da öz ümmətlərinin peyğəmbər ailəsi idilər.

Əl-Hafiz İbn Kəsir (ö.774 h.q.) Davud Peyğəmbərin ailəsi barədə rəvayət qeyd edir:

**وروي عنه أيضا أنه قال: وقف سائل على باب داود عليه السلام، فقال: يا أهل بيت النبوة تصدقوا علينا بشئ رزقكم الله**

**Həmçinin, ondan rəvayət edilmişdir ki, buyurdu: "Davudun qapısının ağzında bir dilənçi dayandı və dedi: "Ey Peyğəmbər Əhli-beyti (ailəsi)! Allahın sənə bağışladığı şeylərdən bizə də bir şey ver."**[131]

---

[128] İbn Həcər əl-Əsqəlani, Fəthul-bari şərh Səhihul-Buxari, c.2, s.413
[129] Əbül-Əla əl-Mubarəkfuri, Tuhfətul-əhvazi bi şərh Camiut-Tirmizi, c.5, s.288
[130] Mahmud ibn Ömər əz-Zəməxşəri, əl-Kəşşaf, c.2, s.411
[131] İbn Kəsir əd-Diməşqi, əl-Bidayə vən-nihayə, c.9, s.326





Göründüyü kimi, Peyğəmbər ailələri öz ümmətləri arasında xüsusi mövqeyə malik olublar. Məsələn, Allah aşağıdakı ayələrdə bu məqamların ikisi barədə bizə xəbər verir:

إن الله اصطفى آدم ونوحا وآل إبراهيم وآل عمران على العالمين ذرية بعضها من بعض والله سميع عليم

**Allah Adəmi, Nuhu, İbrahimin nəslini və İmranın nəslini seçib aləmlərdən üstün etdi. Onlar biri digərindən törəmiş bir nəsil idilər. Allah eşidəndir, biləndir![132]**

Burada iki həlledici məqam var:

İbrahim və İmranın ailələri bütün aləmlərdən üstün qərar verilmişdi. Bu o deməkdir ki, həmin ailələr onlar (aləmlər) üzərində rəhbərlik və hakimiyyət edə bilərlər. Buna görə də təbii olaraq, bütün rəhbərlər onlardan olmalıdır.

Peyğəmbər ailələrinin üzvləri biri digərindən törəmiş bir nəsildirlər. Nəticədə, peyğəmbər nəslindən kənar olan heç bir kəs heç vaxt onun seçilmiş ailəsi ola bilməz.

Nuh və İbrahim peyğəmbərin ailələrinə gəldikdə, Allah onları necə seçdiyini bizə xəbər verir:

ولقد أرسلنا نوحا وإبراهيم وجعلنا في ذريتهما النبوة والكتاب فمنهم مهتد وكثير منهم فاسقون

**Biz Nuhu və İbrahimi göndərdik, peyğəmbərliyi və Kitabı onların nəslinə nəsib etdik. Onların bir qismi doğru yoldadır, çoxu isə fasiqlərdir.**

**And olsun ki, Biz Nuhu və İbrahimi (peyğəmbər) göndərdik, peyğəmbərliyi və kitabı (Tövratı, Zəburu, İncili və Quranı) onların nəslinə verdik. Onların bir qismi doğru yoldadır, çoxu isə fasiqlərdir.[133]**

Əl-Hafiz İbn Kəsir bu ayəni izah edərkən yazır:

**وقال فيه وفي إبراهيم (وجعلنا في ذريتهما النبوة والكتاب) [الحديد: 26] أي كل نبي من بعد نوح فمن ذريته. وكذلك إبراهيم**

**Allah onun (Nuhun) və İbrahimin barəsində buyurur: *"peyğəmbərliyi və kitabı (Tövratı, Zəburu, İncili və Quranı) onların nəslinə verdik" (Hədid, 26)*, yəni: Nuhdan sonra gələn bütün peyğəmbərlər onun nəslindən idilər. Eynilə İbrahimdə də bu cürdür.[134]**

İmam ət-Təbəri (ö.310 h.q.) yazır:

**{وجعلنا في ذريتهما النبوة والكتاب} وكذلك كانت النبوة في ذريتهما، وعليهم أنزلت الكتب: التوراة، والإنجيل، والزبور، والفرقان، وسائر الكتب المعروفة**

[132] Ali-İmran, 3:33-34
[133] Hədid, 57:26
[134] İbn Kəsir əd-Diməşqi, əl-Bidayə vən-nihayə, c.1, s.120





*"Peyğəmbərliyi və Kitabı onların nəslinə nəsib etdik"*: **eynilə, peyğəmbərlik də onların nəslindən idi və Tövrat, İncil, Zəbur, Furqan və sair bilinən kitablar da onlara nazil olmuşdur.**[135]

İbrahim Peyğəmbər barəsində Qurani-Kərimdə buyurulur:

**ووهبنا له إسحاق ويعقوب وجعلنا في ذريته النبوة والكتاب وآتيناه أجره في الدنيا وإنه في الآخرة لمن الصالحين**

**Biz ona (İbrahimə) İshaqı və Yəqubu bəxş etdik, peyğəmbərliyi və kitabı onun nəslinə əta etdik, dünyada onun mükafatını verdik. O, axirətdə də mütləq (yüksək dərəcələrə layiq) salehlərdən olacaqdır!**[136]

Əl-Hafiz İbn Kəsir bu ayə barədə deyir:

**{وجعلنا في ذريته النبوة والكتاب...} وجعل في ذريته النبوة والكتاب فكل نبي بعث بعده فهو من ذريته وكل كتاب نزل من السماء على نبي من الانبياء من بعده فعلى أحد نسله وعقبه**

***"Peyğəmbərliyi və kitabı onun nəslinə əta etdik"...* Allah peyğəmbərliyi və Kitabı onun nəslinə əta etdi. Odur ki, daha sonra göndərilən bütün peyğəmbərlər onun nəslindən olmuşlar. Həmçinin, ondan sonra peyğəmbərlərə göndərilən bütün səmavi kitablar məhz onun nəslindən və zürriyətindən olan şəxslərə göndərilmişdir.**[137]

Əlbəttə ki, məlum məsələdir. Nuh ailəsindən başqa heç kəs ümmətin üzərində hakimiyyət və rəhbərliyə layiq görülməmişdir. Allah-Taala onu və ailəsini aləmlərindən üstün etmişdir. Deməli, bütün rəsullar, nəbilər, rəhbərlər və idarəçilər təbii olaraq, onlardan olmalıdır. Eyni şey İbrahimin də ailəsinə aiddir. Onun ailəsi Allahın əmriylə digərlərindən üstün seçilmişdi. Ona görə də onun bütün davamçıları və bəşəriyyətin ondan sonrakı bütün rəhbərləri onun nəslindən, ailəsindən idilər.

Bu proses özü ilk peyğəmbər olan Hz.Adəmdən (ə) başlamışdır:

**أولئك الذين أنعم الله عليهم من النبيين من ذرية آدم...**

**Bunlar Adəmin nəslindən... seçib haqq yola yönəltdiyimiz və Allahın nemət bəxş etdiyi peyğəmbərlərdəndir.**[138]

Məntiqə uyğun olaraq, Hz.Adəmin (ə) xəlifələri onun övladlarından olacaqdı. Peyğəmbərlik xətti Hz.Adəmin nəslindən davam etmişdir. Daha sonra, Hz.Nuh (ə) Allahın əmrilə bütün yaradılmışlardan üstün qərar verilən yeni xanədanın əsasını qoymuş və sonrakı peyğəmbərlər məhz onun nəslindən davam etmişdir. Hz.İbrahim

---

[135] Muhəmməd ibn Cərir ət-Təbəri, Camiul-bəyan fi təvilul-Quran, c.27, s.308
[136] Ənkəbut, 29:27
[137] İbn Kəsir əd-Diməşqi, əl-Bidayə vən-nihayə, c.1, s.172
[138] Məryəm, 19: 58





(ə) özü Hz.Nuhun (ə) nəslindən idi və o da aləmlər üzərində ən üstün seçilmiş yeni xanədanın əsasını qoymuş və sonrakı peyğəmbərlər təbii olaraq, onun nəslindən çıxmışlar.

Bununla belə, İbrahim ailəsinin bəzi kiçik qolları olmuşdur. Bunlardan biri onun nəvəsi İsrail adı ilə də tanınan Hz.Yaqub (ə) xətti ilə başlamışdır. Allah-Taala bu barədə belə buyurur:

**ولقد آتينا بني إسرائيل الكتاب والحكم والنبوة ورزقناهم من الطيبات وفضلناهم على العالمين**

**And olsun ki, Biz İsrail oğullarına Kitab, hökm (hikmət, hökmranlıq) və peyğəmbərlik əta etmiş, onlara pak nemətlərdən ruzi vermiş və onları aləmlərdən üstün etmişdik.**[139]

Eynilə də Hz.Musa (ə) və Hz.Harunun (ə) ailələrinin Hz.İbrahimin (ə) nəslindən olduğunu oxuyuruq:

**وقال لهم نبيهم إن آية ملكه أن يأتيكم التابوت فيه سكينة من ربكم وبقية مما ترك آل موسى وآل هارون تحمله الملائكة**

**(İsrail övladının) peyğəmbəri onlara dedi: "(Talutun) padşahlıq əlaməti (Musaya verilən) sandığın sizə gəlməsidir. Onun içində (sizin üçün) Rəbbinizdən bir arxayınlıq, rahatlıq, həmçinin Musa və Harun nəslindən qalan şeylər vardır. Onu mələklər gətirəcək. Əgər siz möminsinizsə, bu sizin üçün bir dəlildir".**[140]

Bu ayə Musa və Harun ailəsinin yüksək mənəvi məqamını göstərir. Onların yadigarları bir sandıqda qorunmuş və mələklər tərəfindən saxlanmışdır. Buradan belə bir nəticəyə gəlmək olar ki, bu ailələrin nümayəndələri də yüksək məqamlı peyğəmbərlər, yaxud ən azı bəziləri Allahın böyük övliyalarından olmuşlar. Əks təqdirdə, mələklər onların əmanətlərinin saxlanmasında hər hansı bir rola malik olmazdılar.

Bundan əlavə, Talutun müqəddəs səltənətinin dəlili qismində bu əmanətlərin mələklər tərəfindən İsrail övladlarına gətirilməsi əmr edilmişdir. Təkcə bu fakt İsrail övladlarının Musa və Harun ailəsinə ali dərəcədə hörmət bəslədiklərini və yəqin ki, onları özlərinə rəhbər hesab etdiklərini sübut etməyə kifayət edir.

Davud ailəsi də İbrahim zürriyyətinin digər bir qoludur. Allah-Taala buyurur:

**آل داوود شكرا وقليل من عبادي الشكور**

[139] Casiyə, 45:16
[140] Bəqərə, 2:248





**Siz, ey Davud ailəsi! (Allaha) şükranlıqla itaət edin! (Bu nemətə şükür edin!) Bəndələrimdən (nemətlərimə) şükür edəni azdır![141]**

Bu xəttin başçısı olan Davud həm peyğəmbər, həm də hökmdar idi. Ona özü kimi peyğəmbər və hökmdar olan oğlu Süleyman varis oldu.

İbrahim ailəsinin qollarından daha ikisi barədə əl-Buxarinin (ö.256 h.q.) kitabından oxuyuruq:

**{إن الله اصطفى آدم ونوحا وآل إبراهيم وآل عمران على العالمين - إلى قوله - يرزق من يشاء بغير حساب} قال ابن عباس {وآل عمران} المؤمنون من آل إبراهيم وآل عمران وآل ياسين وآل محمد صلى الله عليه و سلم يقول {إن أولى الناس بإبراهيم للذين اتبعوه} وهم المؤمنون.**

**[Allah Adəmi, Nuhu, İbrahimin ailəsini və İmranın ailəsini seçib aləmlərdən üstün etdi... (Ali-İmran, 33), Allah istədiyi kəsə saysız-hesabsız ruzi verər. (Bəqərə, 212)]. İbn Abbas dedi: "və İbrahimin ailəsini": Onlar İbrahimin, İmranın, Yasinin və Muhəmmədin (s) ailəsindən olan möminlərdir. Allah buyurur: "Şübhəsiz ki, insanlardan İbrahimə ən yaxın olanı onun ardınca gedənlərdir." (Ali-İmran, 68): onlar möminlərdir.[142]**

Professor İbn Yasin yazır:

**{إن الله اصطفى آدم ونوحا وآل إبراهيم وآل عمران على العالمين}**

**أخرج الطبري وابن أبي حاتم بسنديهما الحسن عن علي بن أبي طلحة عن ابن عباس قال: هم المؤمنون من آل إبراهيم وآل عمران: آل ياسين وآل محمد يقول الله عز وجل (إن أولى الناس بإبراهيم للذين اتبعوه.)**

***[Allah Adəmi, Nuhu, İbrahimin ailəsini və İmranın ailəsini seçib aləmlərdən üstün etdi... (Ali-İmran, 33)].***

**Ət-Təbəri və İbn Əbi Hatim həsən sənədlə Əli ibn Əbi Təlhədən, o da İbn Abbasdan onun belə dediyini rəvayət edirlər: Onlar İbrahimin, İmranın, Yasinin və Muhəmmədin (s) ailəsindən olan möminlərdir. Allah buyurur: *"Şübhəsiz ki, insanlardan İbrahimə ən yaxın olanı onun ardınca gedənlərdir." (Ali-İmran, 68)*.[143]**

İbn Abbasdan etibarlı sənədlə nəql edildiyinə görə, Hz.Muhəmməd (s) ailəsi aşağıdakı ayədə qeyd olunan İbrahim ailəsindəndir.

**إن الله اصطفى آدم ونوحا وآل إبراهيم وآل عمران على العالمين ذرية بعضها من بعض والله سميع عليم**

**Allah Adəmi, Nuhu, İbrahimin ailəsini və İmranın ailəsini seçib aləmlərdən üstün etdi. Onlar biri digərindən törəmiş bir nəsil idilər. Allah eşidəndir, biləndir![144]**

---

[141] Səba, 34:13
[142] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.3, s.1263
[143] Dr. Hikmət ibn Bəşir ibn Yasin, ət-Təfsirus-səhih, c.1, s.411
[144] Ali-İmran, 3:33-34





Əslində, Muhəmməd ailəsi ümmətimiz arasında İbrahim ailəsininə daxil olan yeganə ailədir. İbn Abbas başqa heç kimi qeyd etməyib. Beləliklə, bu ayədən anlayırıq ki:

Hz.Muhəmməd (s) ailəsi Allah tərəfindən bütün yaradılışların ən üstünü seçilmişdir.

Hz.Muhəmməd (s) ailəsi biri digərindən törəmiş nəsildirlər. Ona görə də Muhəmməd nəslindən olmayan kəs avtomatik olaraq Allah tərəfindən xaric edilir.

Ayənin mənası budur ki, Muhəmməd ailəsindən olanlardan başqa heç kim qanuni şəkildə onlar üzərində rəhbərlik və idarəçilik edə bilməz. Bundan əlavə, ümmətin bütün rəhbərləri və idarəçiləri hər zaman onlardan olmalıdır. Bu yolla rəhbər həm onlar üzərində, həm də digərləri üzərində hakimiyyəti həyata keçirə biləcək.





Ümmətimiz arasındakı Hz.Muhəmmədin (s) ailəsi əsasən, İbrahim (ə) ailəsinin öz ümməti arasındakı vəziyyətini əks etdirir. Bu başlıca məsələ açıq-aşkar əhli-sünnənin mötəbər hədislərində öz əksini tapmışdır. Məsələn, İmam əl-Buxari (ö.256 h.q.) yazır:

**حدثنا قيس بن حفص وموسى بن إسماعيل قالا حدثنا عبد الواحد بن زياد حدثنا أبو قرة مسلم بن سالم الهمذاني قال حدثني عبد الله ابن عيسى سمع عبد الرحمن بن أبي ليلى قال : لقيني كعب بن عجرة فقال ألا أهدي لك هدية سمعتها من النبي صلى الله عليه و سل؟ فقلت بلى فأهدها لي فقال سألنا رسول الله صلى الله عليه و سلم فقلنا يا رسول الله كيف الصلاة عليكم أهل البيت فإن الله قد علمنا كيف نسلم عليكم؟ قال قولوا اللهم صل على محمد وعلى آل محمد كما صليت على إبراهيم وعلى آل إبراهيم إنك حميد مجيد اللهم بارك على محمد وعلى آل محمد كما باركت على إبراهيم وعلى آل إبراهيم إنك حميد مجيد**

**Qeys ibn Həfs və Musa ibn İsmayıl - Əbdül-Vahid ibn Ziyad - Əbu Qurra Müslim ibn Səlim əl-Həmzani - Abdullah ibn İsa - Əbdür-Rəhman ibn Əbi Leyla sənədilə onun belə dediyini rəvayət edirlər:**

**Kəb ibn Ucrə qarşıma çıxdı və dedi: "Peyğəmbərdən (s) eşitdiyim hədiyyəni sənə hədiyyə edimmi?" O dedi: "Bəli, onu mənə hədiyyə et". Kəb dedi: "Biz Allah Rəsulundan (s) soruşduq: "Ey Allahın Rəsulu, siz Əhli-beytə necə salavat göndərək? Belə ki, Allah bizə yalnız salam göndərməyi öyrədib." Buyurdu: "De: Allahummə salli alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma səlləytə əla İbrahimə və alə Ali-İbrahim, innəkə həmidun məcidun. Allahummə barik alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma barəktə alə İbrahimə və alə Ali-İbrahim, innəkə həmidun məcidun.[145]"[146]**

Bu mövzuda hədislərin mütəvatir versiyası məhz yuxarıda qeyd etdiyimiz hədisdir. Bu barədə araşdırma aparan hər bir kəs sözümüzü təsdiq edə bilər.[147] Bir neçə şazz[148] rəvayət də var ki, mətnində "Ali-Muhəmməd" sözləri ya çıxarılıb, ya da başqa sözlə əvəz edilib. Hər halda bu cür qərib hədislər heç bir halda mütəvatir hədisə zərər verə bilməz.

Əl-Buxari həmçinin yazır:

---

[145] Tərcüməsi: Allahım! İbrahimə və İbrahimin ailəsinə salavat göndərdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də salavat göndər! Şübhəsiz ki, Sən Tərifəlayiqsən, Şan-şöhrətlisən! Allahım! İbrahimə və İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Şübhəsiz ki, Sən Tərifəlayiqsən, Şan-şöhrətlisən!

[146] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.3, s.1233, №3190

[147] Bax: əl-Qazi Əbu İshaq İsmayıl ibn İshaq ibn İsmayıl ibn Həmmad ibn Zeyd əl-Əzdi əl-Bəsri əl-Bağdadi əl-Maliki əl-Cəhdəmi, Fəzl səlat ələn-Nəbi, s.55-68. Əl-Qazi Əbu İshaq bu kitabında Kəb ibn Ucrə, Uqbə ibn Əmr, Abdullah ibn Ömər, Əbu Məsud əl-Ənsari, İbrahim, əl-Həsən, Əbu Səid əl-Xudri, Təlhə, Zeyd ibn Xaricə, Əbdür-Rəhman ibn Bişr ibn Məsud və Fatimə bint Muhəmməddən (ə) "Ali-Muhəmməd" sözləri qeyd edilmiş bir neçə hədis qeyd etmişdir. Bundan əlavə, İbn Əsakir əş-Şafei özünün "Tarixu-mədinəti-Diməşq" əsəridə bu hədisi Aişə (c.53, s.309), Ənəs ibn Malik (c.48, s.316), əl-Hüseyn ibn Əli (c.18, s.87) və Ümmü Sələmədən (c.14, s.141) nəql etmişdir. Bu isə hədisin mütləq təvatür həddinə çatmasına lazım olan miqdardan da artıqdır. "Ali-Muhəmməd" sözləri çıxarılmış, yaxud başqa sözlə əvəz edilmiş şazz hədislər isə nəinki təvatür həddinə çatmaq, heç ona yaxınlaşmayıblar. Ona görə də mütəvatir hədisi əvəz etmək qüdrətinə sahib deyillər.

[148] Şazz: Bu kəlmə ərəbcə «şəzzə» felinin məlum növündən əmələ gəlmiş feli sifətdir. Bu da tək-tənha, yana çəkilmiş mənaları ifadə edir. İstilahi mənada isə - rəvayəti məqbul [«səhih», yaxud «həsən»] sayılan ravinin özündən də nüfuzlu raviyə müxalif olaraq rəvayət etdiyi hədis şazz adlanır.





**حدثنا آدم حدثنا شعبة حدثنا الحكم قال سمعت عبد الرحمن بن أبي ليلى قال : لقيني كعب بن عجرة فقال ألا أهدي لك هدية؟ إن النبي صلى الله عليه و سلم خرج علينا فقلنا يا رسول الله قد علمنا كيف نسلم عليك فكيف نصلي عليك؟ قال قولوا اللهم صل على محمد وعلى آل محمد كما صليت على آل إبراهيم إنك حميد مجيد .اللهم بارك على محمد وعلى آل محمد كما باركت على آل إبراهيم إنك حميد مجيد**

**Adəm - Şöbə - əl-Həkəm - Əbdür-Rəhman ibn Əbi Leyla:**

**Kəb ibn Ucrə qarşıma çıxdı və dedi: "Sənə hədiyyə edimmi? Allah Rəsulu (s) yanımıza gəldi və biz ondan soruşduq: Ey Allahın Rəsulu, biz sənə salam göndərməyi bilirik, bəs necə salavat göndərək?" Buyurdu: "De: Allahummə salli alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma səlləytə əla İbrahimə və alə Ali-İbrahim, innəkə həmidun məcidun. Allahummə barik alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma barəktə alə İbrahimə və alə Ali-İbrahim, innəkə həmidun məcidun."[149]**

Başqa bir yerdə yazır:

**حدثني سعيد بن يحيى حدثنا أبي حدثنا مسعر عن الحكم عن ابن أبي ليلى عن كعب بن عجرة رضي الله عنه قيل :يا رسول الله أما السلام عليك فقد عرفناه فكيف الصلاة ؟ قال قولوا اللهم صل على محمد وعلى آل محمد كما صليت على إبراهيم إنك حميد مجيد اللهم بارك على محمد وعلى آل محمد كما باركت على إبراهيم إنك حميد مجيد**

**Səid ibn Yəhya - atası (Yəhya) - Məsar - əl-Həkəm - İbn Əbi Leyla - Kəb ibn Ucrə (r.a):**

**(Peyğəmbərə) dedilər: "Ey Allahın Rəsulu, biz sənə salam göndərməyi bilirik, bəs necə salavat göndərək?" Buyurdu: "De: Allahummə salli alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma səlləytə alə Ali-İbrahim, innəkə həmidun məcidun, Allahummə barik alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma barəktə alə Ali-İbrahim, innəkə həmidun məcidun."[150]**

İmam Müslim (ö.261 h.q.) yazır:

**حدثنا يحيى بن يحيى التميمي قال قرأت على مالك عن نعيم بن عبدالله المجمر أن محمد بن عبدالله بن زيد الأنصاري (وعبدالله بن زيد هو الذي كان أري النداء بالصلاة) أخبره عن أبي مسعود الأنصاري قال أتانا رسول الله صلى الله عليه و سلم ونحن في مجلس سعد بن عبادة فقال له بشير بن سعد أمرنا الله تعالى أن نصلي عليك يا رسول الله فكيف نصلي عليك ؟ قال فسكت رسول الله صلى الله عليه و سلم حتى تمنينا أنه لم يسأله ثم قال رسول الله صلى الله عليه و سلم قولوا اللهم صل على محمد وعلى آل محمد كما صليت على آل إبراهيم وبارك على محمد وعلى آل محمد كما باركت على آل إبراهيم في العالمين إنك حميد مجيد والسلام كما قد علمتم**

**Yəhya ibn Yəhya ət-Təmimi - Malik - Nueym ibn Abdullah əl-Mucmər - Muhəmməd ibn Abdullah ibn Zeyd əl-Ənsari - Əbu Məsud əl-Ənsari:**

**Biz Səd ibn Ubadənin məclisində ikən Allah Rəsulu (s) yanımıza gəldi. Bəşir ibn Səd dedi: "Ey Allahın Rəsulu, Allah sənə salavat göndərməyi bizə əmr edib. Bəs sənə necə salavat göndərək?" Allah Rəsulu (s) o qədər sükut etdi ki, biz "kaş o bu sualı verməzdi" - deyə təmənna**

[149] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.5, s.2338, №5996
[150] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.4, s.1802, №4519





**etdik. Daha sonra Allah Rəsulu (s) buyurdu: "De: "Allahummə salli alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma səlləytə alə Ali-İbrahim və barik alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma barəktə alə Ali-İbrahim fil-aləmin innəkə həmidun məcidun."[151] Salam isə bildiyiniz kimidir.[152]**

Eynilə də İmam Əhmədin (ö.241 h.q.) "əl-Müsnəd"ində rəvayət edilir:

**حدثنا عبد الله حدثني أبي حدثنا عثمان بن عمر انا مالك عن نعيم المجمر عن محمد يعني بن عبد الله عن أبي مسعود قال قيل يا رسول الله كيف نصلي عليك فقال قولوا اللهم صل على محمد وعلى آل محمد وبارك على محمد وعلى آل محمد كما باركت على إبراهيم في العالمين انك حميد مجيد**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Osman ibn Ömər - Malik - Nueym əl-Mucmər - Muhəmməd ibn Abdullah - Əbu Məsud:**

**(Peyğəmbərə) dedilər: "Ey Allahın Rəsulu, sənə necə salavat göndərək?" Buyurdu: "De: Allahummə salli alə Muhəmmədin və alə Ali-Muhəmməd və barik alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma barəktə alə Ali-İbrahim fil-aləmin, innəkə həmidun məcidun."[153]**

Şeyx əl-Ərnaut yazır:

**إسناده صحيح على شرط مسلم**

**Sənədi Müslimin şərtlərinə əsasən səhihdir.[154]**

Burada xüsusi vurğulanmalı bir neçə məsələ var. Birincisi, Kəb ibn Ucrə Allah Rəsuluna (s) belə deyir:

**يا رسول الله كيف الصلاة عليكم أهل البيت فإن الله قد علمنا كيف نسلم عليكم**

**Ey Allahın Rəsulu, siz Əhli-beytə necə salavat göndərək? Belə ki, Allah bizə yalnız salam göndərməyi öyrədib."**

Buradan məlum olur ki, səhabələr Əhli-beytə salam göndərirdilər və bunu onlara məhz Allah özü öyrətmşdi. Əhli-beytin (ə) kişi üzvünə salam göndərmək bir neçə cür; məsələn, "əleyhis-səlam", "salamullahi əleyhi" və ya onların adlarından sonra tərkibində "salam" sözü olan başqa ifadələr vasitəsilə ola bilər.

Kəbin dediyinə əsasən, səhabələr belə edərdilər. Klassik əhli-sünnə alimlərindən bəziləri də bir çox hallarda belə edirdilər. Bu barədə onların kitablarından xeyli sayda

---

[151] Tərcüməsi: Allahım! İbrahimə və İbrahimin ailəsinə salavat göndərdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də salavat göndər! Şübhəsiz ki, Sən Tərifəlayiqsən, Şan-şöhrətlisən! Allahım! İbrahimin ailəsinə aləmlər içində bərəkət verdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Şübhəsiz ki, Sən Tərifəlayiqsən, Şan-şöhrətlisən!

[152] Müslim ibn əl-Həccac, əs-Səhih, c.1, s.305, №405 (65)

[153] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.4, s.118, №17108

[154] Həmin mənbə





misal gətirmək olar. Lakin biz ixtisara riayət etmək üçün sadəcə "əs-Səhihül-Buxari"dən bir neçə nümunə qeyd edəcəyik.

Əmirəlmöminin (ə) barədə İmam əl-Buxari yazır:

**قال علي عليه السلام الذاريات الرياح**

**Əli (əleyhissəlam) dedi: "əl-Zariyat küləklərdir."[155]**

Onun həyat yoldaşı, Allah Rəsulunun (s) qızı xanım Fatimə (s.ə) barədə isə yazır:

**فقالت فاطمة عليها السلام....**

**Fatimə (əleyhəs-səlam) dedi: ....[156]**

İmam Həsən (ə) barədə də vəziyyət eynidir:

**ووهب الحسن بن علي عليهما السلام لرجل دينه**

**Həsən ibn Əli (əleyhiməs-səlam) bir kişinin borcunu bağışladı.[157]**

Kərbəla şəhidi İmam Hüseynə (ə) də əl-Buxari tərəfindən eyni cür münasibət bəslənmişdir:

**حسين بن علي عليهما السلام أخبره**

**Hüseyn ibn Əli (əleyhiməs-səlam) ona xəbər verdi[158]**

Həmçinin yazır:

**أتي عبيد الله بن زياد برأس الحسين بن علي عليه السلام**

**Hüseyn ibn Əlinin (əleyhis-səlam) başı Ubeydullah ibn Ziyada gətirildi.[159]**

Əl-Buxari hətta İmam Zeynül-Abidini də bu cərgədən çıxarmamışdı:

**وقال علي بن الحسين عليهما السلام....**

**Əli ibn əl-Hüseyn (əleyhiməs-səlam) dedi...[160]**

Çox təəssüf ki, bu sünnə bir çox müasir əhli-sünnə alimi tərəfindən gözardı edilir. Bu işi sadəcə şiələr diri saxlamışdır. Allah ümmətimizi haqq üzrə qərar versin.

İkincisi, Peyğəmbərə salavat elə Əhli-beytə salavatdır. Səhabənin bu sözlərinə diqqət yetirin:

**يا رسول الله كيف الصلاة عليكم أهل البيت**

**Ey Allahın Rəsulu, siz Əhli-beytə necə salavat göndərək?**

Yaxud:

155 Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.4, s.1836
156 Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.4, s.1619, №4193
157 Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.2, s.918
158 Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.3, s.1125, №2925 and c.6, s.2716, №7027
159 Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.3, s.1370, №3538
160 Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.5, s.1959





**يا رسول الله قد علمنا كيف نسلم عليك فكيف نصلي عليك**

**Ey Allahın Rəsulu, biz sənə salam göndərməyi bilirik, bəs necə səlavat göndərək?**

Hər iki suala Allah Rəsulu (s) eyni cür cavab vermişdir. Əgər Peyğəmbərə yaxud Əhli-beytə salavat göndərmək istəyirsinizsə, onların ikisini də birlikdə qeyd etməlisiniz. Əllamə əl-Əlbani (ö. 1420 h.q.) də sözlərimizi təsdiq edir:

**قد علمت مما سبق أن صيغ الصلاة على النبي صلى الله عليه وسلم فيها كلها الصلاة على أهل بيته صلى الله عليه وسلم وآله؛ ولذلك فلا ينبغي الاكتفاء بالصلاة عليه صلى الله عليه وسلم وحده، بل لا بد من إضافة الآل إليه، بل لا بد من إتمام الصيغة من أولها إلى آخرها؛ كما وردت؛ تقيُّداً بقوله صلى الله عليه وسلم: "قولوا: اللهم! صل على محمد، وعلى آل محمد ... " إلخ، حين سألوه عن كيفية الصلاة عليه صلى الله عليه وسلم.**

**Əvvəlki bəhslərimizdən bildiyiniz kimi, Peyğəmbərə (s) göndərilən salavatın bütün qaydalarında onun Əhli-beyti və ailəsi qeyd edilir. Ona görə də ona tək halda salavat göndərmək düz deyil. Belə ki, ailəsini də bura əlavə etmək lazımdır. Əslində (salavat) tam şəkildə əvvəldən sonadək deyilməlidir, Çünki hədisdə Allah Rəsulundan (s) ona salavat göndərməyin qaydası barədə soruşulduqda, buyurdu: Deyin, "Allahummə salli alə Muhəmmədin və alə Ali-Muhəmməd və barik alə Muhəmmədin və alə Ali-Muhəmməd..."[161]**

Maraqlıdır ki, heç Əllamənin özü bu dediklərinə riayət etmir.[162] Bu da əhli-sünnə arasında vəziyyətin necə bərbad olduğunu əks etdirir. Bu mövzuda əhli-sünnə öz çıxardıqları bidətlərə riayət etdikləri halda, şiələr Peyğəmbər sünnəsini qoruyur. Şiələr, xüsusən kitablarda, yazılarda və danışıqlarda Peyğəmbərə salavat göndərərkən "sallallahu əleyhi və alihi" (Allahın salavatı olsun ona və ailəsinə) deyirlər.

Əhli-sünnə isə adətən "və alihi" ifadəsini işlətmir. Hətta bəziləri sünnəyə müxalifət etməkdə o qədər irəli gedirlər ki, öz bidətlərinə haqq qazandırmağa da çalışırlar. Baxın, Əllamə əl-Əlbani nə deyir:

**وإن من غرائب هذا العصر أن يتجرأ بعض الناس على إنكار ما ثبت عنه صلى الله عليه وسلم من طرق مستفيضة صحيحة؛ ألا وهو الصلاة على النبي صلى الله عليه وسلم وعلى آله معاً، مع اطلاعه ووقوفه عليها في كتب السنة {عن جمع من الصحابة؛ منهم كعب بن عجرة، وأبو حميد الساعدي، وأبو سعيد الخدري، وأبو مسعود الأنصاري، وأبو هريرة، وطلحة ابن عبيد الله، وفي أحاديثهم أنهم سألوا النبي صلى الله عليه وسلم: " كيف نصلي عليك؟"، فعلمهم صلى الله عليه وسلم هذه**

---

[161] Nasiruddin əl-Əlbani, Əslu sifatu səlatun-nəbi, c.3, s.933

[162] Bunun mümkün izahı ondan ibarətdir ki, əl-Əlbani dediklərini gündəlik vacib namazlarda təşəhhüddə deyilən salavata aid edib. Yazdığı hər bir söz məhz bu barədədir. Halbuki, onun istinad etdiyi hədislər ümumi xarakter daşıyır. Səhabələr Allah Rəsulundan (s) sadəcə təşəhhüddə salavatın qaydası barədə soruşmurdular. Onlar açıq-aşkar "salavat ayəsi"nə istinad etməklə, bütün hallar üçün salavatın qaydasını öyrənmək istəyirdilər. Belə ki, həmin ayə özü də ümumi xarakterə malikdir. Əgər Əllamə əl-Əlbani həqiqətən də səhabələrin sualından sadəcə təşəhhüddəki salavatı soruşduqlarını anlayıbsa, deməli həqiqətən də onun ciddi dərketmə problemləri olmuşdur.





الصيغ}، ألا وهو: الأستاذ محمد إسعاف النشاشيبي في كتابه "الإسلام الصحيح" (ص 177 - 189)، وحجته في ذلك أن الآية: {يا أيها الذين آمنوا صلوا عليه وسلموا تسليما}؛ لم يُذكر فيها غيرَ النبي صلى الله عليه وسلم أحدٌ. وبناء على ذلك رد الأحاديث الصحيحة كلها

**Dövrümüzün qəribəliklərindən biri də bəzi insanların Peyğəmbərdən (s) müstəfiz həddə səhih sənədlərlərlə sübuta yetirilmiş bir hədisə qarşı cürət edərək onu inkar etmələridir. Agah ol ki, bu Peyğəmbərə və onun ailəsinə birlikdə salavat göndərmək barədə olan hədislərdir. Halbuki həmin insanlar bu hədislərin sünnə kitablarında olduğundan xəbərdardırlar. Aralarında Kəb ibn Ucrə, Əbu Həmid əs-Sədi, Əbu Səid əl-Xudri, Əbu Məsud əl-Ənsari, Əbu Hureyrə və Təlhə ibn Ubeydullah olan bir qrup səhabənin hədislərində deyilir ki, onlar Peyğəmbərə sual verdilər: "Sənə necə salavat göndərək?" O da onlara qaydasını öyrətdi.**

**Həmin (inkarçı) şəxs Professor Muhəmməd İsaf əl-Nəşaşibi özünün "əl-İslamus-səhih" ("Doğru İslam") kitabının 177-189-cu səhifələrində (bu iddianı irəli sürür) və dəlili də budur ki, *"Ey iman gətirənlər! Siz də ona salavat göndərib layiqincə salamlayın!" (Əhzab, 56)* ayəsində Peyğəmbərdən (s) başqa heç kim qeyd edilmir. Buna əsasən də bütün səhih hədisləri inkar edir.[163]**

Bizim acizanə iddiamız bundan ibarətdir ki, bu çirkin mənzərə qərəzli şəkildə yazılmış sünni İslam tarixi tərəfindən Allah Rəsulunun nəslinə qarşı törədilmişdir. Biz burada irəlidə daha geniş söz açacağıq.

Peyğəmbərə salavat göndərən zaman Allaha iki şey üçün dua edirik:

1. İbrahim və onun ailəsinə salavat göndərdiyin kimi Muhəmməd və onun ailəsinə də salavat göndərmək;

2. İbrahim və onun ailəsinə bərəkət verdiyin kimi Muhəmməd və onun ailəsinə də bərəkət vermək;

Yaxşı, bəs Allahın bir kəsə salavat göndərməsi nə deməkdir? Bu sualın cavabını əl-Hafiz İbn Kəsir (ö.774 h.q.) verəcək:

قال البخاري : قال أبو العالية : صلاة الله : ثناؤه عليه عند الملائكة ، وصلاة الملائكة : الدعاء.

**Əl-Buxari dedi: Əbul-Aliyə dedi: Allahın salavatı mələklər arasında onu tərif etməsidir. Mələklərin salavatı isə duadır.[164]**

[163] Nasiruddin əl-Əlbani, Əslu sifatu səlatun-nəbi, c.3, s.934
[164] İbn Kəsir əd-Diməşqi, Təfsirul-Quranil-Əzim, c.6, s.457





Başqa sözlə desək, biz Allaha dua edirik ki, İbrahim və onun ailəsini mələklər arasında tərif etdiyi kimi Muhəmməd və onun ailəsini də tərif etsin. Bəs görəsən Allah İbrahim və onun ailəsini mələklər arasında necə tərif edir? Tədqiqatımızın uzanmaması üçün təkcə Hz.İbrahimlə (ə) kifayətlənəcəyik. Qurani-Kərim onun barəsində buyurur:

**ما كان إبراهيم يهوديا ولا نصرانيا ولكن كان حنيفا مسلما وما كان من المشركين**

**İbrahim nə yəhudi, nə də xaçpərəst idi. O ancaq hənif (batildən haqqa tapınan, haqqa yönəlmiş olan) müsəlman (Allaha təslim olan) idi və (Allaha) şərik qoşanlardan deyildi.**[165]

Bu, Hz.İbrahimin (ə) pak İslam əqidəsinə görə tərifi idi. Allah həmçinin buyurur:

**إن إبراهيم لحليم أواه منيب**

**Həqiqətən, İbrahim həlim xasiyyətli, (həmişə dua edərək) yalvarıb-yaxaran və özünü tamamilə (Allaha) təslim etmiş bir zat idi.**[166]

O cümlədən:

**إن إبراهيم كان أمة قانتا لله حنيفا ولم يك من المشركين شاكرا لأنعمه**

**Həqiqətən, İbrahim Allaha müti, batildən haqqa tapınan bir imam (rəhbər) idi. O heç vaxt müşriklərdən olmamışdı. O, Allahın nemətlərinə şükür edən idi.**[167]

Həmçinin:

**واذكر في الكتاب إبراهيم إنه كان صديقا نبيا**

**Kitabda (Quranda) İbrahimi də yad et (onun hekayətini də ümmətinə söylə). Həqiqətən, o, büsbütün doğru danışan kimsə (siddiq) – bir peyğəmbər idi.**[168]

Və:

**واذكر عبادنا إبراهيم وإسحاق ويعقوب أولي الأيدي والأبصار إنا أخلصناهم بخالصة ذكرى الدار وإنهم عندنا لمن المصطفين الأخيار**

**Qüdrət və bəsirət sahibi olan qullarımız İbrahimi, İshaqı və Yəqubu da yada sal! Biz onları Axirət yurdunu sadiq ürəklə andıqlarına görə seçdik. Həqiqətən, onlar Bizim yanımızda seçilmiş ən yaxşı kimsələrdəndir.**[169]

Nəhayət:

**وإبراهيم الذي وفى**

**Məgər vəfalı olan İbrahimin (səhifələrində olanlar barədə ona bildirilmədi?)**[170]

---

[165] Ali-İmran, 3:67
[166] Hud, 11:75
[167] Nəhl, 16:120-121
[168] Məryəm, 19:41
[169] Sad, 38:45-47





Şübhəsiz ki, bunlar Allahın əzəmətli peyğəmbərinə etdiyi təriflərdən sadəcə bir hissədir. Biz də namazlarımızda Allaha dua edirik ki, eyni sözləri Muhəmməd və onun ailəsi üçün də desin. Əlbəttə ki, Allah hər zaman layiqli şəkildə tərif edir, əsla həddindən artıq söz deməz. Ona görə də əvvəla bu əzəmətli keyfiyyətləri Əhli-beytə verməlidir ki, daha sonra fəzilətlərə çatmalarına yardım etsin. Bütün bunlardan sonra Allah-taala Muhəmməd və onun Əhli-beytini mələklərə tərif edər.

Hz.Muhəmmədin (s) özü və milyonlarla saleh övliyalar da daxil olmaqla, milyardlarla müsəlman hər gün Allaha saysız-hesabsız dualar edirlər ki, Muhəmməd və onun ailəsini tərif etsin. Bu proses Peyğəmbər (s) zamanından başlayaraq 1400 ildən çoxdur davam edir. Üstəlik, bu genişmiqyaslı dua Allahın əmrinə və öyrətdiyi üsluba əsaslanır. Ona görə də heç bir şübhə yoxdur ki, Allah-taala peyğəmbər (s) zamanında bu salavatı qəbul edib, öz peyğəmbərini şərəfləndirməyə davam edib və Qiyamət gününə qədər də bu iş davam edəcək.

Başqa sözlə, Allah-taala Hz.İbrahim və ailəsinə məxsus bütün keyfiyyət və xüsusiyyətləri Hz.Muhəmməd və onun ailəsinə bəxş edib, ən yaxşı əməl və fədakarlıqlara nail olmağa yardım edib, daha sonra isə Öz Ərşində pak məxluqları arasında onları tərif edib.

Salavatın bir hissəsi olaraq, Allahdan Hz.İbrahim və ailəsinə bərəkət verdiyi kimi Hz.Muhəmməd və ailəsinə də bərəkət verməsini istəyirik. Bəlkə də bu, ümumi duanın ən mühüm hissəsidir. Bəs Allah-taala İbrahim və ailəsinə nə kimi bərəkət əta edib? Aşağıdakı ayədə bu barədə danışılır:

**إن الله اصطفى آدم ونوحا وآل إبراهيم وآل عمران على العالمين ذرية بعضها من بعض والله سميع عليم**

**Allah Adəmi, Nuhu, İbrahimin nəslini və İmranın nəslini seçib aləmlərdən üstün etdi.**[171]

Deməli, Allah İbrahim və onun ailəsini seçib aləmlərdən üstün etməklə bərəkət əta etmişdir. Onlar Allahın digər məxluqlarından üstün idilər və özlərindən başqa heç kəs onlara rəhbər ola bilməzdi. Şübhəsiz ki, Allah Muhəmməd və onun ailəsini də

[170] Nəcm, 53:37
[171] Ali-İmran, 3:33





eyni cür bərəkətləndirib. Allah onları seçib aləmlərdən üstün etmiş və özlərindən başqa heç kəs onlara rəhbər ola bilməz.

Həmçinin, Allah-taala buyurur:

فقد آتينا آل إبراهيم الكتاب والحكمة وآتيناهم ملكا عظيما

**Biz İbrahimin nəslinə də Kitab və hikmət bəxş etmiş və onlara böyük bir səltənət vermişdik.** [172]

O cümlədən:

أولئك الذين آتيناهم الكتاب والحكم والنبوة

**Bunlar, Kitab, hikmət və peyğəmbərlik verdiyimiz kəslərdir.**[173]

Və:

ولقد آتينا بني إسرائيل الكتاب والحكم والنبوة ورزقناهم من الطيبات وفضلناهم على العالمين

**And olsun ki, Biz İsrail oğullarına Kitab, hökm (hikmət, hökmranlıq) və peyğəmbərlik əta etmiş, onlara pak nemətlərdən ruzi vermiş və onları aləmlərdən üstün etmişdik.**[174]

Rəbbimiz İbrahim ailəsi arasında bunları cəm etmişdir: peyğəmbərlik, səmavi kitablar, hakimiyyət və hökmdarlıq. Bu müqəddəs ailənin üzvlərindən başqa heç kəs peyğəmbər ola bilməzdi. Bundan əlavə, bunlardan başqa heç kəsə səmavi kitab nazil ola bilməzdi. Bu ailənin içindən çıxan rəhbərdən başqa heç kəs qanuni hakimiyyətə sahib ola bilməzdi. Nəhayət, onlardan başqa heç kəs qanuni hökmdar, rəhbər ola bilməzdi.

Bütün bunlardan başqa, onların ailə üzvləri öz ümmətləri arasında ən üstün şəxslər idilər. Eyni qaydada, Salavat hədisinə müvafiq olaraq, Allah-taala bütün bu bərəkətləri Hz.Muhəmməd ailəsinə də bəxş etmişdir. Onlardan ikisi - peyğəmbərlik və səmavi kitab Allahın əmrinə əsasən sadəcə Hz.Muhəmmədlə məhdudlaşdırılmışdır. Digərləri isə onun ailəsinə də bəxş edilib və qiyamət gününə qədər yalnız onların arasında davam edəcək.

[172] Nisa, 4:54
[173] Ənam, 6:89
[174] Casiyə, 45:16





Allah-taalanın İbrahim və ailəsinə ehsan etdiyi ən böyük bərəkətlərindən biri onları bəşəriyyətə imam təyin etməsidir. Qurani-Kərim bizə bu barədə açıq-aşkar xəbər verir. Məsələn, İbrahim (ə) barədə buyurur:

**وإذ ابتلى إبراهيم ربه بكلمات فأتمهن قال إني جاعلك للناس إماما قال ومن ذريتي قال لا ينال عهدي الظالمين**

**(Ya Rəsulum!) Yadına sal ki, İbrahimi öz Rəbbi bir neçə sözlə (bəzi əmrləri ilə) imtahana çəkdiyi zaman o, bunları tamamilə yerinə yetirdi. (Belə olduqda Allah ona:) “Səni insanlara imam təyin edəcəyəm”, - dedi. (İbrahim isə:) “Nəslimdən necə?” - deyə soruşdu. (Allah onun cavabında:) “(Sənin nəslindən olan) zalımlar mənim əhdimə (imamlığıma) nail olmazlar”, - buyurdu.**[175]

Tez-tez görürük ki, əhli-sünnə qardaşlarımız bu ayədə vurğulanan imaməti nübuvvətlə qarışıq salırlar. Halbuki məsələ tamamilə açıq-aşkardır. Hz.Muhəmməddən başqa hər bir Nəbi, yaxud Rəsul yalnız öz ümmətləri üçün göndərilmişlər. Onların heç biri bütün bəşəriyyətə göndərilməmişdi:

**وما أرسلنا من رسول إلا بلسان قومه ليبين لهم**

**Biz hər bir peyğəmbəri yalnız öz millətinin dilində (danışan) göndərdik ki, (Allahın əmrlərini) onlara izah edə bilsin.**[176]

"əl-Müsnəd"də nəql edilir:

**حدثنا عبد الله حدثني أبي ثنا هشيم أنا سيار عن يزيد الفقير عن جابر بن عبد الله قال قال رسول الله صلى الله عليه و سلم أعطيت خمسا لم يعطهن أحد قبلي بعثت إلى الأحمر والأسود وكان النبي إنما يبعث إلى قومه خاصة وبعثت إلى الناس عامة**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Huşeym - Səyyar - Yəzid əl-Fəqir - Cabir ibn Abdullah:**

**Allah Rəsulu (s) buyurdu: "Mənə daha əvvəllər heç kimə verilməmiş 5 şey əta edildi. Mən həm qırmızılara, həm də qaralara göndərildim. Nəbi yalnız ÖZ QÖVMÜNƏ göndərilərdi, mən isə bütün bəşəriyyətə göndərilmişəm."**[177]

Şeyx əl-Ərnaut yazır:

**إسناده صحيح على شرط الشيخين**

**Sənədi iki şeyxin (Buxari və Müslimin) şərtlərinə əsasən səhihdir.**[178]

İmam Müslim (ö.261 h.q.) isə belə rəvayət edir:

---

[175] Bəqərə, 2:124
[176] İbrahim, 14:4
[177] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.3, s.304, №14303
[178] Həmin mənbə





**حدثنا يحيى بن يحيى أخبرنا هشيم عن سيار عن يزيد الفقير عن جابر بن عبدالله الأنصاري قال قال رسول الله صلى الله عليه و سلم أعطيت خمسا لم يعطهن أحد قبلي كان كل نبي يبعث إلى قومه خاصة وبعثت إلى كل أحمر وأسود**

**Yəhya ibn Yəhya - Huşeym - Səyyar - Yəzid əl-Fəqir - Cabir ibn Abdullah əl-Ənsari:**

**Allah Rəsulu (s) buyurdu: "Mənə daha əvvəllər heç kimə verilməmiş 5 şey əta edildi. Mən həm qırmızılara, həm də qaralara göndərildim. Hər bir nəbi yalnız ÖZ QÖVMÜNƏ göndərilərdi, mən isə hər bir qırmızı və qara şəxsə göndərilmişəm."[179]**

Beləliklə, İbrahim Peyğəmbər nəbi və rəsul olaraq yalnız öz qövmü üçün göndərilmişdi, lakin imam kimi onun vəzifələri öz zamanının bütün bəşər övladını əhatə edirdi.

Təbii ki, "imam" sözündə nəzərdə tutulan mənanın peyğəmbər olduğunu iddia edənlər, İbrahim Xəlilullahın (ə) öz zamanında necə bütün bəşəriyyətə peyğəmbər qərar verildiyini izah etməlidirlər.

Bu ayədə diqqət edilməli bir neçə nöqtə də var:

**وإذ ابتلى إبراهيم ربه بكلمات فأتمهن قال إني جاعلك للناس إماما قال ومن ذريتي قال لا ينال عهدي الظالمين**

**(Ya Rəsulum!) Yadına sal ki, İbrahimi öz Rəbbi bir neçə sözlə (bəzi əmrləri ilə) imtahana çəkdiyi zaman o, bunları tamamilə yerinə yetirdi. (Belə olduqda Allah ona:) “Səni insanlara imam təyin edəcəyəm”, - dedi. (İbrahim isə:) “Nəslimdən necə?” - deyə soruşdu. (Allah onun cavabında:) “(Sənin nəslindən olan) zalımlar mənim əhdimə (imamlığıma) nail olmazlar”, - buyurdu.**

Əvvəla, Allah imaməti Özünün Əhdi adlandırır. Yəni, bu sadəcə Onun işidir. Yalnız özü buna qərar verir və müəyyən edir. Odur ki, imaməti bağışlayan və təyinatları müəyyən edən Allahdır. Bu onların işi deyil. Deməli, onlar bunun üzərində ümumiyyətlə heç bir iradəyə sahib deyil. İkincisi, imamət heç bir zaman zalımlara nəsib olmur. Allah Qiyamətə qədər imaməti heç bir zalıma verməz. Əl-Hafiz İbn Kəsir (ö.774 h.q.) yazır:

**قال الله تعالى : {وإذ ابتلى إبراهيم ربه بكلمات فأتمهن، قال إني جاعلك للناس إماما، قال ومن ذرتي؟ قال لا ينال عهدي الظالمين} لما وفى ما أمره به ربه من التكاليف العظيمة، جعله للناس إماما يقتدون به ويأتمون بهديه .وسأل الله أن تكون هذه الإمامة متصلة بسببه، وباقية في نسبه، وخالدة في عقبه فأجيب إلى ما سأل وسلمت إليه الإمامة بزمام، واستثنى من نيلها الظالمون، واختص بها من ذريته العلماء العاملون.**

[179] Müslim ibn əl-Həccac, əs-Səhih, c.1, s.370, №521 (3)





**Allah-taala buyurur: (Ya Rəsulum!) Yadına sal ki, İbrahimi öz Rəbbi bir neçə sözlə (bəzi əmrləri ilə) imtahana çəkdiyi zaman o, bunları tamamilə yerinə yetirdi. (Belə olduqda Allah ona:) “Səni insanlara imam təyin edəcəyəm”, -dedi. (İbrahim isə:) “Nəslimdən necə?” – deyə soruşdu. (Allah onun cavabında:) “(Sənin nəslindən olan) zalımlar mənim əhdimə (imamlığıma) nail olmazlar”, -buyurdu.**

**O, Rəbbinin ona əmr etdiyi böyük öhdəlikləri yerinə yetirdikdə, Rəbbi onu insanlara onun ardınca getməli olduqları və göstərdiyi yolla getməli olduqları bir imam təyin etdi. O da Allahdan bu imamətin özü ilə əlaqəli olmasını, öz nəsli yolu ilə qırılmaz və əbədi davam etməsini dilədi. Allah da onun bu duasını yerinə yetirdi və ona tam ixtiyarlı imamət bəxş etdi. Zalımlar bu məqamdan istisna edildi və onun nəslindən sadəcə saleh alimlərə aid edildi.** [180]

Başqa sözlə, imamət Yer üzündə - ən azı İbrahimin (ə) dövründən etibarən - heç bir zaman kəsilməmiş, İbrahim Xəlilullahın nəslində "qırılmaz" və "əbədi" olaraq qalmışdır. Ona görə də bəşəriyyət üçün hər zaman İbrahim Peyğəmbərin (s) nəslindən bir imam mövcuddur. Yəni, elə indi də bir imam var! Bundan əlavə, imamət heç bir zaman zalıma yetişmir. Həmçinin, Xəlilullahın (ə) nəslindən olan imam heç vaxt zülm eləmir. Bütün bu dəlillər qarşısında yenə də ayədəki imamətin elə peyğəmbərlik olduğunu iddia etmək ağla sığarmı? Nübuvvət "qırılmaz" və "əbədi"dirmi?

Professor İbn Yasin deyir:

أخرج الطبري بسنده الصحيح عن مجاهد (قال لاينال عهدي الظالمين) قال: لا يكون إماما ظالما.

**Ət-Təbəri səhih sənədlə Mücahiddən belə dediyini nəql edir: "Zalımlar mənim əhdimə nail olmazlar": Heç bir zaman zülm edən imam olmayacaq.**[181]

Bununla bərabər, İbrahim Xəlilullahın (ə) nəsli Allahın buyuruğuna əsasən iki qrupdur:

**سلام على إبراهيم كذلك نجزي المحسنين إنه من عبادنا المؤمنين وبشرناه بإسحاق نبيا من الصالحين وباركنا عليه وعلى إسحاق ومن ذريتهما محسن وظالم لنفسه مبين**

**İbrahimə salam olsun! Həqiqətən, Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq! Şübhəsiz ki, o Bizim mömin bəndələrimizdən idi! Ona salehlərdən olan İshaqın peyğəmbər**

[180] İbn Kəsir əd-Diməşqi, Qisasul-ənbiya, c.1, s.232; İbn Kəsir əd-Diməşqi, əl-Bidayə vən-nihayə, c.1, s.191
[181] Dr. Hikmət ibn Bəşir ibn Yasin, ət-Təfsirus-səhih, c.1, s.229





**olacağı ilə müjdə verdik. Biz ona İshaqa (peyğəmbərliklə, övlad çoxluğu ilə) bərəkət verdik. Onların hər ikisinin nəslindən yaxşı işlər görən də var, açıq-aşkar özünə zülm edən də!**[182]

Təbii ki, hər kim Allaha qarşı itaətsizlik edirsə, özünə zülm etmişdir:

**ومن يتعد حدود الله فقد ظلم نفسه**

**Allah müəyyən etdiyi hədləri aşan kimsə özünə zülm etmiş olar.**[183]

Həmçinin oxuyuruq:

**ومن يتعد حدود الله فأولئك هم الظالمون**

**Allahın hədlərindən kənara çıxanlar, əlbəttə, zalımlardır.**[184]

İmam Salehi əş-Şami (ö.942 h.q.) bu ayənin izahında yazır:

**معنى قوله تعالى: {ومن يتعد حدود الله فأولئك هم الظالمون} (البقرة ٢٢٩) وذلك أن حدود الله هي محارمه ونواهيه**

**Allahın *"Allahın hədlərindən kənara çıxanlar, əlbəttə, zalımlardır" (Bəqərə, 229)* sözlərinin mənası budur ki, Allahın hədləri onun haram və qadağan etdiyi şeylərdir.**[185]

Əllamə əl-Əlbani (ö.1420 h.q.) isə idda edir ki, ayənin əhatə dairəsi bundan daha genişdir:

**من تعدى بكل عمل وقته الذي حده الله تعالى لذلك العمل فقد تعدى حدود الله وقال تعالى: {ومن يتعد حدود الله فأولئك هم الظالمون}**

**Hər kim əməl edərkən Allah tərəfindən müəyyən edilmiş vaxtdan artıq bir iş görsə, Allahın hədlərini aşmışdır. Allah-Taala buyurur: *"Allahın hədlərindən kənara çıxanlar, əlbəttə, zalımlardır"***[186]

İmam Fəxruddin ər-Razi (ö.606 h.q.) deyir:

**قوله تعالى : {لا ينال عهدي الظالمين} فكل من أقدم على الذنب كان ظالما لنفسه لقوله تعالى : {فمنهم ظالم لنفسه}**

**Allah-taalanın "*Zalımlar mənim əhdimə nail olmazlar "* - buyuruğu: Hər kim günah iş görsə, Allah-Taalanın *" Onlardan kimisi özünə zülm edər" (Fatir, 32)* ayəsinə əsasən, özünə zülm etmişdir.**[187]

Deməli, İbrahim Peyğəmbərin (s) soyundan olan kimsə namazını məsələn, heç bir üzür olmadan gecikdirsə, yaxud qadağan və haram edilmiş iş görsə, zalımdır və nəticədə imam ola bilməz. Şübhəsiz ki, hər bir günahkar şəxs Allah tərəfindən

[182] Saffat, 37:109-113
[183] Talaq, 65:1
[184] Bəqərə, 2:229
[185] Muhəmməd ibn Yusif əs-Salihi əş-Şami, Subulul-huda, c.2, s.289
[186] Nasiruddin əl-Əlbani, əs-Səmərul-mustətab, s.70
[187] Fəxruddin ər-Razi, İsmətul-ənbiya, s.14





müəyyən edilmiş hədləri sındırmış olur. Beləliklə də Hz.İbrahimin (ə) soyundan olan bütün günahkarlar avtomatik olaraq imamətdən məhrum olurlar.

Allah İbrahimin (ə) bilavasitə soyundan gələn imamların bəziləri barədə bizə xəbər verir:

**ووهبنا له إسحاق ويعقوب نافلة وكلا جعلنا صالحين وجعلناهم أئمة يهدون بأمرنا**

**Biz ona (İbrahimə) İshaqı, üstəlik Yəqubu da bəxş edib onların hamısını saleh kimsələr etdik. Biz onları əmrimizlə (insanları) doğru yola gətirən imamlar (rəhbərlər) etdik.**[188]

Bu ayəyə əsasən imamlar doğru yola hidayət edən kəslərdir. İkincisi, onlar Allahın əmrilə hidayət edirlər. Buradan 3 nəticə hasil olur:

Birincisi, onların imaməti Allahın açıq-aşkar əmrilə verilir. Bu əlbəttə ki, aydın məsələdir.

İkincisi, bu imamlar özləri Allahın əmrlərinə tabedirlər və heç vaxt bu əmrlərdən çıxmırlar. Bu da aydın məsələdir, çünki onlar özlərinə zülm etmirlər.

Üçüncüsü, imamlar Allahın əmrlərini qoruyaraq diri saxlayırlar.

Deməli, onların əmrləri Allahın əmrləri, qadağaları da Allahın qadağalarıdır. Onlara itaət Allaha itaət, onlara itaətsizlik isə Allaha itaətsizlikdir. Bundan əlavə, maraqlıdır ki, Allah imamları xatırlayarkən cəmdə olan "جعلناهم" (qıldıq) sözünü istifadə edir. Bu açıq-aşkar işarədir ki, İbrahimin birbaşa nəslindən olan imamlar yalnızca Yaqub və İshaq deyildi və qeyd edilməyən digərləri də var idi.

İsrailoğulları arasında da İbrahimin soyundan Allah tərəfindən seçilmiş çox sayda imamlar var idi:

**ولقد آتينا موسى الكتاب فلا تكن في مرية من لقائه وجعلناه هدى لبني إسرائيل وجعلنا منهم أئمة يهدون بأمرنا لما صبروا وكانوا بآياتنا يوقنون**

**Biz Musaya Kitab vermişdik. Sən onunla görüşəcəyinə şübhə etmə. Biz onu İsrail oğullarına doğru yol göstərən rəhbər etmişdik. (Çətinliklərə) səbr etdikləri və ayələrimizə ürəkdən inandıqları üçün Biz onlardan (İsrail oğullarından) əmrimizlə (insanlara) haqq yolu göstərən rəhbərlər təyin etmişdik.**[189]

Burada iki həssas sual meydana çıxır:

[188] Ənbiya, 21:72-73
[189] Səcdə, 32:23-24





Bizim ümmətimiz arasında da Hz.İbrahimin (ə) nəslindən olan imam varmı? Əgər varsa, kimlərdir?

İmam Əbu Yalənin (ö.307 h.q.) hədisi bizə ilk ipucunu verir:

**حدثنا الحسن بن إسماعيل أبو سعيد بالبصرة حدثنا إبراهيم بن سعد عن أبيه عن أنس رضي الله عنه قال : قال رسول الله صلى الله عليه و سلم : الأئمة من قريش**

**Əl-Həsən ibn İsmayıl Əbu Səid - İbrahim ibn Səd - atası (Səd) - Ənəs (r.a):**

**Allah Rəsulu (s) buyurub: "İmamlar Qureyşdəndir."[190]**

Şeyx Hüseyn Səlim Əsəd deyir:

**إسناده صحيح**

**Sənədi səhihdir.[191]**

Əl-Hafizin (ö.852 h.q.) dediyinə görə bu hədis mütəvatirdir:

**حديث: "الأئمة من قريش"، النسائي عن أنس، ورواه الطبراني في الدعاء، والبزار والبيهقي من طرق عن أنس .قلت: وقد جمعت طرقه في جزء مفرد عن نحو من أربعين صحابيا**

***"İmamlar Qureyşdəndir"* hədisi: Ən-Nəsai Ənəsdən nəql edib. Həmçinin, ət-Təbərani "əd-Dua" əsərində, əl-Bəzzar və əl-Beyhəqi də bir neçə yolla Ənəsdən rəvayət etmişlər. Mən deyirəm: "Mən bunun nəql yollarını ayrıca cüzdə 40 səhabədən toplamışam."[192]**

Bu hədis mütləq şəkildə isbat edir ki, bu ümmətin arasında İbrahimin nəslindən gələn imamlar var və onlar Allahın əmrinə tabe olmaqla digər insanları Onun Əmrilə hidayət edirlər. Daha mühümü, bütün bu imamlar Allah tərəfindən təyin edilmişlər, onlardan heç biri nə imamətdən əvvəl, nə də sonra Onun Qanunlarına qarşı çıxmamışlar. Diqqətə alınmalı ən əsas məsələ isə budur ki, bütün imamlarımız Qureyş qəbiləsindəndir.

Bununla belə, Qureyş bir neçə qəbilədən ibarət böyük bir tayfadır. İmamlar bütün tafya boyu yayılmışlar, yoxsa vahid bir qəbilədə mərkəzləşmişlər? Bizim cavabımız bu salavatda tərəddüdsüz isbat edilir:

**اللهم بارك على محمد وعلى آل محمد كما باركت على إبراهيم وعلى آل إبراهيم إنك حميد مجيد**

**Allahummə barik alə Muhəmmədin və alə Ali-Muhəmməd kəma barəktə alə İbrahimə və alə Ali-İbrahim, innəkə həmidun məcidun.[193]**

---

[190] Əbu Yalə əl-Mosuli, əl-Müsnəd, c.6, s.321, №3644
[191] Həmin mənbə
[192] İbn Həcər əl-Əsqəlani, Təlxisul-həbir, c.4, s.116, №1730
[193] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.3, s.1233, №3190





Şübhəsiz ki, Hz.İbrahim və onun zürriyyəti öz ümmətlərinin imamları idilər. Deməli, Hz.Muhəmməd və ailəsi də eynilə öz ümmətlərinin imamlarıdırlar. Allah-Taala Hz.Muhəmməd və ailəsini eynilə Hz.İbrahim və ailəsi kimi bərəkətləndirmişdir. Odur ki, Hz.İbrahim kimi Hz.Muhəmməd də öz sağlığında bəşəriyyətin imamı idi, Hz.İbrahimin ailəsi ondan sonra bəşəriyyətə imam olduqları kimi Hz.Muhəmmədin ailəsi də ondan sonra bəşəriyyətə imam olmuşlar.

Həmçinin, unutmamalıyıq ki, Hz.Muhəmmədin ailəsi Allah tərəfindən bütün aləmlərdən üstün qərar verilmişdi. Gəlin Professor İbn Yasinin təqdim etdiyi mühüm bir məqamı yenidən xatırladaq:

**{إن الله اصطفى آدم ونوحا وآل إبراهيم وآل عمران على العالمين}**

**أخرج الطبري وابن أبي حاتم بسنديهما الحسن عن علي بن أبي طلحة عن ابن عباس قال: هم المؤمنون من آل إبراهيم وآل عمران: آل ياسين وآل محمد يقول الله عز وجل (إن أولى الناس بإبراهيم للذين اتبعوه.)**

***[Allah Adəmi, Nuhu, İbrahimin ailəsini və İmranın ailəsini seçib aləmlərdən üstün etdi... (Ali-İmran, 33)].***

**Ət-Təbəri və İbn Əbi Hatim həsən sənədlə Əli ibn Əbi Təlhədən, o da İbn Abbasdan onun belə dediyini rəvayət edirlər: Onlar İbrahimin, İmranın, Yasinin və Muhəmmədin (s) ailəsindən olan möminlərdir. Allah buyurur: *"Şübhəsiz ki, insanlardan İbrahimə ən yaxın olanı onun ardınca gedənlərdir." (Ali-İmran, 68)*.**[194]

Bununla yanaşı, Hz.Muhəmməddən sonra bəşəriyyətin ali rəhbərlərinin mövcudluğunda şübhə yeri qoymayan "Səqəleyn" hədisini də xatırlamaq yerinə düşər.

**يا أيها الناس إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا كتاب الله وعترتي أهل بيتي**

**Ey insanlar! Sizin üzərinizdə elə bir əmanət qoyuram ki, ona sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və itrətim, Əhli-beytim.**

Bəşəriyyətin ali rəhbərləri əlbəttə ki, imamlardır:

**وجعلناهم أئمة يهدون بأمرنا**

**Biz onları əmrimizlə (insanları) doğru yola gətirən imamlar (rəhbərlər) etdik.**[195]

[194] Dr. Hikmət ibn Bəşir ibn Yasin, ət-Təfsirus-səhih, c.1, s.411
[195] Ənbiya, 21:73





Şeyxul-İslam İbn Teymiyyə (ö. 728 h.q.) deyir:

**والذي رواه مسلم انه بغدير خم قال إني تارك فيكم الثقلين كتاب الله فذكر كتاب الله وحض عليه ثم قال وعترتي أهل بيتي أذكركم الله في أهل بيتي ثلاثا وهذا مما انفرد به مسلم ولم يروه البخاري وقد رواه الترمذي وزاد فيه وانهما لن يفترقا حتى يردا علي الحوض**

**وقد طعن غير واحد من الحفاظ في هذه الزيادة وقال إنها ليست من الحديث والذين اعتقدوا صحتها قالوا إنما يدل على أن مجموع العترة الذين هم بنو هاشم لا يتفقون على ضلالة وهذا قاله طائفة من أهل السنة وهو من أجوبة القاضي أبي يعلى وغيره**

**والحديث الذي في مسلم إذا كان النبي صلى الله عليه و سلم قد قاله فليس فيه إلا الوصية باتباع كتاب الله وهذا أمر قد تقدمت الوصية به في حجة الوداع قبل ذلك وهو لم يأمر باتباع العترة لكن قال أذكركم الله في أهل بيتي وتذكير الأمة بهم يقتضي أن يذكروا ما تقدم الأمر به قبل ذلك من إعطائهم حقوقهم والامتناع من ظلمهم وهذا أمر قد تقدم بيانه قبل غدير خم**

**Müslim tərəfindən nəql edilən hədisə əsasən, O (Peyğəmbər) Qədir-Xumda "Sizin üzərinizdə iki ağır əmanət qoyuram: Allahın kitabı..." buyurmuş və Allahın Kitabını qeyd edərək onu xüsusi vurğulamışdır. Daha sonra demişdir: "və itrətimi, Əhli-beytimi. Əhli-Beytim barəsində sizə Allahı xatırladıram - bunu 3 dəfə təkrar etmişdir." Bu, sadəcə Müslim tərəfindən nəql edilən hədislərdən biridir, əl-Buxari onu qeyd etməmişdir. Ə-Tirmizi (bu hədisi) rəvayət etmiş və əlavə olaraq "Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar." hissəsini qeyd etmişdir.**

**Birdən çox hədis alimi bu əlavə hissəni tənqid etmiş və onun hədisin bir parçası olmadığını demişlər. Onun səhih olduğuna inananlara gəldikdə isə, demişlər: "Ümumilikdə Bəni-Haşimdən ibarət olan İtrət heç vaxt zəlalət üzrə ittifaq etməzlər". Bu, əhli-sünnədən olan bir qrupun dedikləridir və əl-Qazi Əbu Yalə və digərlərinin verdikləri cavablardandır.**

**Müslimin hədisində - əgər Peyğəmbər (s) həqiqətən bunu demişsə - Allahın kitabına tabe olmaqdan başqa bir buyuruq yoxdur. Bu barədədəki əmr bundan öncə Vida Həccində artıq deyilmiş və itrətə tabe olmaq barədə əmr verməmiş, sadəcə "Əhli-Beytim barəsində sizə Allahı xatırladıram" - deyə buyurmuşdur. Ümmət tərəfindən onların xatırlanması o deməkdir ki, onlara haqqlarını vermək və onlara zülm etməkdən çəkinmək barədə daha əvvəl əmr edilmiş sözləri xatırlatmaqdır. Bu məsələ isə Qədir-Xumdan qabaq izah edilib.[196]**

İbn Teymiyyə həmçinin yazır:

**وأما قوله وعترتي أهل بيتي وأنهما لن يفترقا حتى يردا على الحوض فهذا رواه الترمذى وقد سئل عنه احمد بن حنبل فضعفه وضعفه غير واحد من أهل العلم وقالوا لا يصح وقد أجاب عنه طائفة بما يدل على أن أهل بيته كلهم لا يجتمعون على ضلالة قالوا ونحن نقول بذلك كما ذكر القاضي أبو يعلي وغيره**

**"Və itrətim, Əhli-beytim. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşmayana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar" sözlərinə gəldikdə isə, bu ət-Tirmizi tərəfindən**

---

196 İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.7, s.318





**nəql edilib. Əhməd ibn Hənbələ bu barədə sual verilmiş, o da zəif olduğunu demişdir. Birdən çox elm əhli onu zəif bilmiş və "səhih deyildir" demişlər. Bir qrup isə bildirmişdir ki, bu hədis Əhli-beytin bütövlükdə zəlalət üzrə ittifaq etməyəcəklərinə dəlildir. Onlar demişlər: "Biz də Qazi Əbu Yalə və digərlərinin dedikləri kimi deyirik."**[197]

Şeyxin fikirlərini ümumiləşdirsək, onlar aşağıdakı kimidir:

- Səqəleyn hədisinin sadəcə 2 versiyası var: biri "Səhih Müslim"də, digəri isə "Sünənüt-Tirmizi"də nəql edilən.
- Ət-Tirmizinin versiyası Əhməd və digər elm əhli tərəfindən zəif hesab edilib.
- "Səhih Müslim"dəki versiya isə şübhəlidir. Belə ki, İbn Teymiyyə deyir: "əgər Peyğəmbər (s) həqiqətən bunu demişsə".
- "Səhih Müslim"dəki versiya ümmətə sadəcə Qurana tabe olmağı bildirir, Əhli-beytə tabeçilik barədə orada heç bir söz yoxdur.
- Beləliklə, heç kəsin üzərinə Əhli-beytə tabeçilik öhdəliyi qoyulmayıb.
- Peyğəmbərin (s) itrəti ümumilikdə, onun zürriyyətindən olmayanlar da daxil olmaqla, Bəni-Haşimin hamısıdır.

Şeyxin gəldiyi nəticələr həmişəki kimi, bir sıra azdırıcı məlumatları özündə ehtiva edir. Birincisi və ən önəmlisi, daha əvvəl isbat etdiyimiz kimi, bu hədisin hər bir versiyası - istər "Səhih Müslim", olsun istər "Sünənüt-Tirimizi", istərsə də başqası - ayrı-ayrılıqda səhihdir. Heç biri zəif deyil. Hətta Əhməd ibn Hənbəl və digərləri hədisə zəif hökmü vermişlərsə də, səhv etmişlər. Halbuki, İslamda alimlərin xətalarının ardınca getməzlər və bunlar höccət hesab edilmir. Səqəleyn hədisinin bütün versiyaları səhih yaxud həsən sənədlə nəql edilmişdir. Deməli, onun səhihliyi barədə şübhə ola bilməz.

İkincisi, İbn Teymiyyənin özünün də qeyd etdiyi kimi, Peyğəmbər (s) Quran və Əhli-beyti "iki ağır əmanət" olaraq vəsf edib. Bu, əlbəttə ki, onların hər ikisinin

[197] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.7, s.394-395





ardınca gedilməsini əvvəlcədən vurğulayır. Bu yerdə hörmətli oxucularımıza böyük əhli-sünnə dilçi alimi İbn əl-Əsirin (ö.606 h.q.) sözlərini xatırlatmaq istərdik:

**[إني تارك فيكم الثقلين : كتاب الله وعترت] سماهما ثقلين لأن الأخذ بهما والعمل بهما ثقيل . ويقال لكك خطير نفيس ثقل فسماهما ثقلين إعظاما لقدرهما وتفخيما لشأنهما.**

**"Sizin üzərinizdə iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və itrət". "(Peyğəmbər) onları ona görə "səqəleyn" adlandırmışdır ki, onların hər ikisinə sarılmaq və arxalarınca getmək ağırdır (məsuliyyətlidir)". (Daha sonra) demişdir: "Hər bir qiymətli şeyə "səqəl" deyilir. Odur ki, peyğəmbər (s) onları "səqəleyn" (iki ağır əmanət) adlandırmaqla, onların əhəmiyyətini vurğulamaq və mədh etmək istəyib.[198]**

Deməli, "səqəleyn" sözünün özü belə Peyğəmbərin (s) özündən sonra ümmətə Quran və Əhli-beytə tabe olmağı əmr etməsini isbat edir. İbn Teymiyyənin izahatı Peyğəmbərin (s) göstərişini təhrif etməkdən başqa bir şey deyil.

Üçüncüsü, Şeyxul-İslam "Peyğəmbərin itrəti"ni Bəni-Haşimin hamısına aid etmişdir. Bu isə aşkar şəkildə sözün mənasını "nəsil"-dən "tayfa"-ya çevirir. Halbuki, bu, sözün məlum izahına ziddir. Əhli-sünnənin dilşünas alimi İbn Mənzur "itrət" kəlməsini belə izah edir?

**والعامة تظن أنها ولد الرجل خاصة وأن عترة رسول الله، صلى الله عليه وسلم، ولد فاطمة، رضي الله عنها، هذا قول ابن سيده**

**Əksəriyyət iddia edir ki, bu (itrət) sadəcə kişinin övladlarına aiddir və Allah Rəsulunun (s) itrəti Fatimənin (r.a) övladlarıdır. Bu, İbn Sidəhin fikridir.[199]**

Əlbəttə ki, Allah Rəsulu (s) bəşəriyyətlə əksəriyyətin başa düşəcəyi dildə danışırdı!

Hətta yenə də Səqəleyn hədisində qeyd edilən "itrət" Peyğəmbərin nəslindən olan hər kəsə yox, sadəcə bir qrup insana aiddir. Əllamə əl-Əlbaninin (ö.1420 h.q.) nəql etdiyi hədisdən də göründüyü kimi, hədisdə "itrət" olaraq nəzərdə tutulan şəxslər onun xəlifələridir (onun yoxluğunda yerini dolduracaq kəslərdir):

**إني تارك فيكم خليفتين: كتاب الله حبل ممدود ما بين السماء والأرض وعترتي أهل بيتي وإنهما لن يتفرقا حتى يردا علي الحوض**

[198] İbn əl-Əsir əl-Cəzəri, ən-Nihayə fi ğəribul-hədis vəl-əsar, c.1, s.216
[199] İbn Mənzur əl-Misri, Lisanul-ərəb, c.4, s.536





**"Sizin üzərinizdə iki xəlifə qoyub gedirəm: Göylə yer arasında və ya göydən yerə uzanmış ip olan Allahın Kitabı və İtrətimi, Əhli-beytimi. Həqiqətən onlar Kövsər hovuzunun yanında mənə qovuşana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar."[200]**

Daha sonra Əllamə yazır:

**صحيح**

**Səhihdir.[201]**

Hətta yenə də Səqəleyn hədisində qeyd edilən "itrət" Peyğəmbərin nəslindən olan hər kəsə yox, sadəcə bir qrup insana aiddir. Əllamə əl-Əlbaninin (ö.1420 h.q.) nəql etdiyi hədisdən də göründüyü kimi, hədisdə "itrət" olaraq nəzərdə tutulan şəxslər onun xəlifələridir (onun yoxluğunda yerini dolduracaq kəslərdir):

Elə isə, Hz.Muhəmmədin (s) soyundan sadəcə 12 nəfər qanuni xəlifə olmağa layiqdir.[202] İmam Əhmədin (ö.241 h.q.) kitabındakı səhih hədisdə deyilir:

**حدثنا عبد الله حدثني أبي ثنا مؤمل بن إسماعيل ثنا حماد بن سلمة حدثنا داود بن هند عن الشعبي عن جابر بن سمرة قال سمعت النبي صلى الله عليه و سلم يقول يكون لهذه الأمة اثنا عشر خليفة**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Muməl ibn İsmayıl - Həmmad ibn Sələmə - Davud ibn Hind - əş-Şəbi - Cabir ibn Səmurə:**

**Allah Rəsulunun (s) belə buyurduğunu eşitdim: "Bu ümmət üçün 12 xəlifə olacaq."[203]**

Şeyx əl-Ərnaut yazır:

**حديث صحيح**

**Səhih hədisdir.[204]**

Deməli, 12-dən artıq xəlifə bu ümmət üçün deyildir, sadəcə fırıldaqçıdır. Bu rəvayət çox mühümdür.

Yenə həmin kitabda nəql edilir:

**حدثنا عبد الله حدثني أبي ثنا هاشم ثنا زهير ثنا زياد بن خيثمة عن الأسود بن سعيد الهمداني عن جابر بن سمرة قال سمعت رسول الله صلى الله عليه و سلم أو قال قال رسول الله صلى الله عليه و سلم يكون بعدي اثنا عشر خليفة كلهم من قريش**

200 Nasiruddin əl-Əlbani, Səhih camius-səğir, c.1, s.482, №2457
201 Həmin mənbə
202 Əlbəttə Xanım Zəhra (s.ə.) da "itrət" kəliməsinin əhatə dairəsinə daxildir. Səqəleyn hədisinə əsasən o, Allahın yer üzərində höccətidir və itatət edilməsi vacib olan bir kəsdir. Lakin Xanım (ə) qanuni xəlifə olmadığından "12 xəlifə" hədislərinin məfhumundan çıxmış sayılır. Amma bu onu "səqəleyn" yaxud "xəlifəteyn" hədisinin məfhumundan çıxarmır. Yəni bu üç qrup hədisləri bir yerə cəm etdikdə, belə başa düşülür ki, Quran xəlifə olduğu kimi Xanım Zəhra (ə) da xəlifədir. Yəni Quran əməl edilməsi vacib və höccət olduğu kimi, Xanım Zəhranın (ə) da sözlərinə əməl etmək vacibdir və o, Allahın höccətidir. "12" xəlifə hədisindən isə bunu başa düşürük ki, Peyğəmbərin (s) "itrət"indən qanuni xəlifəliyə layiq olan kişilərin sayı yalnız 12 nəfərdir. (red.)
203 Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.106, №21051
204 Həmin mənbə





**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Haşim - Zuheyr - Ziyad ibn Xeysəmə - əl-Əsvəd ibn Səid əl-Həmədani - Cabir ibn Səmurə:**

**Allah Rəsulunun (s) belə buyurduğunu eşitdim: "Məndən sonra 12 xəlifə olacaq, hamısı da Qureyşdəndir."[205]**

Əl-Ərnaut yazır:

**حديث صحيح**

**Səhih hədisdir.[206]**

Allah rəsulundan (s) sonra 12-dən artıq xəlifə olmayacaq. Bu hədis kifayət qədər müfəssəl və ifadəlidir.

Digər bir məqam bundan ibarətdir ki, Qureyşdən olan, Peyğəmbərin (s) soyundan olan 12 xəlifə Qiyamət gününə qədər davamlı, bütöv və fasiləsiz olacaqdır. İmam Müslim (ö.261 h.q.) bu barədə yazır:

**حدثنا قتيبة بن سعيد وأبو بكر بن أبي شيبة قالا حدثنا حاتم (وهو ابن إسماعيل) عن المهاجر بن مسمار عن عامر بن سعد بن أبي وقاص قال كتبت إلى جابر بن مرة مع غلامي نافع أن أخبرني بشيء سمعته من رسول الله صلى الله عليه و سلم قال فكتب لي سمعت رسول الله صلى الله عليه و سلم يوم جمعة عشية رجم الأسلمي يقول (لا يزال الدين قائما حتى تقوم الساعة أو يكون عليكم اثنا عشر خليفة كلهم من قريش)**

**Quteybə ibn Səid və Əbu Bəkr ibn Əbi Şeybə - Hatim ibn İsmayıl - əl-Muhacir ibn Musmər - Amir ibn Səd ibn Əbi Vəqqas:**

**Qulluqçum Nafe vasitəsilə Cabir ibn Səmurəyə Allah Rəsulundan (s) eşitdiyi məsələ barədə mənə xəbər verməsi üçün məktub göndərdim. O, cavabında mənə belə yazdı: Cümə günü, əl-Əsləminin rəcm olunduğu gecə Allah Rəsulunun (s) belə buyurduğunu eşitdim: "Bu din Qiyamət gününə qədər yaxud sizin üzərinizdə hamısı Qureyşdən olan 12 xəlifə gələnə qədər ayaqda duracaq."[207]**

Qısası, 12 xəlifənin idarəçiliyi İslam Yer üzündə var olduğu müddətdə fasiləsiz olacaq. İslam dininin Qiyamət gününə qədər mövcud olacağını nəzərə alsaq, deməli 12 xəlifənin idarəçiliyi də həmin günə qədər davam edəcək. Onların idarəçiliyi bitər-bitməz İslam yer üzündən gedəcək.

Eyni məsələ İmam Əbi Asimin (ö.287 h.q.) hədisində də vurğulanır:

---

[205] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.92, №20890
[206] Həmin mənbə
[207] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.3, s.1453, №1822 (10)





**ثنا الحسن بن علي، ثنا سنيد بن داود، عن حجاج، عن ابن جريج، حدثني محمد بن طلحة، عن معاوية بن أبي سفيان أنه قال وهو على المنبر أن رسول الله صلى الله عليه وسل قال:لا يزال والي من قريش.**

**Əl-Həsən ibn Əli - Suneyd ibn Davud - Həccac - İbn Cüreyc - Muhəmməd ibn Təlhə - Muaviyə ibn Əbi Süfyan:**

**O (Muaviyə ibn Əbi Süfyan) minbərdə olarkən dedi: Allah Rəsulu (s) buyurdu: "Qureyşdən vəlinin olması heç vaxt kəsliməyəcək."[208]**

Əl-Əlbani yazır:

**حديث صحيح**

**Hədis səhihdir.[209]**

Vəlinin hakimiyyəti vilayət adlanır. Bu məsələyə İmam Müslimin hədisində işarə olunub:

**حدثنا ابن أبي عمر حدثنا سفيان عن عبدالملك بن عمير عن جابر بن سمرة قال سمعت النبي صلى الله عليه و سلم يقول (لا يزال أمر الناس ماضيا ما وليهم اثنا عشر رجلا) ثم تكلم النبي صلى الله عليه و سلم بكلمة خفيت علي فسألت أبي ماذا قال رسول الله صلى الله عليه و سلم؟ فقال ( كلهم من قريش)**

**İbn Əbi Ömər - Süfyan - Əbdül-Məlik ibn Umeyr - Cabir ibn Səmurə:**

**Allah Rəsulunun (s) belə buyurduğunu eşitdim: "İnsanların (xilafət) işi onlara on iki şəxs hakimlik (vəlləyhum-onlara vəli olacaq) edənə qədər davam edəcək." Daha sonra Peyğəmbər (s) mənə aydın olmayan bir söz dedi. Dərhal atamdan soruşdum: "Allah Rəsulu (s) nə dedi?" Cavab verdi: "Onların hamısı Qureyşdəndir".[210]**

Həddən artıq əhəmiyyət daşıyan bu hədis aşağıdakı məsələlər aydınlıq gətirir:

- 12 şəxsin idarəçiliyi bütün bəşəriyyət üzərindədir.
- İnsanların işləri Yer üzündə davam edirsə, deməli bu 12 şəxsdən biri onlar üzərində vilayəti həyata keçirir.
- Hər bir zamanda bəşəriyyət üzərində Qureyşdən olan bir vəli var.
- Yer üzündə insanların işləri sadəcə on iki şəxsin vilayəti bitdiyi anda sona çatacaq.

Bu on iki şəxs barədə əsas məqamlardan biri də onların hamısının hökmdar olmalarıdır. Onların hamısı dinamik sistemin vəliəhd xəlifələridir. İmam Əhmədin kitabında müvafiq hədis bu cür nəql edilir:

[208] Əbu Bəkr ibn Əbi Asim, Kitabus-sunnə, c.2, s.533, №1126
[209] Həmin mənbə
[210] Müslim ibn əl-Həccac, əs-Səhih, c.3, s.1452, №1821 (6)





**حدثنا عبد الله حدثني أبي ثنا يونس بن محمد ثنا حماد يعنى بن زيد ثنا مجالد عن الشعبي عن جابر بن سمرة قال خطبنا رسول الله صلى الله عليه و سلم بعرفات فقال لن يزال هذا الأمر عزيزا منيعا ظاهرا على من ناوأه حتى يملك اثنا عشر كلهم قال فلم أفهم ما بعد قال فقلت لأبي ما بعد كلهم قال كلهم من قريش**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Yunus ibn Muhəmməd - Həmmad ibn Zeyd - Mücalid - əş-Şəbi - Cabir ibn Səmurə:**

**Allah Rəsulu (s) Ərəfatda bizə xütbə söyləyərək buyurdu: "Bu iş (xilafət) 12 şəxs hökmdarlıq etdiyi müddətdə ona qarşı çıxanlar üzərində güclü, məğlubedilməz və qalib olacaq. Onların hamısı..." (Cabir dedi:) Bundan sonra nə deyildiyini başa düşmədim. Ona görə atama dedim: "Onların hamısı"ndan sonra nə dedi?" Cavab verdi: "Onların hamısı Qureyşdən olacaq."[211]**

Əl-Ərnaut yazır:

**حديث صحيح**

**Hədis səhihdir.[212]**

İmam İbn Hibban (ö.354 h.q.) Mucalid üçün əlavə dəstək olan rəvayəti nəql edir:

**حدثنا إبراهيم بن نصر العنبري بسمرقند قال ثنا على بن خشرم قال ثنا عيسى بن يونس عن عمران القبي عن الشعبي عن جابر بن سمرة قال سمعت النبي صلى الله عليه وسلم يقول في حجة الوداع لا يزال أمر هذه الأمة عاليا على من ناواها حتى يملك اثنا عشر خليفة**

**İbrahim ibn Nəsr əl-Ənbari - Əli ibn Xəşrəm - İsa ibn Yunus - İmran əl-Qubi - əş-Şəbi - Cabir ibn Səmurə:**

**Vida Həcci günü Allah Rəsulunun (s) belə buyurduğunu eşitdim: "Bu ümmətin işləri (xilafət) 12 xəlifə hökmdarlıq etdiyi müddətdə ona qarşı çıxanlar üzərində qalib olacaq."[213]**

Bundan əlavə İmam ət-Tirmizi (ö.279 h.q.) maraqlı bir şahid nəql edir:

**حدثنا أحمد بن منيع حدثنا زيد بن حباب حدثنا معاوية بن صالح حدثنا أبو مريم الأنصاري عن أبي هريرة قال قال رسول الله صلى الله عليه و سلم الملك في قريش**

**Əhməd ibn Məni - Zeyd ibn Hubbab - Muaviyə ibn Salih - Əbu Məryəm əl-Ənsari - Əbu Hureyrə:**

**Allah Rəsulu (s) buyurub: "Hökmdarlıq Qureyşə aiddir."[214]**

Əllamə əl-Əlbani yazır:

**صحيح**

[211] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.96, №20944
[212] Həmin mənbə
[213] Muhəmməd ibn Hibban ət-Təmimi, Kitabus-siqat, c.7, ps.241-242, №9878
[214] Əbu İsa ət-Tirmizi, əl-Camius-səhih sünənut-Tirmizi, c.5, s.727 №3936





**Səhihdir.**[215]

Eyni rəvayəti İmam Əhmədin kitabında da nəql edilib:

**حدثنا عبد الله حدثني أبي حدثنا زيد بن الحباب حدثنا معاوية بن صالح قال حدثني أبو مريم انه سمع أبا هريرة يقول قال رسول الله صلى الله عليه و سلم الملك في قريش**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Zeyd ibn Hubbab - Muaviyə ibn Salih - Əbu Məryəm - Əbu Hureyrə:**

**Allah Rəsulu (s) buyurub: "Hökmdarlıq Qureyşə aiddir."**[216]

Sənəd barədə şərh verərkən əl-Əlbani yazır:

**وهذا إسناد صحيح رجاله ثقات رجال مسلم غير أبي مريم وهو الأنصاري وهو ثقة كما في التقريب**

**Bu sənəd səhihdir. Onun raviləri siqədir, Əbu Məryəmdən başqa bütün raviləri Müslimin raviləridir. O isə (Əbu Məryəm) əl-Ənsaridir və "ət-Təqrib"də qeyd edildiyi kimi siqədir."**[217]

Daha sonra deyir:

**قلت: زيد ثقة صدوق كما في " الميزان " وقد رفعه، وهي زيادة يجب قبولها كما تقرر في المصطلح.**

**Deyirəm: Zeyd siqədir, "əl-Mizan"da qeyd olunduğu kimi "səduqdur" və bunu mərfu olaraq rəvayət etmişdir. Bu "əl-Mustələh"də dəfələrlə qeyd olunuduğu kimi qəbul edilməli olan bir əlavədir."**[218]

Digər bir rəvayətdə Peyğəmbər (s) "hökmdarlıq" və "xilafət" sözlərini əvəzləyir. İbn Əbi Asim yazır:

**ثنا أبو صالح هدبة بن عبد الوهاب، حدثنا النضر بن شميل، ثنا شعبة، عن حبيب بن الزبير، عن عبد الله بن أبي الهذيل قال: كنا نجالس عمرو ابن العاص نذاكره الفقه فقال رجل من بكر لتنتهين قريش أو ليجعلن الله هذا الأمر في جمهور من جماهير العرب فقال عمرو بن العاص: كذبت سمعت رسول الله صلى الله عليه وسلم يقول: الخلافة في قريش إلى قيام الساعة.**

**Əbu Salih Hudbə ibn Əbdül-Vəhhab - ən-Nədr ibn Şumeyl - Şubə - Həbib ibn əz-Zubeyr - Abdullah ibn Əbi əl-Huzeyl:**

**Biz Əmr ibn əl-Asla oturub fiqh müzakirə edirdik. Bu vaxt Bəkrdən olan bir nəfər dedi: "Əgər Qureyş əl çəkməsə, Allah bu işi ərəblər arasından başqa bir qrupla əvəzləyəcək". Əmr ibn əl-As cavab verdi: "Yalan deyirsən! Mən Allah Rəsulunun (s) belə buyurduğunu eşitmişəm: "Xilafət Qiyamət gününə qədər Qureyşə məxsusdur".**[219]

Əllamə əl-Əlbani yazır:

**إسناده جيد**

[215] Həmin mənbə
[216] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.2, s.364, №8746
[217] Nasiruddin əl-Əlbani, Silsilətul-əhadisis-səhihə, c.3, s.72, №1084
[218] Həmin mənbə
[219] Əbu Bəkr ibn Əbi Asim, Kitabus-sunnə, c.2, s.527, №1109





**Sənədi ceyyiddir (gözəldir-məqbuldur).[220]**

İbn Əbi Asim daha sonra yazır:

**حدثنا أبو بكر، ثنا عفان، ثنا سكين بن عبد العزيز، عن أبي المنهال سيار بن سلامة قال: دخلت مع أبي على أبي برزة وأنا غلام فقال: قال رسول الله صلى الله عليه وسلم: الأئمة من قريش.**

**Əbu Bəkr - Əffan - Sikkin ibn Əbdül-Əziz - Əbul-Minhal Səyyar ibn Sələmə:**

**Mən qulluqçu ikən atamla Əbu Bərzənin yanına getmişdim. O dedi: Allah Rəsulu (s) buyurub: "İmamlar Qureyşdəndir".[221]**

Əl-Əlbani yazır:

**حديث صحيح إسناده حسن**

**Hədis səhihdir, sənədi həsəndir.[222]**

Bütün bu mötəbər rəvayətlərdən aydın olur ki, hər bir qanuni xəlifə hökmdardır, vəlidir, imamdır. Həmçinin, biz gördük ki, xilafət də hökmdarlıq, vilayət və imamətdir. Buradan da aşkar olduğu kimi, xilafət hökmdarlıqdırsa, deməli təbiətcə həm irsi, həm də sülaləvi xarakter daşıyır.

[220] Həmin mənbə
[221] Həmin mənbə, c.2, s.532, №1125
[222] Həmin mənbə





Şeyxul-İslam İbn Teymiyyə (ö. 728 h.q.) deyir:

**وفي لفظ لا يزال الإسلام عزيزا إلى أثنى عشر خليفة كلهم من قريش وهكذا كان فكان الخلفاء أبو بكر وعمر وعثمان وعلي ثم تولى من اجتمع الناس عليه وصار له عز ومنعة معاوية وابنه يزيد ثم عبد الملك وأولاده الأربعة وبينهم عمر بن عبد العزيز**

**"Hamısı Qureyşdən olan 12 xəlifəyə qədər İslam hər zaman güclü olacaq" ləfzi isə bu cür reallaşmışdır: xəlifələr Əbu Bəkr, Ömər, Osman və Əli olmuş, sonra isə üzərlərində camaatın fikir birliyi olan, güclü və yenilməz şəxslər idarə etmişlər: Muaviyə və oğlu Yezid (!!!), Əbdül-Məlik və onun 4 övladı. Ömər ibn Əbdül-Əziz də onlardan biri idi.**[223]

Şeyxin dediklərindən alınan nəticə budur ki:

- Əbu Bəkr, Ömər, Osman, Muaviyə, Yezid, Əbdül-Məlik və digərləri İbrahimin nəslindən olan imamlar idilər;
- Onların hamısı Allahın əhdi olan İmamətə çatmış və Onun Əmri ilə bəşəriyyətə yol göstərmişlər.
- Onların heç biri nə özlərinə, nə də başqalarına qarşı zülm etməmişlər.
- Onların heç biri nə imamətdən əvvəl, nə də imamət dövründə Allahın qanunlarından hər hansı birini pozan zalımlardan olmamışdır.
- Onların hamısı Allah tərəfindən təyin edilmişdir. Necə ki, ataları İbrahimi və onlardan qabaqkı bütün imamları da Allah təyin etmişdi.
- Onların hamısı hökuməti idarə edən hökmdarlar idilər və ümmət üzərində hakimiyyəti həyata keçirirdilər.

Əgər "Səqəleyn" və "Xəlifəteyn" hədislərini də diqqətə alsaq, o zaman İbn Teymiyyənin dediklərindən belə çıxır ki:

- Əbu Bəkr, Ömər, Osman, Muaviyə, Yezid, Əbdül-Məlik və digərləri Hz.Muhəmmədin (s) soyundan idilər.
- Onlar Peyğəmbərin (s) itrəti, Əhli-beyti idilər və hətta bir anlıq da olsa Qurana zidd getmirdilər.

Əlbəttə ki, Əbu Bəkr və adları sadalanan digərləri:

- Hz.Muhəmməd və onun Əhli-beytinin nəslindən deyildilər;

[223] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.8, s.238





- Allah tərəfindən təyin edilməmişdilər;
- Allahın Əhdinin və Əmrinin sahibləri deyildilər;
- Allaha itaətsizlik və bir çox günahlar etməklə özlərinə və digərlərinə zülm edən zalımlar idilər;
- Muaviyə və ondan sonrakıları (Əməvi və Abbasiləri) istisna etməklə, heç biri hökumət idarə edən hökmdarlar olmamışlar.
- Muaviyə və ondan sonrakıları (Əməvi və Abbasiləri) istisna etməklə, heç biri ümmət üzərində hakimiyyət sahibi olmamışlar.

Ən əsası, nə Əbu Bəkri, nə Öməri, nə də ki Osmanı Quran və səhih sünnədə qeyd olunan xəlifənin xüsusiyyətlərinə uyğunlaşdırmaq mümkün deyil. Ələbttə ki, onlar idarəçi idilər, lakin xəlifə və imam deyildilər. Siyasi yaxud hərbi idarəçiliklə xəlifə arasında fərqi Harunun (ə) qissəsində görə bilərik. Onun mübarək qardaşı Musa öz yoxluğunda onu öz ümməti üzərində xəlifə təyin etdi:

**وقال موسى لأخيه هارون اخلفني في قومي**

**Musa qardaşı Haruna dedi: “Sən tayfam içində mənim xəlifəm ol”**[224]

Ancaq Samiri kütlənin yardımı ilə Harunu devirərək İsrailin idarəçisi kimi vəzifəyə oturdu:

**قال فإنا قد فتنا قومك من بعدك وأضلهم السامري**

**(Allah:) “Səndən sonra ümmətini imtahana çəkdik. Samiri onları yoldan çıxartdı”, - deyə buyurdu.**[225]

Həmçinin oxuyuruq:

**قال ابن أم إن القوم استضعفوني وكادوا يقتلونني**

**(Harun) dedi: “Ey anam oğlu! Bu tayfa məni zəif bilib az qala öldürəcəkdilər.**[226]

Baxmayaraq ki, Samiri hakimiyyəti ələ keçirmişdi, Harun yenə də İsrailin həqiqi xəlifəsi idi. İslamda sistem bu cür işləyir. Qanuniliyi güc yox, ilahi təyinat müəyyən edir. Allah Rəsulu (s) Quran və Əhli-beytini (ə) Qiyamət gününə qədər öz xəlifəsi təyin etmişdir.

---

[224] Əraf, 7:142
[225] Taha, 20:85
[226] Əraf, 7:150





Təsəvvür edin ki, dünyanın bütün müsəlmanları Quranın hökmünü inkar edirlər. Məgər bu onun xəlifəliyini qüvvədən salacaq? Əlbəttə ki, camaatın onun qəbul edib-etməməsindən asılı olmayaraq, onun ümmət üzərindəki xəlifəliyi davam edəcək. Eynilə də Əhli-beytin məsələsi. O, Allahın kitabı ilə birlikdə bəşəriyyətin xəlifələridirlər və kiminsə onlara itaət edib-etməməsindən asılı olmayaraq Qiyamət gününə qədər davam edəcəklər:

**وانهما لن يفترقا حتى يردا على الحوض**

**Həqiqətən, onlar Kövsər hovuzunun yanında mənə qovuşmayana qədər bir-birlərindən heç vaxt ayrılmayacaqlar.**

Şeyxul-İslamın digər xətası aşağıdakı iki cümlə barədəki çaşqınlığıdır:

- İslam güclüdür.
- Ümmət güclüdür.

Ona görə də belə deyir:

**وهذا تصديق ما أخبر به النبي صلى الله عليه و سلم حيث قال لا يزال هذا الدين عزيزا ما تولى اثنا عشر خليفة كلهم من قريش وهؤلاء الاثنا عشر خليفة هم المذكورون في التوراة حيث قال في بشارته بإسماعيل وسيلد اثنى عشر عظيما**

**ومن طن أن هؤلاء الاثنى عشر هم الذين تعتقد الرافضة إمامتهم فهو في غاية الجهل فإن هؤلاء ليس فيهم من كان له سيف إلا علي بن أبي طالب**

**Bu Peyğəmbərin (s) "Hamısı Qureyşdən olan 12 xəlifəyə qədər bu din hər zaman güclü olacaq" sözlərinin təsdiqidir. Bu 12 xəlifə Allahın Tövratda İsmayıl haqqında "O, 12 əzəmətli şəxsi dünyaya gətirəcək" - buyuraraq müjdələdiyi şəxslərdir. Bu 12 nəfərin rafizilər tərəfindən imam kimi qəbul edilən şəxslər olduğunu demək cahilliyin ən aşağı təbəqəsidir, çünki Əli ibn Əbi Talibdən başqa heç biri qoşun rəhbəri olmamışdır.**[227]

Görünür İbn Teymiyyə ümmətin gücünü onun dini ilə bərabər tutur. Halbuki, güclü İslama sahib olub eyni zamanda zəif ümmət olmaq tamamilə mümkün bir haldır. Ümmətin qüdrəti onun birliyində və hərbi şücaətindədir. Ancaq dinin qüdrəti isə onun yer üzündə "ayaqda qalmağında"dır. Bu digər hədisdə açıq-aşkar bildirilmişdir:

**لا يزال الدين قائما حتى تقوم الساعة أو يكون عليكم اثنا عشر خليفة كلهم من قريش**

[227] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.8, s.240-241





**Bu din Qiyamət gününə qədər, yaxud sizin üzərinizdə hamısı Qureyşdən olan 12 xəlifə olana qədər ayaqda duracaq.**[228]

Hər zaman İslamı məhv etməyə çalışan qüvvələr mövcud olmuşdur. Buna baxmayaraq, bu din heç vaxt süquta uğramayacaq və Qiyamət gününə qədər Yer üzündə var olacaq. İslam dininə son qoymağa çalışan düşmənlərin acizliyi onun məğlubedilməzliyidir. Bu, İmam Əhmədin (ö.241 h.q.) kitabında nəql edilən digər hədisdə əksini tapıb:

**حدثنا عبد الله حدثني أبي ثنا حماد بن أسامة ثنا مجالد عن عامر عن جابر بن سمرة السوائي قال سمعت رسول الله صلى الله عليه و سلم يقول في حجة الوداع إن هذا الدين لن يزال ظاهرا على من ناوأه لا يضره مخالف ولا مفارق حتى يمضى من أمتي اثنا عشر خليفة قال ثم تكلم بشيء لم أفهمه فقلت لأبي ما قال قال كلهم من قريش**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Həmmad ibn Usamə - Mucalid - Amir - Cabir ibn Səmurə əs-Suvai:**

**Vida Həccində Allah Rəsulunun (s) belə buyurduğunu eşitdim: "Ümmət arasında 12 xəlifə olduğu müddətdə, bu din ona qarşı çıxanlar üzərində hər zaman qalib olacaq və heç bir müxalif və ya xain ona ziyan verə bilməyəcək." Sonra elə bir şey dedi ki, mən başa düşmədim. Atama dedim: "O nə dedi?" Atam cavab verdi: "Onların hamısı Qureyşdən olacaq".**[229]

Əl-Ərnaut deyir:

**حديث صحيح**

**Səhih hədisdir.**[230]

Həmd olsun Allaha, Allah Rəsulundan (s) sonra dinimiz amansız düşmənlərin onu məhv etmək üçün həyata keçirdikləri aramsız hücumlara və təxribatçılıqlarına baxmayaraq, yer üzündə sabit qalmaqda davam edir. Maraqlıdır ki, İslam yer üzündə nəfəs aldığı müddətdə, Allah tərəfindən rəhbər və yolgöstərici kimi bəşəriyyət üçün təyin olunmuş və Hz.Muhəmmədin (s) nəslindən olan 12 xəlifədən biri aramızdadır.

Şeyxul-İslam İbn Teymiyyənin qarabasmalarının əksinə olaraq, ümmətin ilk xəlifəsi İmam Əli ibn Əbi Talib olmuşdur. İmam İbn Əbi Asim (ö.287 h.q.) yazır:

ثنا محمد بن المثنى، حدثنا يحي بن حماد، عن أبي عوانة، عن يحيى بن سليم أبي بلج عن عمرو بن ميمون، عن ابن عباس قال: قال رسول الله صلى الله عليه وسلم لعلي: أنت مني بمنزلة هارون من موسى إلا أنك لست نبيا وأنت خليفتي في كل مؤمن من بعدي.

[228] Müslim ibn əl-Həccac, əs-Səhih, c.3, s.1453, №1822 (10)
[229] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.87, №20833
[230] Həmin mənbə





**Muhəmməd ibn əl-Musənna - Yəhya ibn Həmmad - Əbu Əvanə - Yəhya ibn Suleym Əbu Bəlc - Əmr ibn Məymun - İbn Abbas:**

**Allah Rəsulu (s) Əliyə dedi: "Sənin mənə olan nisbətin Harunun Musaya olan nisbəti kimidir, bir fərqlə ki, sən peyğəmbər deyilsən. Sən məndən sonra hər bir mömin üzərində mənim xəlifəmsən."[231]**

Dr. əl-Cəvabirə deyir:

**اسناده حسن.**

**Sənədi həsəndir.[232]**

Əllamə əl-Əlbani (ö.1420 h.q.) də ona dəstək verir:

**إسناده حسن**

**Sənədi həsəndir.[233]**

Burada həssas bir sual meydana gəlir: İmam Əli (ə) Hz.Muhəmmədin (s) nəslindən idimi?

Cavab sadədir: bəzi hallarda şəxs və ya əşyalar müəyyən məqsədlər üçün yad kateqoriyaya daxil edilə bilər. Məsələn, İblis Allah tərəfindən mələklər arasında sadalanmışdır ki, onun əmrilə Hz.Adəmə (ə) səcdə etsinlər.[234] Halbuki, o sadəcə cinlərdən biri idi.[235] Beləliklə, İlahi Əmrin məqsədinə uyğun olaraq, İblis mələk olmadığı halda, mələklərdən hesab edilmişdir.

Eyni vəziyyət İbrahim peyğəmbərlə (ə) Lut peyğəmbər (ə) arasında da var:

**وتلك حجتنا آتيناها إبراهيم على قومه نرفع درجات من نشاء إن ربك حكيم عليم وهبنا له إسحاق ويعقوب كلا هدينا ونوحا هدينا من قبل ومن ذريته داوود وسليمان وأيوب ويوسف وموسى وهارون وكذلك نجزي المحسنين وزكريا ويحيى وعيسى وإلياس كل من الصالحين وإسماعيل واليسع ويونس ولوطا وكلا فضلنا على العالمين**

**Bu, bizim İbrahimə öz tayfasına qarşı verdiyimiz dəlildir. Biz istədiyimiz şəxsi dərəcə-dərəcə yüksəldərik. Şübhəsiz ki, Rəbbin hikmət sahibi, elm sahibidir. Biz İshaqı və Yəqubu Ona əta etdik. Onların hər birini hidayətə (peyğəmbərliyə) çatdırdıq. Bundan əvvəl Nuhu və onun nəslindən olan Davudu, Süleymanı, Əyyubu, Yusifi, Musanı və Harunu da hidayətə qovuşdurmuşduq. Biz yaxşı iş görənləri (yaxşılıq edənləri) belə mükafatlandırırıq. Zəkəriyyanı, Yəhyanı, İsanı, İlyası da (hidayətə çatdırdıq). Onların hamısı əməlisalehlərdən idi. Biz, həmçinin İsmaili, Əlyəsəi, Yunisi və**

[231] Əbu Bəkr ibn Əbi Asim, Kitabus-sunnə, c.1, s.799-800, №1222
[232] Həmin mənbə
[233] Əbu Bəkr ibn Əbi Asim, Kitabus-sunnə, c.2, s.565, №1188
[234] Bax: Bəqərə, 2:34; Əraf 7:11; İsra, 17:61; Kəhf, 18:50; Ta Ha, 20:116; Sad, 38:71-74
[235] Bax: Kəhf, 18:50





**Lutu da (hidayətə qovuşdurduq) və onları aləmlərdən (özləri ilə bir dövrdə yaşayan bütün insanlardan) üstün tutduq.[236]**

Əl-Hafiz İbn Kəsir (ö.774 h.q.) yazır:

**فالضمير في قوله ومن ذريته عائد على إبراهيم على المشهور. ولوط وإن كان ابن أخيه إلا أنه دخل في الذرية تغليبا. وهذا هو الحامل للقائل الآخر إن الضمير على نوح كما قدمنا في قصته والله أعلم.**

**Məşhurun nəzərinə görə, Allahın "və min zürriyyətihi" ("onun nəslindən olan") sözündə zəmir İbrahimə aiddir. Lut isə İbrahimin qardaşı oğlu olsa da, burada "təğlib" (azın çoxa tabe olması) yolu ilə onun zürriyyətinə daxil edilmişdir. Bu isə zəmirin Nuha aid olması barədə ikinci görüşün tərəfdarları üçün problemdir. Biz bunu daha əvvəl onun qissəsində izah etmişdik. Allah daha yaxşısını bilir. [237]**

İmam əl-Qurtubi (ö.671 h.q.) də buna uyğun söz demişdir:

**{ومن ذريته} أي ذرية إبراهيم .وقيل: من ذرية نوح، قاله الفراء وأختاره الطبري وغير واحد من المفسرين كالقشيري وابن عطية وغيرهما .والأول قاله الزجاج، واعترض بأنه عد من هذه الذرية يونس ولوط وما كانا من ذرية إبراهيم .وكان لوط ابن أخيه .وقيل :ابن أخته .وقال ابن عباس :هؤلاء الأنبياء جميعا مضافون إلى ذرية إبراهيم، وإن كان فيهم من لم تلحقه ولادة من جهته من جهة أب ولا أم، لأن لوطا ابن أخي إبراهيم .والعرب تجعل العم أبا كما أخبر {الله عن ولد يعقوب أنهم قالوا نعبد إلهك وإله آبائك إبراهيم وإسماعيل وإسحاق} وإسماعيل عم يعقوب. وعد عيسى من ذرية إبراهيم وإنما هو ابن البنت. فأولاد فاطمة رضي الله عنها ذرية النبي صلى الله عليه وسلم.**

**"Və onun nəslindən", yəni İbrahimin nəslindən. Həmçinin Nuhun nəslindən olması da deyilmişdir. Bunu əl-Fərra demiş, Təbəri, o cümlədən əl-Quşeyri, İbn Ətiyyə və digərləri kimi bir çox təfsirçi tərəfindən də mənimsənilmişdir. Əz-Zəccac birinci fikri qəbul etmişdir, ancaq ona Yunus və Lutun da onun nəslindən gələnlər arasında zikr edildiyini deyərək etiraz edilmişdir. Belə ki, heç biri İbrahimin nəslindən deyildi. Lut onun qardaşı oğlu idi. Bacısı oğlu olduğu da deyilmişdir.**

**İbn Abbas dedi: "Bütün bu peyğəmbərlər arasında İbrahim tərəfdən bir ata, yaxud ana yoluyla qohumluğu olmayan şəxslər mövcud olsa da, onlar onun (İbrahimin) nəslindən sayılırlar. Ona görə ki, Lut İbrahimin qardaşı oğludur." Ərəblər əmiyə də ata deyirlər. Necə ki, Allah Yaqubun övladlarının ona (Yaquba) dediklərini bu cür xəbər vermişdir: *"Sənin Allahına və ataların – İbrahimin, İsmailin və İshaqın Allahı olan tək Allaha təslim olacağıq" (Bəqərə, 133)*. İsmayıl isə Yaqubun əmisidir. Həmçinin, İsa da İbrahimin nəslindən gələn qızının oğlu olduğuna**

[236] Ənam, 6:83-86
[237] İbn Kəsir əd-Diməşqi, əl-Bidayə vən-nihayə, c.1, s.192





**baxmayaraq, onun nəsli arasında sayılmışdır. Ona görə də Fatimənin (r.a) övladları da Peyğəmbərin (s) nəslidirlər.[238]**

Beləliklə, Lut bəzi xüsusi səbəblərə - böyük ehtimalla peyğəmbərliyə - görə İbrahimin nəsli arasında sayılmışdır. Eynilə də bu hədis xilafət və imamətin xüsusi məqsədləri üçün Hz.Əlini (ə) Hz.Muhəmmədin (s) nəsli arasında sayır.

**أنت خليفتي في كل مؤمن من بعدي**

**Sən məndən sonra hər bir mömin üzərində mənim xəlifəmsən.**

[238] Muhəmməd ibn Əhməd əl-Qurtubi, əl-Cami li-əhkamul-Quran, c.7, s.31





Ərəfat və Qədir-Xumda, o cümlədən digər məkanlarda camaat qarşısında etdiyi xütbələrdən sonra Allah Rəsulu (s) qərara gəlir ki, mübarək ömrünün son günlərində hər bir şeyi yazılı şəkildə qoyub getsin. İmam əl-Buxari (ö.256 h.q.) Peyğəmbərin (s) bu istəyinin qarşısının necə alındığı barədə yazır:

**حدثنا قبيصة حدثنا ابن عيينة عن سليمان الأحول عن سعيد ابن جبير عن ابن عباس رضي الله عنهما أنه قال يوم الخميس وما يوم الخميس ثم بكى حتى خضب دمعه الحصباء فقال :اشتد برسول الله صلى الله عليه و سلم وجعه يوم الخميس فقال ائتوني بكتاب أكتب لكم كتابا لن تضلوا بعده أبدا . فتنازعوا ولا ينبغي عند نبي تنازع فقالوا هجر رسول الله صلى الله عليه و سلم قال دعوني فالذي أنا فيه خير مما تدعونني إليه . وأوصى عند موته بثلاث :أخرجوا المشركين من جزيرة العرب وأجيزوا الوفد بنحو ما كنت أجيزهم .ونسيت الثالثة**

**Qubeysə - İbn Uyeynə - Suleyman əl-Əhval - Səid ibn Cubeyr - İbn Abbas (r.a):**

**"Cümə axşamı! Necə bir cümə axşamı idi o!" - dedi və sonra yerdəki çınqıl daşları islanana qədər ağladı. Sonra dedi: Allah Rəsulunun (s) səhhəti cümə axşamı günü ağırlaşmışdı. O buyurdu: "Mənə yazmağa bir şey gətirin ki, ondan sonra yolunuzu heç vaxt azmayacağınız bir şey yazım." Orada yığışanlar (kağızı gətirib-gətirməmək barədə) mübahisə etdilər. (Peyğəmbər) buyurdu: "Heç bir peyğəmbər hüzurunda mübahisə etmək yaraşan iş deyil." Onlar dedilər: "Allah Rəsulu (s) sayıqlayır." (Peyğəmbər) dedi: "Mənim yanımdan çıxın. İndiki vəziyyətim sizin məni dəvət etdiyiniz şeylərdən daha xeyirlidi." Sonra o vəfat edərkən üç şey vəsiyyət etdi: "Müşrikləri Ərəbistan yarımadasından çıxarın; mənim etdiyim kimi siz də xarici qonaqlara hədiyyə verərək hörmət göstərin; üçüncüsünü unutmuşam."[239]**

Dr. əl-Bəğa səhabələrin peyğəmbərə (s) söylədikləri sözün izahında yazır:

**(هجر) أي يتكلم بما لا يعرف لشدة وجعه**

**"Həcərə" - yəni, xəstəliyi ağırlaşdığı üçün o, nə danışdığını bilmir.[240]**

İmam Müslim (ö.261 h.q.) həmçinin yazır:

**حدثنا إسحاق بن إبراهيم أخبرنا وكيع عن مالك بن مغول عن طلحة بن مصرف عن سعيد بن جبير عن ابن عباس أنه قال يوم الخميس وما يوم الخميس ثم جعل تسيل دموعه حتى رأيت على خديه كأنها نظام اللؤلؤ قال قال رسول الله صلى الله عليه و سلم ائتوني بالكتف والدواة أو اللوح والدواة أكتب لكم كتابا لن تضلوا بعده أبدا فقالوا إن رسول الله صلى الله عليه و سلم يهجر**

**İshaq ibn İbrahim - Vəki - Malik ibn Məğvəl - Təlhə ibn Musərrif - Səid ibn Cubeyr - İbn Abbas:**

**"Cümə axşamı! Necə bir cümə axşamı idi o!" - dedi və sonra göz yaşları axmağa başladı. Hətta göz yaşlarını yanaqları üzərində gördüm, sanki mirvari dənələri idi. Allah Rəsulu (s) buyurdu: "Mənə kürək sümüyü və qələm, yaxud lövhə və qələm gətirin. Sizə elə bir namə**

[239] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.3, s.1111, №2888
[240] Həmin mənbə





**yazacağam ki, ondan sonra yolunuzu heç vaxt azmayacaqsınız." Onlar dedilər: "Allah Rəsulu (s) sayıqlayır."[241]**

İmam Əhmədin (ö.241 h.q.) kitabında da bu rəvayət nəql edilmişdir:

**حدثنا عبد الله حدثني أبى ثنا سفيان عن سليمان بن أبى مسلم خال بن أبى نجيح سمع سعيد بن جبير يقول قال بن عباس يوم الخميس وما يوم الخميس ثم بكى حتى بل دمعه وقال مرة دموعه الحصى قلنا يا أبا العباس وما يوم الخميس قال اشتد برسول الله صلى الله عليه و سلم وجعه فقال ائتوني اكتب لكم كتابا لا تضلوا بعده أبدا فتنازعوا ولا ينبغي عند نبي تنازع فقالوا ما شأنه اهجر قال سفيان يعنى هذى**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Süfyan - İsmayıl ibn Əbi Müslim (İbn Əbi Nacihin əmisi) - Səid ibn Cubeyr - İbn Abbas:**

**"Cümə axşamı! Necə bir cümə axşamı idi o!" - dedi və sonra yerdəki çınqıl daşları islanana qədər ağladı. Biz dedik: "Ey Əbül-Abbas! Cümə axşamı nə məsələdi?" O cavab verdi: "Allah Rəsulunun (s) xəstəliyi ağırlaşmışdı. O zaman belə buyurdu: "Yanıma gəlin, sizə elə bir namə yazım ki, ondan sonra yolunuzu heç vaxt azmayasınız." Ancaq oradakıları mübahisə etdilər, halbuki peyğəmbər qaşısında mübahisə etmək yaraşan iş deyil. Sonra onlar dedilər: "Ona nə olub ki, belə sayıqlayır?" Süfyan (səhabələrin işlətdiyi söz barədə) dedi: yəni, nə gəldi danışır.[242]**

Əl-Ərnaut deyir:

**إسناده صحيح على شرط الشيخين**

**Sənədi iki şeyxin şərtlərinə əsasən səhihdir.[243]**

İmam əl-Buxaridən daha bir hədisə diqqət yetirək:

**حدثنا محمد حدثنا ابن عيينة عن سليمان الأحول سمع سعيد ابن جبير سمع ابن عباس رضي الله عنهما يقول : يوم الخميس وما يوم الخميس ثم بكى حتى بل دمعه الحصى قلت يا أبا عباس ما يوم الخميس؟ قال اشتد برسول الله صلى الله عليه و سلم وجعه فقال ائتوني بكتف أكتب لكم كتابا لا تضلوا بعده أبدا .فتنازعوا ولا ينبغي عند نبي تنازع فقالوا ما له أهجر استفهموه فقال ذروني فالذي أنا فيه خير مما تدعونني إليه .فأمرهم بثلاث قال أخرجوا المشركين من جزيرة العرب وأجيزوا الوفد بنحو ما كنت أجيزهم .والثالثة خير إما أن سكتن عنها وإما أن قالها فنسيتها .قال سفيان هذا من قول سليمان**

**Muhəmməd - İbn Uyeynə - Süleyman əl-Əhval - İbn Cubeyr - İbn Abbas (r.a):**

**"Cümə axşamı! Necə bir cümə axşamı idi o!" - dedi və sonra yerdəki çınqıl daşları islanana qədər ağladı. Biz dedik: "Ey Əbül-Abbas! Cümə axşamı nə məsələdi?" O cavab verdi: "Allah Rəsulunun (s) xəstəliyi ağırlaşmışdı. O zaman belə buyurdu: "Mənə kürək sümüyü gətirin. Sizə elə bir namə yazacağam ki, ondan sonra yolunuzu heç vaxt azmayacaqsınız." Orada yığışanlar (kağızı gətirib-gətirməmək barədə) mübahisə etdilər, halbuki peyğəmbərin hüzurunda mübahisə etmək yaraşan iş deyil. Onlar dedilər: "Ona nə olub ki, belə sayıqlayır? Dəqiqləşdirmək üçün (bir**

[241] Müslim ibn əl-Həccac, əs-Səhih, c.3, s.1257, №1637 (21)
[242] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.1, s.222, №1935
[243] Həmin mənbə





**daha) soruşaq." (Peyğəmbər) dedi: "Mənim yanımdan çıxın. İndiki vəziyyətim sizin məni dəvət etdiyiniz şeylərdən daha xeyirlidi." Sonra o vəfat edərkən üç şey vəsiyyət etdi: "Müşrikləri Ərəbistan yarımadasından çıxarın; mənim etdiyim kimi siz də xarici qonaqlara hədiyyə verərək hörmət göstərin; üçüncüsü ən yaxşısı idi. O bu barədə ya sükut etdi, ya da dedi, sadəcə mən unutmuşam." Süfyan dedi: "Bu, Sülyamanın dediklərindən idi."**[244]

Bu elə bir müsibətli gün idi ki, İbn Abbas (r.a) onu xatırlayarkən hönkür-hönkür ağlayırdı. Bu həmin gün idi ki, səhabələr Hz.Peyğəmbərin (s) mübarək hüzurunda onun sayıqladığını deyir, anlaşılmaz sözlər danışdığını iddia edirdilər! Tez-tez şahidi oluruq ki, əhli-sünnə qardaşlarımız peyğəmbərə qarşı deyilən "həcərə" (هجر) və "əhəcərə" (أهجر) sözlərini var gücləri ilə yanlış tərcümə və şərh etməyə çalışıraraq, "huşunu itirdi", "özündən getdi" kimi mənalarla təqdim etməyə cəhd edirlər. Halbuki, onların ən qədim böyük alimlərindən olan Süfyan ibn Uyeynə (ö.198 h.q.) bütün qapıları üzlərinə bağlamışdır. O, tam səmimi şəkildə bildirir ki, səhabələr peyğəmbərin (s) sayıqladığını nəzərdə tuturdular. Bu məsələ digər klassik əhli-sünnə alimləri tərəfindən də təsdiqini tapmışdır. Məsələn, İmam əş-Şami (ö.942 h.q.) yazır:

**الهجر :بالضم :الهذيان وقول الباطل ويطلق على الكلام الفاحش.**

**Əl-Hucr: sayıqlama və məntiqsiz (ağılsız) danışmaq. Həmçinin, ədəbsiz danışığa da aid edilmişdir.**[245]

Qədim əhli-sünnə dilçi alimi İbn Mənzur (ö.711 h.q.) yazır:

**والهجر :الهذيان.**

**Əl-Hucr: sayıqlamaq.**[246]

Qədim və öndəgələn hədis alimlərin olan İmam İbn Səlam (ö.224 h.q.) bu fikri təsdiqləyir:

**وأما الهجر في الكلام فإنه الهذيان**

**Cümlədə işlənən "əl-hucr" sözü isə sayıqlamaq deməkdir.**[247]

Əl-Hafiz İbn Həcər əl-Əsqəlani (ö.852 h.q.) də fərqli bir söz deməmişdir:

**والهجر بالضم ثم السكون الهذيان**

**Əl-Hucr - sayıqlamaqdır.**[248]

[244] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.3, s.1155, №2997
[245] Muhəmməd ibn Yusif əs-Salihi əş-Şami, Subulul-huda, c.11, s.105
[246] İbn Mənzur əl-Misri, Lisanul-ərəb, c.5, s.250
[247] Əbu Ubeyd əl-Hərəvi, Ğəribul-hədis, c.2, s.64





Bu məqamda biz səhabələr tərəfindən istifadə edilən ikinci söz - "əhcərə" (أهجر) barədə danışmaq istəyirik. Süfyan ibn Üyeynənin də qeyd etdiyi kimi, bu söz "ağzına gələni danışmaq", "sayıqlamaq" deməkdir. Bununla belə, onun ikinci bir mənası da var. İmam İbn Səlam yazır:

**قال الكسائي وبعضه عن الأصمعي وغيرهما: قال: الهجر الإفحاش في المنطق والخنا ونحوه، يقال منه :أهجر الرجل يهجر إهجارا**

**Əl-Kisai, həmçinin bəzilərinin nəql etdiklərinə görə əl-Əsmai və digərləri deyirlər: əl-hucr - ədəbsiz (nalayiq) sözlər demək, kobud və buna bənzər sözlər işlətməkdir. Bu sözdən belə deyilmişdir: "əhcərə ər-rəcul yəhcuru icharən"[249]**

Deməli, kiminsə əxlaqsız söz deməsi, kobud ifadələr işlətməsini bildirmək üçün ya "əhcərə", ya da "yəhcur" sözlərindən istifadə etmək lazımdır. Maraqlıdır ki, hər iki söz səhabələr tərəfindən peyğəmbərə qarşı ünvanlanmışdır:

**فقالوا إن رسول الله صلى الله عليه و سلم يهجر**

**Dedilər: "Allah Rəsulu (s) sayıqlayır (yəhcur)".**

Həmçinin:

**فقالوا ما له أهجر**

**Dedilər: "Ona nə olub ki, belə sayıqlayır (əhcərə)?"**

Biz hər iki sözü İbn Uyeynənin izahını əsas alaraq, "sayıqlamaq" kimi tərcümə etmişik. Ancaq tərcümə bu cür də ola bilərdi:

**فقالوا إن رسول الله صلى الله عليه و سلم يهجر**

**Dedilər: "Allah Rəsulu (s) nalayiq sözlər danışır (yəhcur)".**

Həmçinin:

**فقالوا ما له أهجر**

**Dedilər: "Ona nə olub ki, nalayiq sözlər danışır (əhcərə)?"**

Məsələn, Qazi İyaz (ö.544 h.q.) "əhcərə" sözünün hər iki mənasını açıqlamış və hətta bu zaman sözügedən hədisə də istinad etmişdir:

**يقال اهجر الرجل إذا قال الفحش وقوله اهجر رسول الله صلى الله عليه وسلم كذا هو الصحيح بفتح الهاء أي هذي والهجر الهذيان**

---

248 İbn Həcər əl-Əsqəlani, Fəthul-bari şərh Səhihul-Buxari, c.8, s.101
249 Əbu Ubeyd əl-Hərəvi, Ğəribul-hədis, c.2, s.63





**Şəxs nalayiq sözlər danışdıqda "əhcərə rəcul" deyilir. Onun "əhcərə Rasulullah - sallallahu əleyhi və səlləm"** ***("Ha"nın fəthə ilə oxunması (yəni, "ə həcərə"[250]) da düzgün versiyadır)*** **ifadəsi o deməkdir ki, o sayıqlayır. Əl-Hucr sayıqlamaq deməkdir.[251]**

Əbu Ubeyd əl-Bəkri də eyni fikirdədir:

**الهجر :القبيح من الكلام، يقال] منه :[أهجر، إذا أفحش وقال ما يقبح، ويقال هجر في منامه إذا تكلم بما لا يعقل، ويقال هجر المريض وأهجر إذا هذى .وقال ابن عباس: اشتد برسول الله عليه الصلاة والسلام وجعه فقال: ايتوني بكتاب أكتب لكم لا تضلوا بعدي فقالوا: ما شأنه أهجر**

**Əl-Hucr - danışarkən nalayiq sözlər işlətməkdir. Buradan deyilmişdir: ədəbsiz sözlər danışanda "əhcərə" işlədilir. Həmçinin, yuxuda başa düşülməyən ifadələr söyləyəndə belə deyilir: "Yuxuda sayıqladı ". Xəstə insan sayıqlayarkən onun üçün də "həcərə" və ya "əhcərə" istifadə edilməsi deyilmişdir. İbn Abbas deyib: "Allah Rəsulunun xəstəliyi ağırlaşmışdı. O zaman belə buyurdu: "Mənə kağız gətirin. Sizə elə bir şey yazacağam ki, ondan sonra yolunuzu heç vaxt azmayacaqsınız." Ancaq onlar dedilər: "Ona nə olub ki, belə sayıqlayır (əhcərə)?"[252]**

Hər bir halda hansını götürsək mənası eyni çıxır. Səhabələr peyğəmbərin sayıqladığını qəbul etməsəydilər, onun nalayiq sözlər işlətdiyini deməzdilər. Hətta ikinci məna, yəni nalayiq sözlər danışmaq daha ağır bir ittihamdır.

İmam İbn Cərir ət-Təbəri (ö.310 h.q.) həmçinin yazır:

**من قولهم :أهجر الرجل: إذا أفحش في القول.**

**Şəxs ədəbsiz sözlər işlədəndə "əhcərə ər-rəcul" deyilir.[253]**

Tanınmış klassik dilşünas alim İbn Faris (ö.395 h.q.) yazır:

**الهجر :الهذيان .يقال هجر الرجل. والهجر: الإفحاش في المنطق يقال. أهجر الرجل في منطقه.**

**Əl-Hucr - sayıqlamaq deməkdir. (Şəxsin sayıqladığını nəzərdə tutanda) belə deyirlər: "həcərə ər-rəcul". Əl-Hucr həmçinin nalayiq sözlər danışmaqdır. (Şəxsin ədəbsiz sözlər işlətdiyini nəzərdə tutanda) belə deyilir: "əhcərə ər-rəcul fi məntiqihi".[254]**

Alimlərin izahlarından belə başa düşülür ki, səhabələr Peyğəmbəri (s) "əl-hucr" sözünün hər iki mənasında ittiham ediblər:

**قالوا هجر رسول الله صلى الله عليه و سلم**

**Dedilər: "Allah Rəsulu (s) sayıqlayır (həcərə)".**

[250] "Ə həcərə" oxunduqda, məna belə olacaq: "O sayıqlayır?" Çünki bu zaman sözün əvvəlindəki həmzə sual ədatı funksiyasını yerinə yetirmiş olacaq. (red.)
[251] Əl-Qazi İyad ibn Musa əl-Maliki, Məşariqul-ənvar əla sihahul-asar, c.2, s.529
[252] Əbu Ubeyd əl-Bəkri, Fəslul-məqal şərhu kitabul-əmsal, c.1, s.28
[253] Muhəmməd ibn Cərir ət-Təbəri, Camiul-bəyan fi təvilul-Quran, c.18, s.54
[254] Əbu əl-Hüseyn Əhməd ibn Faris ibn Zəkəriyyə, Mucəm məqayis əl-luğə, c.6, s.35





Həmçinin:

**فقالوا إن رسول الله صلى الله عليه و سلم يهجر**

**Dedilər: "Allah Rəsulu (s) nalayiq sözlər danışır (yəhcur)".**

Həmçinin:

**فقالوا ما له أهجر**

**Dedilər: "Ona nə olub ki, belə sayıqlayır (əhcərə)?"**

Nəhayət:

**فقالوا ما له أهجر**

**Dedilər: "Ona nə olub ki, nalayiq sözlər danışır (əhcərə)?"**

Bəs necə oldu ki, vəziyyət bu yerə gəlib çatdı? Bu dəhşətli mənzərə necə yarandı? Nə üçün həmin səhabələr Peyğəmbərin (s) sadə bir xahişini eşitdikdən sonra bu cür pis reaksiya verdilər? İmam əl-Buxari bu suala qismən işıq tutan rəvayəti belə nəql edir:

**حدثنا إبراهيم بن موسى أخبرنا هشام عن معمر عن الزهري عن عبيد الله بن عبد الله عن ابن عباس قال :لما حضر النبي صلى الله عليه و سلم قال وفي البيت رجال فيهم عمر بن الخطاب قال هلم أكتب لكم كتابا لن تضلوا بعده .قال عمر إن النبي صلى الله عليه و سلم غلبه الوجع وعندكم القرآن .فحسبنا كتاب الله .واختلف أهل البيت اختصموا فمنهم من يقول قربوا يكتب لكم رسول الله صلى الله عليه و سلم كتابا لن تضلوا بعده ومنهم من يقول ما قال عمر فلما أكثروا اللغط والاختلاف عند النبي صلى الله عليه و سلم قال قوموا عني قال عبيد الله فكان ابن عباس يقول إن الرزية كل الرزية ما حال بين رسول الله صلى الله عليه و سلم وبين أن يكتب لهم ذلك الكتاب من اختلافهم ولغطهم**

**İbrahim ibn Musa - Hişam - Muamər - əz-Zuhri - Ubeydullah ibn Abdullah - İbn Abbas:**

**Peyğəmbərin (s) vəfatı yaxınlaşdıqda aralarında Ömər ibn əl-Xəttabın da olduğu bir qrup şəxs otaqda idilər. O (Peyğəmbər) dedi: "Yaxın gəlin, sizə elə bir şey yazım ki, ondan sonra heç bir zaman azmayasınız." Ömər dedi: "Xəstəlik Peyğəmbərə güc gəldi. Bizim Quranımız var. Allahın kitabı bizə kifayətdir."**

**Otaqdakılar bir-birləriylə mübahisə etməyə başladılar. Bəziləri deyirdilər ki: "Yaxına gəlin, Peyğəmbər sizə elə bir şey yazsın ki, ondan sonra heç bir zaman azmayasınız. Bəziləri isə Ömərin dediklərini təkrar edirdilər. Onlar Peyğəmər yanında səs-küy və mübahisəni artırdıqda, Peyğəmbər (s) buyurdu: "Qalxın, buranı tərk edin."**

**Ubeydullah dedi: İbn Abbas deyərdi: "Bu elə bir müsibət idi ki, onların mübahisə və səs-küyləri Allah Rəsulunun (s) onlar üçün yazı yazmağına mane oldu."[255]**

[255] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.6, s.2680, №6932





Deməli, hər şey Ömər tərəfindən başladılmışdı. O, Allah Rəsulunun (s) xəstəlik qarşısında məğlub olduğunu deyirdi. Başqa sözlə desək, bu xəstəlik Peyğəmbəri ələ alaraq idarə edir, fikirlərinə, eşitdiklərinə, gördüklərinə və əməllərinə diktə edirdi. Peyğəmbər (s) artıq öz beyninə, hisslərinə və bədəninə hökm edə bilmirdi. Otaqdakı hay-küyə səbəb məhz bu ağır ittiham idi. Peyğəmbərin (s) sayıqladığını deyənlər isə sadəcə olaraq Ömərin dediklərini təkrar edirdilər. Şeyxul-İslam İbn Teymiyyə (ö.728 h.q.) Ömərin qarşılaşdığı dilemmanı belə izah edir:

**وأما عمر فاشتبه عليه هل كان قول النبي صلى الله عليه و سلم من شدة المرض أو كان من أقواله المعروفة والمرض جائز على الأنبياء ولهذا قال ماله أهجر فشك في ذلك ولم يجزم بأنه هجر والشك جائز على عمر فإنه لا معصوم إلا النبي صلى الله عليه و سلم لا سيما وقد شك بشبهة فإن النبي صلى الله عليه و سلم كان مريضا فلم يدر أكلامه كان من وهج المرض كما يعرض للمريض أو كان من كلامه المعروف الذي يجب قبوله**

**Ömərə gəldikdə isə o, Peyğəmbərin (s) sözləri barədə çaşqınlığa düşərək, onun dediklərinin xəstəliyin güclənməsi səbəbindən sayıqlama, yoxsa onun adi həmişəki (əməl edilməsi vacib olan) sözlərindən olmasını ayırd edə bilmirdi Şübhəsiz, Peyğəmbərlərə də xəstəlik üz verir. Buna görə də o (Ömər) soruşdu: “Ona nə olub? Sayıqlayır?” O (Ömər), bu barədə şübhəyə düşdü və sayıqladığını birbaşa demədi.[256] Şübhəyə düşmək Ömər üçün mümkünsüz hal deyil, çünki məsumiyyət yalnız Peyğəmbərlərə məxsusdur. Nəzərə alaq ki, o, qeyri-müəyyənlik səbəbi ilə şübhəyə düşmüşdü, çünki Peyğəmbər (s) xəstə idi. O bilmirdi ki, Peyğəmbər (s)-in danışığı xəstə insanlarda olduğu kimi xəstəliyin şiddətindən təsirlənib, yoxsa qəbul edilməsi vacib olan öz danışığıdır.[257]**

İbn Teymiyyə bəzi məsələləri yanlış çatdırmışdır. Birincisi və ən əsası, Ömər öz ifadələrində şəkk etmirdi. O, tamamilə məqsədli, aşkar və qəti idi:

**قال عمر إن النبي صلى الله عليه و سلم غلبه الوجع وعندكم القرآن .فحسبنا كتاب الله**

**Ömər dedi: "Xəstəlik Peyğəmbərə güc gəldi. Bizim Quranımız var. Allahın kitabı bizə kifayətdir."**

İkincisi, İbn Teymiyyə Ömər barədə deyir ki:

**ولهذا قال ماله أهجر فشك في ذلك ولم يجزم بأنه هجر**

**Buna görə də o (Ömər) soruşdu: “Ona nə olub? Sayıqlayır?” O (Ömər), bu barədə şübhəyə düşdü və sayıqladığını birbaşa demədi.**

Halbuki, bu sözləri Ömər deməmişdi:

---

[256] Yəni, oradakılardan sayıqlayıb-sayıqlamadığını soruşdu.
[257] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.6, s.24





**وقالوا ما شأنه؟ أهجر استفهموه**

**Sonra onlar dedilər: "Ona nə olub ki, belə sayıqlayır?" Dəqiqləşdirmək üçün (bir daha) soruşaq.**

Bu sözü oradakı digər səhabələr deyirlər. Ömərin dediklərinin mübahisəyə belə ehtiyacı yoxdur. O açıq şəkildə bildirmişdir ki, Allah Rəsulu (s) xəstəliyi səbəbilə beyni və hissləri də daxil olmaqla özünü tamamilə itirib. O, bu barədə şübhə içində deyildi, əksinə qəti şəkildə əminlik nümayiş etdirirdi. Əslində, Ömərin açıq şəkildə və vurğulayaraq Peyğəmbərin (s) əmrinə qarşı çıxması onun "Peyğəmbər sayıqlayır" inancında olmasını sübut etməyə kifayət edir. Bununla belə, İbn Teymiyyə yazır:

**فلم يدر أكلامه كان من وهج المرض كما يعرض للمريض أو كان من كلامه المعروف الذي يجب قبوله**

**O bilmirdi ki, Peyğəmbər (s)-in danışığı xəstə insanlarda olduğu kimi xəstəliyin şiddətindən təsirlənib, yoxsa qəbul edilməsi vacib olan öz danışığıdır.**

Əgər o, Peyğəmbərin şüurlu şəkildə danışdığını qəbul etsəydi, o zaman tabe olardı. Ancaq o, əmrə qarşı çıxdı. Deməli, Ömər Allah Rəsulunun (s) xəstəliyi səbəbilə şüursuz şəkildə danışdığını və ya sayıqladığını düşünürdü.

O zaman biz sual veririk: Peyğəmbərin (s) səhabələrinə verdiyi tapşırığın hansı hissəsində "şüursuz" deyilə biləcək ifadələr var ki, onların Peyğəmbər (s) barədə dediklərinə haqq qazandıra bilsin? Onun sözləri tamamilə ağıllı, məntiqli və ağlabatan idi.

**ائتوني بكتاب أكتب لكم كتابا لن تضلوا بعده أبدا**

**Mənə yazmağa bir şey gətirin ki, ondan sonra yolunuzu heç vaxt azmayacağınız bir şey yazım.**[258]

Milyonlarla müsəlman, xüsusən də əhli-sünnədən olan müsəlmanlar inanırlar ki, Peyğəmbər (s) ömür boyu yazıb-oxumaq bilməyib. Onların bu cür düşünmələrinə səbəb Qurani-Kərimdə keçən "Ümmi Peyğəmbər" ifadəsidir:

**وما كنت تتلو من قبله من كتاب ولا تخطه بيمينك إذا لارتاب المبطلون**

[258] Burada müəllif şiəliyi qəbul edəndən bir neçə ay sonra 2007-ci ilin əvvəllərində baş vermiş bir hadisəni oxucuların diqqətinə çatdırmağı lazım bilir. Həmin vaxt o, Ömər və dostlarının Peyğəmbərin (s) ruhi sağlıq vəziyyətini sual altına aldıqları rəvayətləri araşdırırdı. Müəllif əhli-sünnənin sufi qoluna mənsub dostundan bu barədə nə düşündüyünü soruşur. Dostu cavabından deyir: "Əlbəttə ki, bu baş verib. Onların buna əsasları var idi! Peyğəmbər yazıb-oxumağı bilmirdi. Qurani-Kərimin də bildirdiyi kimi, o, ümmi idi. Buna baxmayaraq, o, yazmaq üçün kağız və qələm istəyirdi!" Müəllif təəccüb içində idi. Dostundan soruşur: "Sən demək istəyirsən ki, Peyğəmbər həqiqətən sayıqlayırdı?" Qəribədir ki, dostu bu suala birbaşa cavab verməkdən yayınır. Bu çox mənasız bir hərəkət idi. Əgər Peyğəmbərin (s) ruhi cəhətdən sağlam olduğuna inanırdısa, bunu cavabında bildirə bilərdi. Ancaq sakit durmaqla, müəllifin sualına səssiz "hə" cavabını vermiş oldu.





**(Ya Rəsulum!) Sən bundan (bu Qurandan) əvvəl nə bir kitab oxumusan, nə də onu əlinlə yazmısan. Əgər belə olsaydı, onda batilə uyanlar (onun barəsində) şəkk-şübhəyə düşərdilər (Onu hardansa oxuyub öyrənmişdir, deyərdilər).**[259]

Əvvəla, "ümmi" sözünün bir neçə mənası var. Yazıb-oxumaq bilməyənə həqiqətən də "ümmi" deyirlər. Ancaq əslən Məkkədən olan hər bir şəxs ümmidir. Belə ki, Məkkənin digər adı Ümmül-Quradır.[260] Dilçilik baxımından, bu müqəddəs şəhərdən olan şəxsə həm Məkkəli, həm də Ümmi demək olar. Beləliklə, bu söz Peyğəmbərin (s) yazıb-oxumaq bilməməsi barədə qəti hökmə sahib deyil. Bundan əlavə, yuxarıda zikr edilən ayə əhli-sünnənin Peyğəmbərin (s) yazıb-oxumaq bilməməsi barədə iddiasını dəstəkləmir, əksinə sual altına salır. Ayədən belə başa düşülür ki, Peyğəmbər (s) Quran nazil olduqdan sonra yazıb-oxuyurdu. Əslində, bu elə başqa bir Quran ayəsilə də təsdiqini tapır:

**رسول من الله يتلو صحفا مطهرة فيها كتب قيمة**

**(Bu açıq-aşkar dəlil isə) pak səhifələri onlara oxuyan, Allah tərəfindən göndərilmiş peyğəmbərdir (Muhəmməd əleyhissəlamdır). O səhifələrdə doğru-dürüst hökmlər vardır.**[261]

Yazıb-oxumağı bilməyən insan hər hansı bir səhifəni oxuya bilməz, elə deyil?

Quran nazil olandan bəri Peyğəmbərin (s) yazıb-oxuya bilməsini təsdiq edən digər bir dəlil isə Hüdeybiyə sülhü barədə əl-Buxarinin rəvayətidir.

**حدثنا عبيد الله بن موسى عن إسرائيل عن أبي إسحاق عن البراء رضي الله عنه قال :اعتمر النبي صلى الله عليه و سلم في ذي القعدة فأبى أهل مكة أن يدعوه يدخل مكة حتى قاضاهم على أن يقيم بها ثلاثة أيام فلما كتبوا الكتاب كتبوا هذا ما قاضى عليه محمد رسول الله صلى الله عليه و سلم فقالوا لا نقر بها فلو نعلم أنك رسول الله ما منعاك لكن أنت محمد بن عبد الله قال أنا رسول الله وأنا محمد بن عبد الله .ثم قال لعلي امح رسول الله .قال لا والله لا أمحوك أبدا فأخذ رسول الله صلى الله عليه و سلم الكتاب فكتب هذا ما قاضى عليه محمد بن عبد الله لا يدخل مكة سلاح إلا في القراب وأن لا يخرج من أهلها بأحد إن أراد أن يتبعه وأن لا يمنع أحدا من أصحابه أراد أن يقيم بها.**

**Ubeydullah ibn Musa - İsrail - Əbu İshaq - əl-Bəra (r.a):**

**Peyğəmbər (s) Zil-Qədə ayında Ümrə yerinə yetirmək istədiyi zaman Məkkə camaatı onu şəhərə buraxmadılar. Nəhayət Peyğəmbər Məkkədə 3 gün qalmaq barədə onlarla sülh müqaviləsi bağladı. (Sülh) sazişi hazırlayarkən belə yazdılar: "Bu, Allah Rəsulu Muhəmmədin etdiyi sözləşmədir." Onlar dedilər: "Biz bununla razı deyilik. Əgər sənin Allah Rəsulu olduğuna**

[259] Ənkəbut, 29:48
[260] Bax: Ənam, 6:92
[261] Beyyinə, 98:2-3





**inansaydıq, sənə qadağa qoymazdıq. Sən Abdullahın oğlu Muhəmmədsən". (Peyğəmbər) buyurdu: "Mən həm Allah Rəsuluyam, həm də Abdullahın oğlu Muhəmmədəm". Daha sonra Əliyə dedi: "Allah Rəsulunu sil". (Əli) cavab verdi: "And olsun Allaha mən səni (sənin adını) heç vaxt silmərəm". Peyğəmbər (s) sözləşməni götürdü və belə yazdı: "Bu, Muhəmməd bin Abdullahın etdiyi sözləşmədir: Məkkəyə silah aparılmayacaq, yalnız qınında aparıla bilər; Məkkəlilərdən kimsə Muhəmmədə tabe olmaq istəsə, Məkkədən çıxmasına icazə verilməyəcək; Muhəmmədin səhabələrindən kimsə Məkkədə qalmaq istəsə, ona qadağan edilməyəcək".[262]**

Yazıb-oxumaq bilməyən adamda bu məharət hardandı belə?

Hər bir halda, Ömər və onun tərəfdarlarının problemi sadəcə Peyğəmbərin (s) aşağıdakı cümləsində idi:

**ائتوني بكتاب أكتب لكم كتابا لن تضلوا بعده أبدا**

**Mənə yazmağa bir şey gətirin ki, ondan sonra yolunuzu heç vaxt azmayacağınız bir şey yazım.**

Biz bu nəticəni Ömərin Peyğəmbərə (s) aşağıdakı cavabından çıxarırıq:

**قال عمر إن النبي صلى الله عليه و سلم غلبه الوجع وعندكم القرآن .فحسبنا كتاب الله**

**"Xəstəlik Peyğəmbərə güc gəldi. Bizim Quranımız var. Allahın kitabı bizə kifayətdir."**

Bununla belə, bir neçə həftə əvvəl Allah Rəsulu (s) Ərəfatda elan etmişdi ki:

**يا أيها الناس إني قد تركت فيكم ما إن أخذتم به لن تضلوا كتاب الله وعترتي أهل بيتي**

**"Ey insanlar! Sizin üzərinizdə[263] elə iki əmanət qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Allahın kitabı və itrətim, Əhli-beytim."**

Ondan bir neçə gün sonra Qədir-Xumda eyni sözləri bir daha təkrar etdi:

**قد تركت فيكم ما إن أخذتم به لن تضلوا: كتاب الله سببه بيده، وسببه بأيديكم، وأهل بيتي**

**"Sizin üzərinizdə elə iki şey qoyuram ki, onlara sarıldıqca əsla azğınlığa düşməzsiniz: Bir ucu Allahın, digər ucu sizin əlinizdə olan Allahın kitabı və Əhli-beytim."**

---

[262] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-Səhih (müxtəsər), c.2, s.960, №2552

[263] Burada "fikum" sözü istifadə edilmişdir. Səqəleyn hədisinin tərcüməsində bu ifadə adətən "aranızda" kimi tərcümə edilir. Ancaq müəllifin fikrincə, klassik ərəb dilçiliyində "fi" önsözünün "üzərində", "üstündə", "arasında" mənaları var. Məsələn, Əllamə Əlbani (ö. 1420 h.) "fi" önqoşması barədə özünün "Silsilətul-əhadisis-səhihə" kitabında (c.2, səh.715, №925-12) yazır:

قوله تعالى: {أأمنتم من في السماء}؛ أي: على السماء؛ أي: فوق العرش، وبذلك فسرها علماء السلف والخلف -ومنهم ابن عبد البر في "التمهيد"، والبيهقي في كتابيه: "الأسماء" و"الاعتقاد"

Allahın-Taalanın "Əminsiniz ki, göy<u>də</u> olan..." (67:16) buyuruğu: yəni, səmanın üzərində, yəni, ərşin fövqündə. Keçmiş (sələf) və sonrakı (xələf) alimlər - onlardan İbn Əbdül-bərr "Təmhid" kitabında, əl-Beyhəqi "əl-Əsma vəl-İtiqad" kitabında - bu cür izah etmişlər.

İmam əz-Zəhəbi (ö.748 h.) özünün "Müxtəsərul-Uluv lil-Aliyyul-əzim" əsərində (səh.245-246, №298) yazır:

قال أبو عبد الله الحاكم: قال الفقيه أبو بكر أحمد بن إسحاق الضبعي النيسابوري: قد تضع العرب "في" موضع "على" قال الله تعالى: {فسيحوا في الأرض} وقال: {ولأصلبنكم في جذوع النخل} ومعناه على الأرض وعلى النحل، فكذلك قوله: {من في السماء} أي من على العرش، كما صحت الأخبار عن رسول الله صلى الله عليه وسلم.

Əbu Abdullah əl-Həkim dedi: Fəqih olan Əbu Bəkr Əhməd ibn İshaq əd-Dəbi ən-Nisaburi buyurdu: "Ərəblər "fi"ni "üzərində" mənasında istifadə edirdilər. Allah-Taala buyurub: "Elə isə yer <u>üzündə</u> sərbəst gəzib dolaşın..." (9:2). Həmçinin buyurub: "Mən də sizin əl-ayağınızı çarpaz kəsdirib xurma ağaclarının kötüklərin<u>dən</u> asacağam." (20:71). Bunların mənası (müvafiq olaraq), "yer üzərində" və "xurma ağacları üzərində" deməkdir. Həmçinin, Onun " göy<u>də</u> olan..." buyuruğu da bu qəbildəndir, yəni ALlah Rəsulunun (s) səhih rəvayətlərinə əsasən "ərşin üzərində" deməkdir.

Eyni ifadə "Səqəleyn" hədisində də istifadə edilmişdir. Fikrimizdə, sözügedən hədisdə Allah Rəsulu (s) Quranı və öz itrətini bizim aramızda qoymaqla bizimlə bərabərləşdirmir, əksinə onları bizim rəhbərlərimiz elan etməklə onlara tabe olmağımızı əmr edir. Ona görə də "fi" ön qoşması burada məna etibarilə "aranızda" yox, "üzərinizdə" tərcümə edilir.





Heç bir şəkk-şübhə yoxdur ki, Allah Rəsulu (s) qələm-kağız istəyərkən də məhz bu sözləri ya öz əlyazması ilə, ya da diqtə etməklə yazdırmaq istəyirdi. O istəyirdi ki, bu sözlər ümmət üçün Qiyamət gününə qədər yazılı bir qanun olsun və biz bu gün ona nəzər yetirə bilək. Rəvayətlərdən də göründüyü kimi, Ömər Peyğəmbərin (s) bu niyyətini havada tutdu. Belə ki, bu ifadələrin deyiliş tərzi eyni idi. Sonra isə Allah Rəsuluna (s) cavab olaraq: "Biz Quranla birlikdə sənin Əhli-beytini istəmirik.[264] Biz sadəcə Allahın kitabını istəyirik" - deyə bildirdi.

Ömərin məsələsi Peyğəmbərin (s) oxuma-yazma bilib-bilməməsindən asılı deyildi. Əslində Ömər heç bu barədə bircə söz də deməyib və bu, Peyğəmbərin (s) Quran nazil olduqdan sonrakı oxuyub-yazmaq bilməsinə növbəti dəlildir. Problem bundan ibarət idi ki, Ömər və onun tərəfdarları Peyğəmbərdən (s) sonra Allahın Kitabı ilə yanaşı Əhli-beytin də onlara rəhbər və yolgöstərici olmasını qəbul etməyə hazır deyildilər.

Ona görə də Ömər və davamçıları elə bir planla hərəkət etdilər ki, hətta Peyğəmbər (s) bu yazını yazmağa nail olsaydı belə, ölümündən sonra "sayıqlama məhsulu" olaraq rədd ediləcəkdi. Əslində bu, Peyğəmbərin (s) ictimaiyyət qarşısındakı daha əvvəlki çıxışlarına qarşı əks effekt verə bilərdi.

Ona görə də, əziz Peyğəmbərimiz (s) öz əzəmətli müdrikliyi və yəqin ki, Allah-Taaladan gələn yeni göstəriş əsasında yazı yazdırmaq fikrindən daşındı və hər şeyi Allahın hökmünə buraxdı. Bununla belə, tarixin daha sonra təsdiqləyəcəyi kimi, həmin müsibətli cümə axşamı, o kədərli otaqda, o qaçılmaz saatda Ömər ibn əl-Xəttabın başçılığı ilə Sünni İslamının doğuşu baş verdi.

Həmin cümə axşamından etibarən, Sünni İslamı ümmətə, ümumiyyətlə insanlığa rəhbərlik etmək və yolgöstərici olmaqda Qurani-Kərimin ayrılmaz şəriki olan Əhli-beyti, Peyğəmbərin (s) itrətini heç bir vaxt qəbul etmədilər.

[264] "Biz Quranla birlikdə sənin Əhli-beytini istəmirik" sözlərini aşkar şəkildə deməsə də, "Bizə Allahın kitabı kifayətdir" deməsi və Allah Rəsulunun (s) buyurduğu "Səqəleyn" hədisini görməzdən gəlməsi nəticə etibarilə onun bu fikirdə olmağını təsdiq edir. Müəllif oxucuya Ömərin əməlinin tam təfsilatını açıqlamaq üçün bu cür ifadə etmişdir. (Tərcüməçi)





Allah Rəsulu (s) Möminlərin Əmiri Əli ibn Əbi Talibi özündən sonra xəlifə təyin etdi. O, həmçinin bildirdi ki, digər xəlifələr onun nəslindən gələcək. Əlalxüsus, o, özündən sonrakı xəlifələrin 12 nəfər, hamısının vəliəhd imamlar olacağını və onların hakimiyyətinin Qiyamət gününə qədər fasiləsiz şəkildə davam edəcəyini qeyd etmişdi.

Allah Rəsulu (s) özündən sonrakı xəlifələri ümmətin Qiyamətədək yolgöstəriciləri kimi vəsf edərək, bir an belə olsun Qurani-Kərimdən ayrılmayacaqlarını bəyan etmişdi. Bununla belə, o, özündən sonra ümmətin Əliyə qarşı (həmçinin, digər xəlifələrə qarşı) xəyanət edəcəyini də əvvəlcədən demişdi. Əl-Hafiz İbn Həcər əl-Əsqəlani (ö.852 h.q.) yazır:

**حدثنا الفضل هو أبو نعيم ، ثنا فطر بن خليفة ، أخبرني حبيب بن أبي ثابت، قال: سمعت ثعلبة بن يزيد، قال :سمعت عليا رضي الله عنه، يقول : والله إنه لعهد النبي الأمي صلى الله عليه وسلم: سيغدرونك من بعدي**

**Əl-Fəzl Əbu Nueym - Fitr ibn Xəlifə - Həbib ibn Əbi Sabit - Sələbə ibn Yezid:**

**Əlinin (r.a) belə dedyini eşitdim: And olsun Allaha, həqiqətən ümmi (məkkəli) olan Peyğəmbər (s) mənə belə dedi: "Onlar məndən sonra tezlikə sənə xəyanət edəcəklər."**[265]

Sələfi mühəqqiq Abdullah əş-Şəhri yazır:

**ضعيف بهذا الإسناد لحال فطر بن خليفة، و ثعلبة بن يزيد فإنهما صدوقان متشيعان، و هذا الحديث يُؤيد بدعتهما فهو ضعيف**

**Bu sənəd Fitr ibn Xəlifə və Sələbə ibn Yezidin halına görə zəifdir. Onlar hər ikisi səduq (doğrudanışan) və şiədirlər. Bu hədis isə onların bidətlərini dəstəkləyir. Ona görə də zəifdir.**[266]

Deməli, əş-Şəhrinin sənədlə olan yeganə problemi Fitr və Sələbənin şiəlikləridir. Onların hər ikisi doğru danışan olsalar da, bu hədis onlardan qəbul edilə bilməz, çünki bu, onların şiə məzhəbini dəstəkləyir. Dəhşətli dərəcədə "elmi yanaşma" sərgiləyib, elə deyilmi? Əş-Şəhrinin elmi metodunun nə dərəcədə düzgün olmasına keçməzdən əvvəl, gəlin daha aydın mənzərəyə sahib olmaq üçün hədisin ravilərinə baxaq.

İlkin müşahidə əsasında deməliyik ki, bu sənəd tamamilə müttəsil (bitişik) sənədə malikdir. Onun raviləri arasında qopuqluq yoxdur və ravilərin hər biri bu hədisi digərinin birbaşa özündən eşidiblər. Bundan əlavə, bütün ravilər tamamilə etibarlıdırlar.

Əl-Hafiz birinci ravi haqqında yazır:

**الفضل بن دكين الكوفي واسم دكين عمرو بن حماد بن زهير التيمي مولاهم الأحول أبو نعيم الملائي بضم الميم مشهور بكنيته ثقة ثبت**

**Əl-Fəzl ibn Dukeyn əl-Kufi. Dukeynin adı Əmr ibn Həmmad ibn Zuheyr ət-Təymidir. Onların (Bəni-Təymin) azad etdiyi quldur. Əl-Əhvəl, Əbu Nueym əl-Mulai. Künyəsi ilə məşhurdur. Siqədir, səbtdir.**[267]

[265] İbn Həcər əl-Əsqəlani, əl-Mətalibul-aliyə, c. 16, s.64, №3919
[266] Həmin mənbə





İkinci ravi haqqında aşağıdakıları yazır:

**فطر بن خليفة المخزومي مولاهم أبو بكر الحناط بالمهملة . والنون صدوق رمي بالتشيع**

**Fitr ibn Xəlifə əl-Məxzumi - onların (Bəni-Məxzumun) azad etdiyi quldur - Əbu Bəkr əl-Hənat: Səduqdur, şiəlikdə ittiham edilib.[268]**

Üçünücü raviyə gəlikdə, yazır:

**حبيب بن أبي ثابت قيس ويقال هند بن دينار الأسدي مولاهم أبو يحيى الكوفي ثقة فقيه جليل وكان كثير الإرسال والتدليس**

**Həbib ibn Əbi Sabit Qeys - həmçinin Hind ibn Dinar əl-Əsədi deyilib - onların (Bəni-Əsədin) azad etdiyi quldur - əl-Kufi: Siqədir, çox böyük fəqihdir. Ancaq çoxlu irsal və tədlis edirdi.[269]**

Bununla belə, bizim hədisimizdə o, açıq-aşkar hədisi eşitdiyini (سمعت) bildirmişdir. Ona görə də onun irsal və tədlisi burada yararsızdır, yəni hədisin mötəbərliyinə heç bir xələl gətirmir.

Nəhayət, sonuncu ravi barədə əl-Hafiz yazır:

**ثعلبة بن يزيد الحماني بكسر المهملة وتشديد الميم كوفي صدوق شيعي**

**Sələbə ibn Yezid əl-Himmani: Kufəlidir, səduqdur, şiədir.[270]**

Hədisimiz heç şübhəsiz həsən dərəcəsindədir. Qısası, qüsursuz və möhkəm hədisdir.

Əş-Şəhrinin iki ravinin şiəliyinə görə bu hədisi zəif hesab etməsinə gəldikdə isə, biz onun cavabını digər sələfi hədis alimi əl-Mualiminin (ö.1386 h.q.) öhdəsinə buraxırıq:

**وقد وثق أئمة الحديث جماعة من المبتدعة واحتجوا بأحاديثهم وأخرجوها في الصحاح، ومن تتبع رواياتهم وجد فيها كثيراً مما يوافق ظاهرة بدعهم، وأهل العلم يتأولون تلك الأحاديث غير طاعنين فيها ببدعة راويها ولا في راويها بروايته لها**

**Hədis imamları (alimləri) bir qrup bidətçini siqə (güvənilən) hesab etmiş, onların hədislərininə etimad etmiş və öz "Səhih" kitablarında qeyd etmişlər. Bu hədisləri incələyən şəxslər onların bir çoxunun zahirdə onları nəql edən ravilərin bidətlərinə uyğun gəldiyini görə bilər, lakin alimlər həmin hədisləri təvil edərək, nə ravilərin bidətlərinə görə həmin rəvayətlərə, nə də həmin rəvayətlərə görə onların ravilərinə tənə vurmuşlar[271]**

Əllamə əl-Əlbani (ö.1420 h.q.) bu fikrə dəstək olaraq deyir:

**فإن قال قائل: راوي هذا الشاهد شيعي، وكذلك في سند المشهود له شيعي آخر، وهو جعفر بن سليمان، أفلا يعتبر ذلك طعنا في الحديث وعلة فيه؟!**

**فأقول: كلا لأن العبرة في رواية الحديث إنما هو الصدق والحفظ، وأما المذهب فهو بينه وبين ربه، فهو حسيبه**

---

[267] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c. 2, s.11, №5418
[268] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c. 2, s.16, №5458
[269] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c. 1, s.183, №1087
[270] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c. 1, s.149, №849
[271] Əbdür-Rəhman ibn Yəhya əl-Mualimi əl-Yəməni, ət-Tənkil bi ma fi təanibul-Kəvsəri, c. 1, s.237





**Əgər kimsə desə ki: "Bu şahid kimi gətirilən hədisin (yəni, Əcləhin hədisinin) ravisi şiədir, həmçinin əsas hədisin sənədində də Cəfər ibn Süleyman adlı şiə var. Məgər bu hədisin tənqid edilməsinə haqq qazandırıb onun nöqsanını təsdiq etmir?**

**Buna belə cavab verərəm: Heç bir halda. Belə ki, Hədis nəqlində yeganə tələb ravinin doğruluğu və hafizəsidir. Onun məzhəbinə gəldikdə isə bu, özü ilə Allahı arasında olan məsələdir. Onun hesabını Allah aparacaq.[272]**

Üçüncü sələfi hədis alimi ət-Tureyfi də onların yolu ilə gedir:

**والأصل في رواية المبتدع إذا كان ضابطاً ثقة القبول، سواء روى فيما يوافق بدعته أم لا، ما لم يكن قد كفر ببدعته، فحينئذ يرد لكفره، وعلى هذا الأئمة الحفاظ، فهم يخرجون للمبتدع إذا كان ثقة ثبتاً، ويصححون خبره**

**Bidətçinin rəvayəti barədə ilkin qayda budur ki, əgər o, dəqiq və güvəniləndirsə, o zaman onun rəvayət etdiyi hədis özünün bidəti ilə uyğun olub-olmamasından asılı olmayaraq qəbul edilir. Ancaq bu, həmin bidətin onu küfrə aparmadığı halda qüvvədədir. Belə olduqda, (həmin hədis) onun küfrünə görə inkar ediləcək. Hafiz imamlar bu cür edirdilər. Əgər bidətçi güvənilən və dəqiqdirsə, ondan rəvayət edir və onun rəvayətini səhih hesab edirdilər.[273]**

Nəticədə məlum oldu ki, əş-Şəhrinin hədisi zəiflətmə üslubu qeyri-peşəkar və xamdır.

Bununla belə, əl-Hafiz bu hədisin ikinci sənədini də qeyd edir:

**وقال الحارث: ثنا عبد الرحمن بن زياد مولى بني هاشم، ثنا هشيم، عن إسماعيل بن سالم، عن أبي إدريس الأودي، عن علي، قال: قال رسول الله صلى الله عليه وسلم :إن هذه الأمة ستغدر بك من بعدي**

**Əl-Haris - Bəni-Haşimin azad edilmiş qulu Əbdür-Rəhman ibn Ziyad - Huşeym - İsmayıl ibn Səlim - Əbu İdris əl-Əvdi - Əli:**

**Allah Rəsulu (s) buyurdu: Həqiqətən bu ümmət tezliklə məndən sonra sənə xəyanət edəcək.[274]**

Əş-Şəhri yenidən yazır:

**ضعيف بهذا الإسناد لأن أبا إدريس الأودي مجهول الحال**

**Hədisin bu sənədi zəifdir, çünki Əbu idris əl-Əvdinin halı məchuldur.[275]**

Bu dəfə o, ravilərdən kimisə şiəlikdə ittiham edə bilməmiş, yaxud Əbu İdrisdən başqa hər hansı bir real və ya uydurma bir qüsur tapa bilməmişdir. Bəs görəsən Əbu İdrisin halı həqiqətən naməlumdur? Əli Şiri "Tarixu-Mədinəti-Diməşq" əsərinin təhqiqində yuxarıdakı rəvayət barədə qeyd yazarkən, Əbu İdrisin kimliyi barədə məlumat verir:

**وهو أبو إدريس يزيد بن عبد الرحمن الأودي**

**O, Əbu İdris Yezid ibn Əbdür-Rəhman əl-Əvdidir.[276]**

---

[272] Nasiruddin əl-Əlbani, Silsilətul-əhadisis-səhihə, c. 5, s.262, №2223
[273] Əbdül-Əziz ibn Mərzuq ət-Tureyfi, ət-Təhcil fi təxric, s.546
[274] İbn Həcər əl-Əsqəlani, əl-Mətalibul-aliyyə, c. 16, s.65, №3920
[275] Həmin mənbə





Bəs haqqında nə deyilib? Əl-Hafiz yazır:

**يزيد بن عبد الرحمن بن الأسود الأودي بواو ساكنة بعدها مهملة، أبو داود مقبول**

**Yezid ibn Əbdür-Rəhman ibn əl-Əsvəd əl-Əvdi, Əbu Davud: məqbuldur.[277]**

Görünür ki, onun halı məchul deyil, məqbuldur. Bu o deməkdir ki, əgər ravinin rəvayətini dəstəkləyən başqa bir rəvayət varsa, qəbul edilir. Əgər həmin ravi rəvayəti nəql edən yeganə şəxsdirsə, onda zəif hesab edilir. Biz artıq bilirik ki, bu hədisin Sələbə ibn Yeziddən nəql edilmiş dəstəkçisi var. Deməli, ikinci sənədimiz də səhih, yaxud həsən dərəcəsindədir.

İmam əl-Hakim (ö.403 h.q.) əl-Əvdinin rəvayətini nəql etmişdir:

**حدثنا أبو حفص عمر بن أحمد الجمحي بمكة ثنا علي بن عبد العزيز ثنا عمرو بن عون ثنا هشيم عن إسماعيل بن سالم عن أبي إدريس الأودي عن علي رضي الله عنه قال إن مما عهد إلي النبي صلى الله عليه وسلم أن الأمة ستغدر بي بعده**

**Əbu Həfs Ömər ibn Əhməd əl-Cəhmi - Əli ibn Əbdül-Əziz - Əmr ibn Aun - Huşeym - İsmayıl ibn Səlim - Əbu İdris əl-Əvdi - Əli (r.a):**

**"Allah Rəsulunun mənə verdiyi əhdlərdən biri də bu idi ki, bu ümmət ondan sonra tezliklə mənə xəyanət edəcək."[278]**

Daha sonra yazır:

**هذا حديث صحيح الإسناد**

**Bu hədisin sənədi səhihdir.[279]**

İmam əz-Zəhəbi (ö.748 h.q.) də təsdiq edir:

**صحيح**

**Səhihdir.[280]**

Əl-Hakim daha bir şahid nəql edir:

**عن حيان الأسدي سمعت عليا يقول قال لي رسول الله صلى الله عليه وسلم إن الأمة ستغدر بك بعدي وأنت تعيش على ملتي وتقتل على سنتي من أحبك أحبني ومن أبغضك أبغضني وإن هذه ستخضب من هذا يعني لحيته من رأسه**

**Həyyat əl-Əsədidən belə dediyi nəql edilir: Əlinin belə dediyini eşitdim: Allah Rəsulu (s) mənə dedi: Həqiqətən, bu ümmət məndən sonra tezlikə sənə xəyanət edəcək. Sən isə mənim dinim üzərində olacaq və mənim sünnəm üzərində öldürüləcəksən. Səni sevən məni sevmişdir, sənə nifrət edən mənə nifrət etmişdir. Bir gün saqqalın başından axan qanla qırmızıya boyanacaq.[281]**

Əl-Hakim dedi:

**صحيح**

[276] İbn Əsakir əş-Şafei, Tarixu-mədinəti-Diməşq, c. 42, s.447, haşiyə №7
[277] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c. 2, s.328, №7774
[278] Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn, c. 3, s.150, №4676
[279] Həmin mənbə
[280] Həmin mənbə
[281] Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn, c.3, s.153, №4686





**Səhihdir.**[282]

Əz-Zəhəbi də bunu təsdiq etmişdir:

**صحيح**

**Səhihdir.**[283]

Əl-Hafiz İbn Həcər əl-Əsqəlani bu hədisin sənədini öz kitabında qeyd etmişdir:

**ثنا أبو علي الحافظ ، ثنا الهيثم بن خلف، ثنا محمد بن عمر بن هياج، ثنا يحيى بن عبد الرحمن، ثنا يونس بن أبي يعفور، عن أبيه، عنه ، به.**

**Əbu Əli əl-Hafiz - əl-Heysəm ibn Xələf - Muhəmməd ibn Ömər ibn Həyyac - Yəhya ibn Əbdür-Rəhman - Yunus ibn Əbi Yafur - atası - ondan (Həyyan əl-Əsədidən).**[284]

Göründüyü kimi, həm əl-Hakim, həm də əz-Zəhəbi bu rəvayətin səhih olduğunu bildirmişlər. Bu da hədisin başqa sənədlərini qüvvətləndirmiş olur. Hər bir halda, bu rəvayətin 3 sənədi onun səhihliyini qəti olaraq sübut edir. Hətta əş-Şəhri də hədisin sənədlərinə müxtəlif əsassız bəhanələrlə hücum etsə də, sonda bu nəticədən qaça bilmir:

**و مع أن الحديث ضعيف بالنظر إلي كل طريق علي حدة لكن بالنظر إلي الطريقين معا فالحديث حسن لغيره**

**Bu hədisin bütün sənədləri ayrı-ayrılıqda götürdükdə zəifdir, lakin iki sənədini (yəni, Sələbə ibn Yezid və Əbu İdris əl-Əvdi) birlikdə götürsək, hədis "həsən li-ğeyrihi"[285] dərəcəsində olar.**[286]

Allah Rəsulu (s) öncədən xəbərdarlıq etmişdi ki, ümmət ondan sonra Möminlərin Əmirinə xəyanət edəcək. Ümmət sözü ümumi şəkildə işlənmişdir. Deməli, nəzərdə tutulan ümmətin kiçik bir qrupu deyil, əksəriyyətidir. Onlar Peyğəmbərin (s) ölümündən sonra təyin edilmiş xəlifəsinə qarşı xəyanət edəcəkdilər. Əlbəttə ki, tarixin şahidliyinə əsasən, səhabələr də daxil olmaqla ümmətin əksəriyyəti həqiqətən də Möminlərin Əmirini satdılar.

Peyğəmbərin (s) özündən sonra Əlini xəlifə təyin etməsinə baxmayaraq, onlar bivəfa çıxdılar və onun yerinə üsyançı bir şəxsi qoydular. Maraqlıdır ki, İmam Əli (ə) həm Əbu Bəkri, həm də Öməri həmin bivəfalar cərgəsində qeyd etmişdir. İmam Müslim (ö.261 h.q.) yazır:

**فلما توفي رسول الله صلى الله عليه و سلم قال أبو بكر أنا ولي رسول الله صلى الله عليه و سلم .... فرأيتماه كاذبا آثما غادرا خائنا والله يعلم إنه لصادق بار راشد تابع للحق ثم توفي أبو بكر وأنا ولي رسول الله صلى الله عليه و سلم وولي أبا بكر فرأيتماني كاذبا آثما غادرا خائنا**

**Allah Rəsulu (s) dünyasını dəyişdikdə, Əbu Bəkr dedi: "Mən Allah Rəsulunun (s) vəlisiyəm"... Ancaq siz ikiniz (Əli və Abbas) onu yalançı, günahkar, bivəfa və xain hesab etdiniz.**

---

[282] Həmin mənbə
[283] Həmin mənbə
[284] İbn Həcər əl-Əsqəlani, İtihaful-məhərat, c.11, s.296, №14043. Əl-Hafiz hədisi qeyd etdikdən sonra sənədin mənbəsi kimi əl-Hakimin "Müstədrək"ini göstərmişdir. "Əl-Müstədrək"in müasir nəşrlərində həmin hədisin sənədi göstərilmir. Görünür, əl-Hafiz öz zamanında "əl-Müstədrək"in elə bir əlyazma nüsxəsini əldə etmişdi ki, orada həmin sənəd tam şəkildə göstərilmişdir. Bununla belə, İbn Həcər də sənədi köçürərkən xətaya yol vermişdir. Belə ki, Həyyan əl-Əsədinin adını yanlışlıqla Əban əl-Əsədi yazmışdır.
[285] Yəni, hədis digər sənədləri ilə birlikdə "həsən" dərəcəsinə yüksəlir.
[286] İbn Həcər əl-Əsqəlani, əl-Mətalibul-aliyə, c.16, s.67, №3921





**Allah bilir ki, o, düzdanışan, zahid, hidayətedən və haqq ardıcıldır. Əbu Bəkr öldükdən sonra Allah Rəsulunun və Əbu Bəkrin vəlisi mən oldum. Ancaq siz ikiniz məni də yalançı, günahkar, bivəfa və xain hesab etdiniz.[287]**

[287] Müslim ibn əl-Həccac, əs-Səhih, c.3, s.1376, №1757





Qurani-Kərim bizə bildirir ki, Qiyamət günü insanlar 3 müxtəlif kateqoriyaya ayrılacaqlar:

**وكنتم أزواجا ثلاثة فأصحاب الميمنة ما أصحاب الميمنة وأصحاب المشأمة ما أصحاب المشأمة والسابقون السابقون**

**Siz üç qrupa ayrılacaqsınız: Sağ tərəf sahibləri. Kimdir o sağ tərəf sahibləri? (Nə uğurludur onlar!). Sol tərəf sahibləri. Kimdir o sol tərəf sahibləri? (Nə uğursuzdur onlar!). Və öndə olanlar. Onlar (dünyada Allah yolunda, imanda, əməldə, xeyirdə öndə olduqları kimi, axirətdə də) öndədirlər! (Nə xoşbəxtdir onlar!)[288]**

"Öndəgedənlər" qrupuna məxsus olanlar Cənnətdə Allaha ən yaxın insanlar olacaqlar.[289] Digər Cənnət əhli isə "sağ tərəf sahibləri"dir.[290] Bu fəsildə məqsədimiz "sol tərəf sahibləri"ni araşdırmaqdır. Cəhənnəmə daxil olan hər bir kəs "sol tərəf sahibləri"dir, yəni əməl dəftərləri sol əllərinə verilərək cəhənnəmə daxil ediləcəklər.

**وأصحاب الشمال ما أصحاب الشمال في سموم وحميم وظل من يحموم لا بارد ولا كريم**

**Sol tərəf sahibləri! Kimdir o sol tərəf sahibləri? (Onlar) səmum yeli (qızmar atəş) və qaynar su içində, Qapqara duman kölgəsində olacaqlar! (O kölgə başqa kölgələrdən fərqli olaraq) nə sərin, nə də xoşagələndir.[291]**

Həmçinin:

**والذين كفروا بآياتنا هم أصحاب المشأمة عليهم نار مؤصدة**

**Ayələrimizi inkar edənlər isə sol tərəf sahibləridir! Onları hər tərəfi qapalı Cəhənnəm gözləyir! [292]**

Allah bizi sol tərəf sahibi olmaqdan qorusun!

Burada sual meydana çıxır: səhabələrdən kimsə sol tərəf əshabından (sahibindən) olacaqmı? Biz bu sualı ona görə veririk ki, onların bir çoxu Allah Rəsulunun (s) itrətini, Əhli-beytini özlərinə xəlifə və ali rəhbər olaraq qəbul etməyiblər.

Bəs onların Səqəleyn və Xəlifəteyn hədislərinə qarşı laqeyd yanaşmalarının nəticəsi nə olacaq? Həqiqətən də itaətsizliklərinə görə Allah tərəfindən cəzalandırılacaqlarmı?

---

[288] Vaqiə, 56:7-10
[289] Vaqiə, 56:10-12
[290] Vaqiə, 56:27-40
[291] Vaqiə, 56:41-44
[292] Bələd, 90:19-20





Bundan əlavə, Peyğəmbər öz ümmətinin həqiqi hidayət yolunda sabit qalmaları üçün özündən sonra Əhli-beytinə sarılmaları üçün xəbərdarlıq etmişdi. Səhabələr onun bu xəbərdarlığına məhəl qoymadılar. Bu hərəkətləriylə haqq yoldan çıxdılarmı?

Bu suala cavab olaraq, İmam əl-Buxari (ö.256 h.q.) yazır:

**حدثنا أحمد بن صالح حدثنا ابن وهب قال أخبرني يونس عن ابن شهاب عن ابن المسيب أنه كان يحدث عن أصحاب النبي صلى الله عليه و سلم :أن النبي صلى الله عليه و سلم قال يرد علي الحوض رجال من أصحابي فيحلؤون عنه فأقول يا رب أصحابي ؟ فيقول إنك لا علم لك بما أحدثوا بعدك إنهم ارتدوا على أدبارهم القهقرى**

**Əhməd ibn Salih - İbn Vəhb - Yunus - İbn Şihab - İbn Musəyyəb:**

**O, Peyğəmbərin səhabələrindən belə nəql edirdi ki, Peyğəmbər (s) buyurdu:**

**Səhabələrimdən bir qrupu hovuz kənarında yanıma gələcək, lakin oradan uzaqlaşdırılacaqlar. Mən deyəcəyəm: "Ya Rəbbim, səhabələrim!" Deyiləcək: "Səndən sonra onların nə bidətlər etdiklərini bilmirsən. Onlar keçmişlərinə dönüb dindən çıxdılar."**[293]

Bu hədis səhabələrin özləri tərəfindən nəql edilib və məsələ barədə İslamın düzgün mövqeyini əks etdirir. Allah Rəsulunun (s) dünyasını dəyişməsindən sonra bir çox səhabə bidətçi və mürtəd oldu. Nəticə olaraq, onlar Qiyamət günü "sol tərəf əshabı" olmaqla Cəhənnəmə daxil ediləcəklər.

Səhabələr barədə bu pis xəbəri çatdıranlardan biri də Ənəsdir. İmam Müslim (ö.261 h.q.) onun hədisini nəql edir:

**وحدثني محمد بن حاتم حدثنا عفان بن مسلم الصفار حدثنا وهيب قال سمعت عبدالعزيز بن صهيب يحدث قال حدثنا أنس بن مالك أن النبي صلى الله عليه و سلم قال ليردن علي الحوض رجال ممن صاحبني حتى إذا رأيتهم ورفعوا إلي اختلجوا دوني فلأقولن أي رب أصيحابي أصيحابي فليقالن لي إنك لا تدري ما أحدثوا بعدك**

**Muhəmməd ibn Hatim - Əffan ibn Müslim ə-Səffar - Vuheyb - Əbdül-Əziz ibn Suheyb - Ənəs ibn Malik:**

**Allah Rəsulu (s) buyurdu: Mənə səhabə olmuş şəxslərdən bir dəstəsi hovuz kənarında mənim yanıma gələcəklər. Elə ki, mən onları görəcəyəm və onlar mənə təqdim ediləcəkdir, bu zaman onları məndən uzaqlaşdırılacaqlar. Mən deyəcəyəm: "Ya Rəbbim, səhabəciklərim, səhabəciklərim! " Mənə deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən".**[294]

[293] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-səhih (müxtəsər), c.5, s.2407, №6214
[294] Müslim ibn əl-Həccac, əs-Səhih, c.4, s.1800, №2304 (40)





Biz bu kitabın son fəslində səhabələr arasındakı bəzi bidətçiləri səhih rəvayətlər işığında tanıtdıracağıq. Bu adlardan bəziləri bizim əhli-sünnə qardaşlarımızı çox narahat edə bilər.

İmam əl-Buxari bu barədə İbn Abbasdan da rəvayət nəql etmişdir:

**حدثنا محمد بن يوسف حدثنا سفيان عن المغيرة بن النعمان عن سعيد بن جبير عن ابن عباس رضي الله عنهما قال : قال رسول الله صلى الله عليه و سلم :تحشرون حفاة عراة غرلا ثم قرأ {كما بدأنا أول خلق نعيده وعدا علينا إنا كنا فاعلين.} فأول من يكسى إبراهيم ثم يؤخذ برجال من أصحابي ذات اليمين وذات الشمال فأقول أصحابي فيقال إنهم لم يزالوا مرتدين على أعقابهم منذ فارقتهم فأقول كما قال العبد الصالح عيسى بن مريم {وكنت عليهم شهيدا ما دمت فيهم فلما توفيتني كنت أنت الرقيب عليهم وأنت على كل شيء شهيد .إن تعذبهم فإنهم عبادك وإن تغفر لهم فإنك أنت العزيز الحكيم}**

**قال محمد بن يوسف ذكر عن أبي عبد الله عن قبيصة قال هم المرتدون الذين ارتدوا على عهد أبي بكر فقاتلهم أبي بكر رضي الله عنه**

**Muhəmməd ibn Yusuf - Süfyan - əl-Muğirə ibn əl-Numan - Səid ibn Cubeyr - İbn Abbas (Allah hər ikisindən razı olsun):**

**Allah Rəsulu (s) buyurdu: Siz ayaqyalın, çılpaq və sünnətsiz olaraq həşr ediləcəksiniz. Daha sonra bu ayəni oxudu: *"(Məxluqatı) ilk dəfə yaratdığımız kimi yenə əvvəlki halına qaytaracağıq. Biz vəd vermişik. Sözsüz ki, Biz onu yerinə yetirəcəyik." (21:104)* Davam edərək buyurdu: "İlk paltar geyindirilən şəxs İbrahim olacaq. Daha sonra səhabələrimdən bəziləri sağ tərəfə, bəziləri isə sol tərəfə aparılacaq. Mən deyəcəyəm: "Səhabələrim!" Deyiləcək: Sən onları tərk etdikdən sonra onlar dindən çıxdılar". Mən də Allahın saleh qulu Məryəm oğlu İsa kimi deyəcəyəm: *"Mən onlara ancaq Sənin mənə əmr etdiyini: "Mənim də Rəbbim, sizin də Rəbbiniz olan Allaha ibadət edin!"– demişəm. Nə qədər ki, onların arasında idim, mən onlara şahid idim. Sən məni (onların arasından) götürdükdən sonra isə onlara nəzarət edən Özün oldun. Sən hər şeyə Şahidsən. (5:117-118)*"**

**Muhəmməd ibn Yusuf dedi: Əbu Abdullah Qubeysədən onun belə dediyini nəql etdi: "Onlar Əbu Bəkrin zamanında dindən çıxanlar idilər. Ona görə də Əbu Bəkr (r.a) onlarla vuruşdu."[295]**

Əhli-sünnə imamlarından olan Qubeysə hədisdə nəzərdə tutulan mürtədlərin Əbu Bəkrin dövründə İslamı tərk edənlər olduğunu deyir. Bizim fikrimizcə, bu adamlar da mürtədlər sırasına daxildir, lakin onların əhatə dairəsi Əhl ər-Riddə ilə məhdudlaşmır. Bu barədə əlavə dəlilləri təqdim edəcəyik.

İmam Əhməd (ö.241 h.q.) başqa bir səhabənin də şahidliyini nəql edir:

[295] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-səhih (müxtəsər), c.3, s.1271, №3263





**حدثنا عبد الله حدثني أبي ثنا عفان ثنا حماد بن سلمة أنا علي بن زيد عن الحسن عن أبي بكرة أن رسول الله صلى الله عليه و سلم قال ليردن على الحوض رجال ممن صحبني ورآني حتى إذا رفعوا إلى ورأيتهم اختلجوا دوني فلأقولن رب أصحابي أصحابي فيقال إنك لا تدري ما أحدثوا بعدك**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Əffan - Həmmad ibn Sələmə - Əli ibn Zeyd - əl-Həsən - Əbu Bəkrə:**

**Allah Rəsulu (s) buyurdu:**

**Mənə səhabəlik etmiş və məni görmüş bir qrup insan mənimlə hovuz kənarında görüşəcək. Elə ki, mən onları görəcəyəm və onlar mənə təqdim ediləcəkdir, bu zaman onları məndən uzaqlaşdıracaqlar. Mən deyəcəyəm: "Ya Rəbbim, səhabələrim, səhabələrim!" Mənə deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən"[296]**

Şeyx əl-Ərnaut deyir:

**صحيح لغيره**

**Səhih li-ğeyrihi[297]**

Əl-Buxari daha bir rəvayət nəql edir və bunun ravisi Əbu Hureyrədir:

**وقال أحمد بن شبيب بن سعيد الحبطي حدثنا أبي عن يونس عن ابن شهاب عن سعيد بن المسيب عن أبي هريرة أنه كان يحدث :أن رسول الله صلى الله عليه و سلم قال يرد علي يوم القيامة رهط من أصحابي فيجلون عن الحوض فأقول يا رب أصحابي فيقول إنك لا علم لك بما أحدثوا بعدك إنهم ارتدوا على أدبارهم القهقرى**

**Əhməd ibn Şəbib ibn Səid əl-Hinti - atası - Yunus - İbn Şihab - Səid ibn əl-Musəyyib - Əbu Hureyrə:**

**O deyərdi ki: Allah Rəsulu (s) buyurdu: Səhabələrimdən bir qrupu Qiyamət günü mənimlə görüşəcək, lakin onlar hovuzun yanından uzaqlaşdırılacaqlar. Bu zaman mən deyəcəyəm: "Ya Rəbbim, səhabələrim!" Deyiləcək: "Səndən sonra onların nə bidətlət etdiklərini bilmirsən. Onlar keçmişlərinə dönüb dindən çıxdılar."[298]**

Əhməd ibn Hənbəlin kitabında da digər səhabədən nəql edilir ki:

**حدثنا عبد الله حدثني أبي ثنا سليمان بن داود ثنا عبد الرحمن بن عبد الله بن دينار عن أبي حازم عن النعمان بن أبي عياش الزرقي عن أبي سعيد الخدري ان النبي صلى الله عليه و سلم قال فأقول أصحابي أصحابي فقيل انك لا تدري ما أحدثوا بعدك قال فأقول بعدا بعدا أو قال سحقا سحقا لمن بدل بعدي**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Suleyman ibn Davud - Əbdür-Rəhman ibn Abdullah ibn Dinar - Əbu Hazim - ən-Numan ibn Əbi Əyyaş əz-Zarqi - Əbu Səid əl-Xudri:**

[296] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.48, №20512
[297] Həmin mənbə
[298] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-səhih (müxtəsər), c.5, s.2407, №6213





**Allah Rəsulu (s) buyurdu: Mən deyəcəyəm: "Ya Rəbbim, səhabələrim, səhabələrim!" Mənə deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən". Sonra mən deyəcəyəm: "Vay olsun, vay olsun məndən sonra (dindən) dönənlərə."[299]**

Şeyx əl-Ərnaut yazır:

**صحيح**

**Səhihdir.[300]**

İmam əl-Buxari də İbn Məsuddan nəql edir ki:

**وحدثني عمرو بن علي حدثنا محمد بن جعفر حدثنا شعبة عن المغيرة قال سمعت أبا وائل عن عبد الله رضي الله عنه عن النبي صلى الله عليه و سلم قال أنا فرطكم على الحوض وليرفعن رجال منكم ثم ليختلجن دوني فأقول يا رب أصحابي فيقال: إنك لا تدري ما أحدثوا بعدك**

**Əmr ibn Əli - Muhəmməd ibn Cəfər - Şubə - əl-Muğirə - Əbu Vail - Abdullah (r.a):**

**Allah Rəsulu (s) buyurdu: Mən sizdən öncə hovuzun yanında olacağam. Sizin aranızdan bir qrupu mənə təqdim ediləcək, sonra isə onlar məndən uzaqlaşdırılacaqlar. Mən deyəcəyəm: "Ya Rəbbim, səhabələrim!" Mənə deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən".[301]**

Allah Rəsulu (s) öz səhabələrinə xitab edirdi və açıq-aydın bildirirdi ki, bidətçilər onların arasından olacaq.

İmam Əhməd Hüzeyfənin bu barədəki rəvayətini nəql edir:

**حدثنا عبد الله حدثني أبي ثنا سريج بن النعمان حدثنا هشيم عن المغيرة عن أبي وائل عن بن مسعود وحصين عن أبي وائل عن حذيفة قالا قال رسول الله صلى الله عليه و سلم أنا فرطكم على الحوض أنظركم ليرفع لي رجال منكم حتى إذا عرفتهم اختلجوا دوني فأقول رب أصحابي أصحابي فيقال إنك لا تدري ما أحدثوا بعدك**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Şureyh ibn əl-Numan - Huşeym - əl-Muğirə - Əbu Vail - İbn Məsud; və Hüseyn - Əbu Vail - Hüzeyfə:**

**Allah Rəsulu (s) buyurdu: Mən sizdən öncə hovuzun yanına yetişərək sizi gözləyəcəyəm. Aranızdan bir qrupu mənə təqdim ediləcək və mən onları tanıyacağam. Sonra isə onlar məndən uzaqlaşdırılacaqlar. Mən deyəcəyəm: "Ya Rəbbim, səhabələrim, səhabələrim!" Mənə deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən".[302]**

Şeyx əl-Ərnaut deyir:

**هذا الحديث له إسنادان: الأول إسناده صحيح والإسناد الثاني رجاله ثقات رجال الصحيح**

[299] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.3, s.28, №11236
[300] Həmin mənbə
[301] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-səhih (müxtəsər), c.5, s.2404, №6205
[302] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.393, №23385





**Bu hədisin iki sənədi var. Birinci sənədi səhihdir, ikinci sənədinin raviləri isə siqədirlər, "əs-Səhih"in (Buxarinin) raviləridir.[303]**

Həmin kitabda yazılır:

**حدثنا عبد الله حدثني أبي ثنا عبد الصمد ثنا عبد العزيز بن مسلم حدثنا حصين عن أبي وائل عن حذيفة أن رسول الله صلى الله عليه و سلم قال ليردن على الحوض أقوام فيختلجون دوني فأقول رب أصحابي رب أصحابي فيقال لي إنك لا تدري ما أحدثوا بعدك**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Əbdus-Səməd - Əbdül-Əziz ibn Müslim - Husayn - Əbu Vail - Hüzeyfə:**

**Allah Rəsulu (s) buyurdu: Bir qrup insan mənimlə hovuz kənarında görüşəcəklər. Ancaq onları məndən uzaqlaşdıracaqlar. Mən deyəcəyəm: "Ya Rəbbim, səhabələrim, səhabələrim!" Mənə deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən".[304]**

Şeyx əl-Ərnaut yazır:

**حديث صحيح**

**Hədis səhihdir.[305]**

İmam əl-Heysəmi (ö.807 h.q) başqa bir səhabənin hədisini nəql edir:

**وعن أبي مسعود عن النبي صلى الله عليه و سلم قال : " ليرفعن لي رجال من أصحابي حتى إذا رأيتهم اختلجوا دوني فأقول : أصحابي فيقال : إنك لا تدري ما أحدثوا بعدك"**

**Əbi Məsud Peyğəmbərdən (s) onun belə buyurduğunu nəql edir:**

**Səhabələrimdən bəzi şəxslər mənə təqdim ediləcək. Mən onları gördükdə, onlar məndən uzaqlaşdırılacaqlar. Mən deyəcəyəm: "Səhabələrim!" Deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən".[306]**

Əl-Heysəmi deyir:

**رواه الطبراني ورجاله رجال الصحيح**

**Ət-Təbərani rəvayə etmişdir, raviləri "əs-Səhih"in raviləridir.[307]**

"Əl-Müsnəd"in başqa bir yerində yazılır:

**حدثنا عبد الله حدثني أبي ثنا قتيبة بن سعيد ثنا يعقوب بن عبد الرحمن عن أبي حازم قال سمعت سهلا يقول سمعت النبي صلى الله عليه و سلم يقول أنا فرطكم على الحوض من ورد شرب ومن شرب لم يظمأ بعده أبدا وليردن على أقوام أعرفهم ويعرفونني ثم يحال بيني وبينهم قال أبو حازم فسمعني النعمان بن أبي عياش وأنا أحدثهم هذا الحديث فقال هكذا سمعت سهلا يقول قال فقلت نعم قال وأنا أشهد على أبي سعيد الخدري لسمعت يزيد فيقول أنهم مني فيقال إنك لا تدري ما عملوا بعدك فأقول سحقا سحقا لمن بدل بعدي**

[303] Həmin mənbə
[304] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.388, №23338
[305] Həmin mənbə
[306] Nurəddin əl-Heysəmi, Məcməuz-zəvaid, c.10, ps.662-663, №18471
[307] Həmin mənbə





**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Quteybə ibn Səid - Yaqub ibn Əbdür-Rəhman - Əbu Hazim - Səhl:**

**Allah Rəsulu (s) buyurdu: "Mən sizdən öncə hovuzun yanına yetişəcəyəm. Hər kim oradan keçsə həmin hovuzdan su içəcək və hər kim o sudan içsə, bir daha susamayacaq. Bir qrup insan mənimlə görüşəcək və mən onları tanıyacağam. Sonra mənimlə onların arasında sədd çəkiləcək.**

**Əbu Hazim dedi: Mən onlara bu hədisi rəvayət edərkən ən-Numan ibn Əbi Əyyaş eşitdi və dedi: "Sən bunu Səhldən eşitmisən?" Dedim: "Bəli". Dedi: "Şəhadət verirəm ki, Əbu Səid əl-Xudri (bu hədisə) əlavə edərək dedi: "Mən deyəcəyəm: "Onlar məndəndir". Deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən." Sonra mən deyəcəyəm: "Vay olsun, vay olsun məndən sonra (dindən) dönənlərə."[308]**

Şeyx əl-Ərnaut dedi:

**إسناده صحيح على شرط الشيخين**

**Bu hədisin sənədi iki şeyxin (əl-Buxari və Müslimin) şərtlərinə əsasən səhihdir.[309]**

İmam Müslim daha bir rəvayət nəql edir:

**وحدثنا ابن أبي عمر حدثنا يحيى بن سليم عن ابن خثيم عن عبدالله بن عبيدالله بن أبي مليكة أنه سمع عائشة تقول سمعت رسول الله صلى الله عليه و سلم يقول وهو بين ظهراني أصحابه إني على الحوض أنتظر من يرد علي منكم والله ليقتطعن دوني رجال فلأقولن أي رب مني ومن أمتي فيقول إنك لا تدري ما عملوا بعدك ما زالوا يرجعون على أعقابهم**

**İbn Əbi Ömər - Yəhya ibn Səlim - İbn Xeysəm - Abdullah ibn Ubeydullah ibn Əbi Muleykə - Aişə:**

**Allah Rəsulu (s) səhabələrinin qarşısında olarkən belə dediyini eşitdim: Mən hovuzun kənarında sizlərdən mənimlə görüşəcək olan kəsləri gözləyəcəyəm. And olsun Allaha, bəzi şəxslər məndən uzaqlaşdırılacaqlar. O zaman mən deyəcəyəm: "Ya Rəbbim! Onlar məndəndirlər, mənim ümmətimdəndirlər". Deyiləcək: "Səndən sonra onların nələr etdiklərini bilmirsən. Onlar öz keçmişlərinə döndülər."[310]**

Nəhayət, Aişənin bacısından nəql edilən hədislə bu barədə gətirdiyimiz rəvayətləri yekunlaşdırırıq:

**حدثنا سعيد بن أبي مريم عن نافع بن عمر قال حدثني ابن أبي مليكة عن أسماء بنت أبي بكر رضي الله عنهما قالت :قال النبي صلى الله عليه و سلم إني على الحوضحتى أنظر من يرد علي منكم وسيؤخذ ناسدوني فأقول يا رب مني ومن أمتي فيقال هل شعرت ما عملوا بعدك والله ما برحوا يرجعون على أعقابهم.**

**فكان ابن أبي مليكة يقول اللهم إنا نعوذ بك أن نرجع على أعقابنا أو نفتن عن ديننا**

---

[308] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.5, s.333, №22873
[309] Həmin mənbə
[310] Müslim ibn əl-Həccac, əs-Səhih, c.4, s.1794, №2294 (28)





**Səid ibn Əbi məryəm - Nafe ibn Ömər - İbn Əbi Muleykə - Əsma bint Əbi Bəkr (Allah hər ikisindən razı olsun):**

**Allah Rəsulu (s) buyurdu: Mən hovuzun kənarında sizlərdən mənimlə görüşəcək olan kəsləri gözləyəcəyəm. Bəzi şəxslər məndən uzaqlaşdırılacaqlar. O zaman mən deyəcəyəm: "Ya Rəbbim! Onlar məndəndirlər, mənim ümmətimdəndirlər". Deyiləcək: "Səndən sonra onların nələr etdiklərini bilirsən? And olsun Allaha, onlar öz keçmişlərinə döndülər."**

**Ona görə də İbn Əbi Muleykə deyərdi: "Allahım, biz keçmişimizə dönməkdən, yaxud dinimizlə sınağa çəkilməkdən sənə sığınırıq."**[311]

Bununla da sözügedən rəvayət ən azı aşağıdakı səhabələr tərəfindən nəql edilmişdir:

1. Ənəs ibn Malik
2. İbn Abbas
3. Əbu Bəkrə
4. Əbu Hureyrə
5. Əbu Səid əl-Xudri
6. Abdullah ibn Məsud
7. Hüzeyfə
8. Əbu Məsud
9. Səhl
10. Aişə bint Əbu Bəkr
11. Əsma bint Əbu Bəkr

Deməli, bu hədisin mütəvatirliyi mübahisəyə ehtiyacı olmayan bir məsələdir.

[311] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-səhih (müxtəsər), c.5, s.2409, №6220





Gözlənildiyi kimi, əhli-sünnə alimləri Hovuz hədisi barədə müxtəlif izahlar veriblər. Onlardan bəziləri qərəzli şəkildə müəyyən məşhur səhabələri müdafiə etmək məqsədi güdüblər. Məsələn, əl-Hafiz (ö.852 h.q.) yazır:

**وقال الخطابي لم يرتد من الصحابة أحد وانما ارتد قوم من جفاة الاعراب ممن لا نصرة له في الدين وذلك لا يوجب قدحا في الصحابة المشهورين ويدل قوله أصيحابي بالتصغير على قلة عددهم**

**Əl-Xəttabi demişdir: Səhabələrdən heç kim dindən çıxmamışdır. Dindən çıxanlar sadəcə dinə heç bir faydası olmayan bir qrup bədəvi ərəb idilər. Bu isə məşhur səhabələrə heç bir ləkə gətirməz. Peyğəmbərin təsğirlə (kiçiltmə siğəsilə) dediyi "useyhabi" ifadəsi də onların sayının azlığına dəlildir.**[312]

İmam əl-Mubarəkfuri də (ö.1282) buna uyğun bir sitat gətirir:

**قال القاضي يريد بهم من ارتد من الأعراب الذين أسلموا في أيامه كأصحاب مسيلمة والأسود وأضرابهم**

**Əl-Qazi demişdir: "Bununla o, öz dövründə İslamı qəbul etmiş bədəvi ərəblər arasından dindən çıxanları nəzərdə tutmuşdur. (Məsələn:) Museyləmə, əl-Əsvəd və onlar kimi şəxslərin səhabələri kimi.**[313]

Daha sonra sözügedən hədis barədə yazır:

**قال النووي هذا مما أختلف العلماء في المراد على أقوال**
**أحدها أن المراد به المنافقون والمرتدون....**
**والثاني أن المراد من كان في زمن النبي صلى الله عليه وسلم ثم ارتد بعده....**
**والثالث أن المراد أصحاب المعاصي الكبائر الذين ماتوا على التوحيد وأصحاب البدع الذين لم يخرجوا ببدعتهم عن الاسلام**

**Ən-Nəvəvi demişdir: Bu, alimlərin müxtəlif fikirlər səsləndirərək ixtilaf etdikləri hissədir:**

**Bu fikirlərdən biri belədir ki, burada nəzərdə tutulanlar münafiq və mürtədlərdir...**

**İkinci fikir bundan ibarətdir ki, burada nəzərdə tutulanlar Peyğəmbər (s) dövründə yaşamış, lakin ondan sonra dindən çıxmış şəxslərdir...**

**Üçüncü fikir bundan ibarətdir ki, burada nəzərdə tutulanlar tövhid üzərində ölən böyük günah sahibləri və nifaqları onları İslamdan çıxarmayan münafiqlərdir.**[314]

Beləliklə, sözügedən hədis barədə əhli-sünnə şərhlərini bu şəkildə ümumiləşdirə bilərik:

[312] İbn Həcər əl-Əsqəlani, Fəthul-bari şərh Səhihul-Buxari, c.11, s.333
[313] Əbül-Əla əl-Mubarəkfuri, Tuhfətul-əhvazi bi şərh Camiut-Tirmizi, c.9, s.6
[314] Əbül-Əla əl-Mubarəkfuri, Tuhfətul-əhvazi bi şərh Camiut-Tirmizi, c.7, s.93





- Hədislərdə qeyd olunan "səhabələr" Əbu Bəkrin dövründə islamdan çıxan bədəvi ərəblər idilər. Mühacir, Ənsar və yaxud digər böyük səhabələrdən heç biri buraya aid deyildir.
- Yaxud da, bu "səhabələr" Peyğəmbər (s) dövründəki münafiq və mürtədlər idilər.
- Yaxud da, bu "səhabələr" bütün dövrlər üzrə böyük günah və kiçik nifaq sahibləri idilər.
- Bu qrupa daxil olan "səhabələr" çox az saydadır, çünki Allah Rəsulu (s) onları kiçiltmə siğəsi ilə "useyhabi(səhabəciklərim)" çağırmışdır.

Halbuki, hədislərə diqqət yetirdikdə, bu izahların heç birinin doğru olmadığını görürük. Məsələn, hədislərdə nəzərdə tutulan səhabələr **"mənə səhabəlik etmiş və məni görmüş"**, həmçinin **"mən onları tanıyacağam, onlar da məni tanıyacaq"** kimi cümlələrlə təyin edilmişdir. Bu ifadələr nəzərdə tutulan "səhabələr"in böyük günah və kiçik nifaq sahibləri olmasını istisna edir.

Dövrümüzdə bu xüsusiyyətlərə sahib olan heç kəs Peyğəmbərə səhabəlik etməmiş və onu görməmişdir. O cümlədən, bu təsvir bədəvi ərəblərə də uyğun gəlmir. Onlar Mədinə şəhərinin ətrafındakı səhralarda yaşayan köçəri insanlar idilər. Ola bilər ki, onların bəziləri Peyğəmbəri (s) görsün, lakin şəhərdə yaxud hər hansı bir yerdə ona səhabəlik etməyiblər. Əslində, Qurani-Kərim də onları Mədinə əhalisindən ayırır:

**وممن حولكم من الأعراب منافقون ومن أهل المدينة**

**Ətrafınızdakı bədəvilər və Mədinə əhalisi içərisində ikiüzlülüyü özlərinə adət etmiş (bu işdə mahir) münafiqlər vardır.[315]**

Həmçinin:

**ما كان لأهل المدينة ومن حولهم من الأعراب أن يتخلفوا عن رسول الله ولا يرغبوا بأنفسهم عن نفسه**

**Mədinə əhalisinə və onların ətrafındakı bədəvilərə (döyüşdə) Allahın Elçisindən geri qalmaq, onun canından öncə öz canlarının hayına qalmaq yaraşmaz. [316]**

[315] Tövbə, 9:101
[316] Tövbə, 9:120





Beləliklə, bədəvi ərəblər Mədinədən kənarda yaşayırdılar, ona görə də Peyğəmbərə (s) səhabəlik edə bilməzdilər. Bunun üçün onlar əvvəlcə şəhərdə məskunlaşmalı idilər ki, bunu da heç vaxt etməyiblər. Bundan əlavə, onların əksəriyyətinin Peyğəmbəri (s) tanıması mümkünsüz idi. Onlar Peyğəmbərdən (s) uzaqda yaşayırdılar. Hətta bu bir dəfə mümkün olsaydı belə, Peyğəmbərin (s) onların əksəriyyətini görməsi mümkün olmazdı.

Belə ki, hədislər aşkar şəkildə Peyğəmbərin (s) dindən çıxmış səhabələri axirətdə tanıyacağını göstərir.

Nəticə budur ki, bidət işlərinə görə Cəhənnəmə atılacaq səhabələr Allah Rəsulu (s) ilə Mədinədə yaşamış, ona səhabəlik etmiş və şəxsən onun tərəfindən tanınan şəxslərdir.

Qeyd etdiklərimizi dəstəkləyən dəlilimiz isə Ümmül-muminin Aişənin sözləridir:

**سمعت رسول الله صلى الله عليه و سلم يقول وهو بين ظهراني أصحابه إني على الحوض أنتظر من يرد علي منكم**

**Allah Rəsulu (s) səhabələrinin qarşısında olarkən belə dediyini eşitdim: Mən hovuzun kənarında sizlərdən mənimlə görüşəcək olan kəsləri gözləyəcəyəm.**

Allah Rəsulu (s) öz səhabələrinə xitab edirdi. Təbii ki, bu hadisə Mədinədə baş verib. Belə ki, bunun əksini deyən heç bir iddia yoxdur. Sonra Peyğəmbər (s) deyir ki, hovuz kənarından ondan uzaqlaşdırılan şəxslər hal-hazırda onun qarşısında dayanan səhabələr arasından olacaq. Bundan əlavə, əl-Buxari (ö.256 h.q) bizim üçün böyük səhabənin açıq-aşkar təfsirini təqdim edir:

**حدثني أحمد بن إشكاب حدثنا محمد بن فضيل عن العلاء بن المسيب عن أبيه قال: لقيت البراء بن عازب رضي الله عنهما فقلت طوبى لك صحبت النبي صلى الله عليه و سلم وبايعته تحت الشجرة فقال يا ابن أخي إنك لا تدري ما أحدثنا بعده**

**Əhməd ibn İşkab - Muhəmməd ibn Fuzeyl - əl-Əla ibn əl-Museyyib - atası əl-Museyyib):**

**Mən əl-Bəra ibn Əziblə (r.a) görüşdüm və dedim: "Xoş halına! Sən Peyğəmbərə (s) səhabəlik etmisən və ağac altında ona beyət etmisən". Cavabında o dedi: "Ey qardaşım oğlu, sən bilmirsən biz ondan sonra nə bidətlər çıxardıq".[317]**

Bu çox mühümdür. Bu hədis təsdiq edir ki, Peyğəmbərə (s) səhabəlik edən və ağac altında ona beyət edən səhabələr ondan sonra bidət ediblər. Əl-Bəranın xitabı ümumi idi. Bu onu göstərir ki, bidətlər bu kateqoriyaya daxil olan səhabələr arasında

[317] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-səhih (müxtəsər), c.4, s.1529, №3937





geniş yayılmışdı və təbii ki, bu şəxslərin başında da Mühacir və Ənsarlar gəlirdi. Belə ki, ağac altında beyət edən çox məşhur Mühacir və Ənsardan olan səhabələr var idi. Bununla belə, onlardan bəzilərinin Quran və sünnədən kənara çıxmaları istisna deyil.

Beləliklə, Hovuz hədisində sözügedən "səhabələr" ifadəsinin bədəvi ərəblər yaxud səhablikdən çıxan şəxslərə aid olması iddiası qüvvədən düşür. Bidətçilər Mədinə əhalisindən idilər və peyğəmbərə səhabəlik etməkdən əlavə, Hüdeybiyyədə ağac altında ona beyət etmişdilər. Onlar Peyğəmbəri görmüş şəxslər olmaqla bərabər, Peyğəmbərin öz dövründə bu hədislə xitab etdiyi səhabələrin arasında idilər.

Hədisdə əsas məqamlardan biri Əbu Səid əl-Xudrinin aşağıdakı sözləridir:

**ان النبي صلى الله عليه و سلم قال فأقول أصحابي أصحابي فقيل انك لا تدري ما أحدثوا بعدك قال فأقول بعدا بعدا أو قال سحقا سحقا لمن بدل بعدي**

**Allah Rəsulu (s) buyurdu: Mən deyəcəyəm: "Ya Rəbbim, səhabələrim, səhabələrim!" Mənə deyiləcək: "Səndən sonra onların nə bidətlər çıxardıqlarını bilmirsən". Sonra mən deyəcəyəm: "Vay olsun, vay olsun məndən sonra (dindən) dönənlərə."[318]**

Bu səhabələr Peyğəmbər (s) dövründə haqq din üzərində idilər, dinə olduğu kimi riayət edirdilər. Ancaq onun dünyadan köçməsi ilə bərabər bu haqq yoldan döndülər. Bu onu göstərir ki, onlar heç vaxt haqq üzərində olmayan münafiqlər ola bilməzdilər.[319] Bu, elə hədislərin mətnindən də aydın olur. Belə ki, hədislərə əsasən, bu səhabələr məhz Peyğəmbərdən (s) sonra etdikləri bidətlərə görə Cəhənnəmə düşəcəklər.

Onların dindəki yenilikləri İslamdan xaric olma xüsusiyyəti daşıyırdı. Əlbəttə ki, bəzi bidətlər bu dərəcədə ciddi yükə malikdir. Dindən çıxmaq üçün isə əvvəlcə həqiqi dində olmalısan. Səhabələrin bidətlər səbəbilə dindən çıxmaları açıqca onların əvvəlcə İslam dinində olmalarını göstərir. Aydındır ki, burada münafiqlik əlamətindən söhbət gedə bilməz.

Əl-Xəttabi səhabələr barədə deyilmiş bu sözlərin əhatə dairəsini məhdudlaşdırmağa çalışmışdır:

---

[318] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.3, s.28, №11236

[319] Bax: Nisa, 4:142; Tövbə, 9:67-68; Fəth, 48:6





**ويدل قوله أصيحابي بالتصغير على قلة عددهم**

**Peyğəmbərin təsğirlə (kiçiltmə siğəsilə) dediyi "useyhabi" ifadəsi də onların sayının azlığına dəlildir.**

Onun fikrincə, bu dönük "səhabələr" - hansı ki, xətalı olaraq bədəvi ərəblərə aid etmişdir - sayca çox az idilər. Onun dəlili budur ki, Allah Rəsulu (s) bəzi hədislərdə onları "useyhabi" deyə çağırır. Ancaq onun qeyd etməyi unutduğu bir məsələ var ki, hədislərin əksəriyyətində Peyğəmbər (s) onları "əshabi" (أصحابي), həmçinin "qövm" sözünü cəm halı olan "əqvam" (أقوام) adlandırır. Həm "əshabi", həm də "əqvam" hədsiz dərəcədə çox saylı insanlara aid edilə bilər. Hətta "əqvam" sözü bütöv millətə və tayfaya da aid etmək olar.[320]

Hədislərdə istifadə edilmiş müxtəlif terminlərin ən məntiqli izahı budur ki, dindən çıxmış səhabələr Peyğəmbərin (s) hüzuruna bəziləri kiçik, bəziləri böyük olmaqla başqa-başqa qruplarla gələcəklər. Bu da bəzi rəvayətlərdə işlədilmiş "əqvam" (أقوام) ifadəsinə aydınlıq gətirmiş olur. Kiçik qruplara gəldikdə isə, Peyğəmbər onları "useyhabi" deyə səsləyəcək. Böyük qrupları isə "əshabi" olaraq vurğulayacaq. İmam əl-Buxari öz kitabında bizim bu fikrimizi dəstəkləyən bir rəvayət nəql etmişdir:

**حدثني إبراهيم بن المنذر الحزامي حدثنا محمد بن فليح حدثنا أبي قال حدثني هلال عن عطاء بن يسار عن أبي هريرة : عن النبي صلى الله عليه و سلم قال بينا أنا نائم إذا زمرة حتى إذا عرفتهم خرج رجل من بيني وبينهم فقال هلم فقلت أين؟ قال إلى النار والله قلت وما شأنهم؟ قال إنهم ارتدوا بعدك على أدبارهم القهقرى .ثم إذا زمرة حتى إذا عرفتهم خرج رجل من بيني وبنهم فقال هلم قلت أين؟ قال إلى النار والله قلت ما شأنهم؟ قال إنهم ارتدوا بعدك على أدبارهم القهقرى فلا أراه يخلصمنهم إلا مثل همل النعم**

**İbrahim ibn əl-Munzir əl-Huzami - Muhəmməd ibn Fuleyh - atası (Fuleyh) - Hilal - Əta ibn Yəsar - Əbu Hureyrə:**

**Peyğəmbərin belə dediyini rəvayət etdi: Yuxuda gördüm ki, bir zümrə yanıma gəldi. Elə ki mən onları tanıdım, bir nəfər gələrək mənimlə onların arasında dayandı və dedi: "Gəlin gedək". Mən dedim: "Hara?" O cavab verdi: And olsun Allah ki, Cəhənnəmə!" Soruşdum: "Onların günahı nədi ki?" Cavab verdi: "Onlar səndən sonra dindən çıxaraq keçmişlərinə geri döndülər."**

**Sonra başqa bir zümrə gəldi. Elə ki mən onları tanıdım, bir nəfər gələrək mənimlə onların arasında dayandı və dedi: "Gəlin gedək". Mən dedim: "Hara?" O cavab verdi: And olsun Allah ki,**

[320] Hans Veer, Müasir yazılı ərəb dilinin lüğəti, s.800; həmçinin bax: Dr. Ruhi Baalbaki, əl-Məvrid: Müasir ərəbcə-ingiliscə lüğət, s.877





**Cəhənnəmə!" Soruşdum: "Onların günahı nədi ki?" Cavab verdi: "Onlar səndən sonra döndülər." (Yolunu azmış) çobansız dəvə sürüsü(ndən yolu tapan dəvələr) misalındakı kimi tək-tükü istisna olmaqla, heç kimin (cəhənnəmdən) xilas olacağını sanmıram."** [321]

Hədisdə keçən "zümrə" sözünün izahında Dr.əl-Bəğa yazır:

**(زمرة) جماعة**

**Zümrə, (yəni) camaat.**[322]

Camaat sözü 2 və ya daha artıq şəxsdən ibarət istənilən qrupa aid edilə bilər. Milyon nəfərdən ibarət qrup da camaatdır. Məsələn, dünyadakı 1 milyarddan artıq əhli-sünnə əhalisi vahid bir camaatdır. Bu hədis isə 2 belə qrupdan söz açır. Bununla belə, digər hədislərdə işlədilmiş "əqvam" (أقوام) ifadəsi göstərir ki, bu qruplar ikidən çox olublar. Yuxarıda qeyd etdiyimiz isə hədis uzun bir rəvayətin qısa xülasəsini özündə əks etdirir. Hər bir halda, Allah Rəsulunun (s) işlətdiyi ifadələrdən aydın olur ki, dönük səhabələrin sayı hədsiz çox olmuşdur. Hədisin son cümləsinə diqqət yetirək:

**فلا أراه يخلصمنهم إلا مثل همل النعم**

**(Yolunu azmış) çobansız dəvə sürüsü(ndən yolu tapan dəvələr) misalındakı kimi tək-tükü istisna olmaqla, heç kimin (cəhənnəmdən) xilas olacağını sanmıram.**

Məgər Allah Rəsulu (s) deyir ki, bu mürtədlərdən tək-tükü istisna olmaqla, heç birinin (cəhənnəmdən) xilas olacağını sanmıram? Əlbəttə ki, yox. Mürtədlər axirətdə Cəhənnəmdən xilas ola bilməyəcəklər. Onlar qeyd-şərtsiz oraya daxil olacaq və əbədiyyən orada qalacaqlar.[323] O ifadənin ən aşkar mənası budur ki, hər qrupdan (zümrədən, qövmdən) çox az sayda insan xilas olacaq. Kövsər hovuzunun yanına gətirilən hər qrupdan Peyğəmbərin (s) şəxsən tanıdığı əksər səhabələr küfr bidətlərinə görə Cəhənnəmə atılacaqlar. Sadəcə çox azı azad ediləcəklər. Bu da mütləq şəkildə isbat edir ki, Peyğəmbərin (s) ölümündən sonra səhabələrin əksəriyyəti birinci dərəcəli bidətçi şəxslər olmuşlar.

[321] Muhəmməd ibn İsmayıl əl-Buxari, əl-Camius-səhih (müxtəsər), c.5, s.2407, №6215
[322] Həmin mənbə
[323] Bax: Bəqərə, 2:39; Nisa, 4:168-169; Təğabun, 64:10





Nəhayət, sözügedən dönük səhabələrdən bəzilərini tanımağın vaxtı gəlib çatdı. Biz əvvəlki fəsillərdən bildik ki, Hüdeybiyyədə ağac altında Allah Rəsulu (s) ilə beyət edən əl-Bəra ibn Əzib adlı səhabə onlardan biri idi. Həmin beyətdə iştirak edənlər Muhacir, Ənsar və digər qruplardan olan ən böyük səhabələr idilər. Şeyxul-İslam İbn Teymiyyə (ö.728 h.q.) yazır:

**ثم إن المسلمين بايعوه و دخلوا في طاعته و الذين بايعوه هم الذين بايعوا رسول الله صلى الله عليه و سلم تحت الشجرة و هم السابقون الأولون من المهاجرين و الأنصار و الذين اتبعوهم بإحسان رضي الله عنهم و رضوا عنه و هم أهل الإيمان و الهجرة و الجهاد و لم يتخلف عن بيعته إلا سعد بن عبادة**

**Sonra müsəlmanlar ona (Əbu Bəkrə) beyət edib ona itaət etməyi qəbul etdilər. Əbu Bəkrə beyət edənlər Allah Rəsuluna (s) ağac altında beyət edən həmin şəxslər idilər. Onlar ilk Mühacirlər, Ənsarlar və yaxşı işlərdə onların ardınca gedənlər idi. Allah onlardan razı idi, onlar da Allahdan razı idilər. Onlar iman, hicrət və cihad əhli idilər və Səd ibn Ubadədən başqa heç kim ona (Əbu Bəkrə) beyət etməkdən imtina etməmişdi.**[324]

Əlbəttə ki, Peyğəmbərin (s) sağlığında Allah onlardan ümumən razı idi, çünki onlar iman və saleh əməl sahibi idilər. Ancaq onlar Peyğəmbərdən sonra döndülər və dinə bidət gətirdilər. Onların bu hərəkətləri Allahın razılığınının üzərlərindən götürülməsinə və onlar üçün verilmiş əhdin təxirə düşməsinə səbəb oldu. Belə ki, bu vədələrin qüvvədə qalması iman və xeyir əməllərin sonadək davam etməsindən asılı idi.[325]

Bununla belə, əhli-sünnə rəvayətləri bəzi bidət sahibi səhabələrin adlarını açıqlayır. İmam Müslim (ö. 261 h.q.) onlardan birini belə nəql edir:

**وحدثنا محمد بن المثنى وابن بشار قال ابن المثنى حدثنا محمد بن جعفر حدثنا شعبة عن الحكم عن عمارة بن عمير عن إبراهيم بن أبي موسى عن أبي موسى أنه كان يفتي بالمتعة فقال له رجل رويدك ببعض فتياك فإنك لا تدري ما أحدث أمير المؤمنين في النسك بعد حتى لقيه بعد فسأله فقال عمر قد علمت أن النبي صلى الله عليه و سلم قد فعله وأصحابه ولكن كرهت أن يظلوا معرسين بهن في الأراك ثم يروحون في الحج تقطر رؤسهم**

**Muhəmməd ibn əl-Musənna və İbn Bəşşar - Muhəmməd ibn Cəfər - Şubə - əl-Həkəm - Əmarə ibn Umeyr - İbrahim ibn Əbi Musa - Əbu Musa:**

---

[324] İbn Teymiyyə əl-Hərrani, Minhacüs-sünnə, c.7, s.450

[325] Allah-taala Qurani-Kərimdə Öz razılığına mömінin haqq yol üzrə davamiyyətini şərt qoşmuşdur. Haqqdan döndüyü anda bütün əməllərə boşa getmiş olur (Bax: Fussilət, 41:30-32 və Əhqaf, 46:13-14). Hətta peyğəmbərimiz Hz.Muhəmmədə (s) də düz yolda olmaq əmr edilmişdir (Hud, 11:112). Bunu nəzərə alaraq, Allah-taala ona dedi ki, ümmətinə desin ki, haqqdan dönsə, o da Cəhənnəmə atılacaq (bax: Bəqərə, 2:120; Yunus, 10:15; Haqqə, 69:44-47). Deməli, Allahın hər hansı səhabədən bir dəfə razı qalması, yaxud Peyğəmbər (s) zamanında o səhabəyə Cənnəti vəd etməsi kifayət deyildir. Sübut edilməlidir ki, həmin səhabə daha sonra bidətlər çıxardaraq yaxud böyük zülmlər edərək haqq yoldan dönməmişdir.





**Mən Təməttü həcci barədə fətvalar verirdim. Bir nəfərə mənə dedi: "Bəzi fətvalarında ehtiyatlı ol, çünki sənin yoxluğunda Möminlərin Əmirinin (Ömərin) Həcc əməllərində hansı bidətləri (yenilikləri) gətirdiyini bilmirsən." Mən daha sonra onunla (Ömərlə) görüşdüm və (bu barədə) sual verdim. Cavabında o dedi: "Mən bilirəm ki, Allah Rəsulu (s) və onun səhabələri bunu yerinə yetiriblər. Ancaq mən xoşlamıram ki, evli kişilər ağacların altında zövcələri ilə cinsi əlaqəyə girib, sonra başlarından su axa-axa Həcci yerinə yetirməyə tələssinlər."[326]**

İmam Əhməd (ö.241 h.q.) daha ətraflı nəql edərək yazır:

**حدثنا عبد الله حدثني أبي ثنا عبد الرزاق أنا الثوري عن قيس بن مسلم عن طارق بن شهاب عن أبي موسى الأشعري قال ...ما زلت أفتي الناس بالذي أمرني رسول الله صلى الله عليه و سلم حتي توفي ثم زمن أبي بكر رضي الله تعالى عنه ثم زمن عمر رضي الله تعالى عنه فبينا أنا قائم عند الحجر الأسود أو المقام أفتي الناس بالذي أمرني به رسول الله صلى الله عليه و سلم إذ أتاني رجل فسارني فقال لا تعجل بفتياك فان أمير المؤمنين قد أحدث في المناسك شيئا فقلت أيها الناس من كنا أفتيناه في المناسك شيئا فليتئد فإن أمير المؤمنين قادم فبه فأتموا قال فقدم عمر رضي الله تعالى عنه فقلت يا أمير المؤمنين هل أحدثت في المناسك شيئا قال نعم إن نأخذ بكتاب الله عز و جل فإنه يأمر بالتمام وإن نأخذ بسنة نبينا صلى الله عليه و سلم فإنه لم يحلل حتى نحر الهدي**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Əbdür-Rəzzaq - əs-Səuri - Qeys ibn Müslim - Tariq ibn Şihab - Əbu Musa əl-Əşəri:**

**... Allah Rəsulu (s) dünyadan köçənə qədər onun mənə əmr etdikləri əsasında camaata fətva verməkdə davam edirdim. Əbu Bəkr (r.a) və Ömərin (r.a) zamanlarında da bu işə davam etdim. Bir gün Qara Daşın, yaxud Məqami-İbrahimin yaxınlığında dayanaraq Allah Rəsulunun (s) mənə əmr etdikləri əsasında camaata fətva verirdim. Bu zaman bir nəfər mənə yaxınlaşdı və qulağıma belə pıçıldadı: "Fətvalar verməyə tələsmə, çünki Möminlərin Əmiri Həcc əməllərində bidət gətirib". Mən dedim: "Ey insanlar, Həcc əməlləri barədə kimə fətva vermişəmsə, gözləsin. Belə ki, Möminlərin Əmiri sizin yanınıza gəlmək üzrədir və siz onun ardınca getməlisiniz.**

**Daha sonra Ömər (r.a) gəldi. Mən dedim: Ey Möminlərin Əmiri! Həcc əməllərində nəsə yenilik (bidət) etmisən? O cavab verdi: "Bəli. Əgər biz Allahın kitabına tabe olsaq, orada "ət-təmam" (Təməttü həcci) yerinə yetirilməsi əmr edilir. Əgər Peyğəmbərin (s) sünnəsinə tabe olsaq, o, qurbanını kəsməyənə qədər ehramdan çıxmırdı.[327]**

Şeyx əl-Ərnaut dedi:

**إسناده صحيح على شرط الشيخين**

**Sənədi iki şeyxin (əl-Buxari və Müslimin) şərtlərinə əsasən səhihdir.[328]**

[326] Müslim ibn əl-Həccac, əs-Səhih, c.2, s.896, №1222 (157)
[327] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.4, s.393, №19523
[328] Həmin mənbə





Bəs görəsən Ömərin Həcc əməllərində açıqca etiraf etdiyi bidəti nədən ibarət idi? İmam ən-Nəsai (ö.303 h.q.) bu suala cavab olaraq aşağıdakı rəvayəti nəql edir:

**أخبرنا محمد بن علي بن الحسن بن شقيق قال أنبأنا أبي قال أنبأنا أبو حمزة عن مطرف عن سلمة بن كهيل عن طاوس عن بن عباس قال سمعت عمر يقول والله إني لأنهاكم عن المتعة وإنها لفي كتاب الله ولقد فعلها رسول الله صلى الله عليه و سلم يعني العمرة في الحج**

**Muhəmməd ibn Əli ibn əl-Həsən ibn Şəqiq - atası (Əli ibn əl-Həsən) - Əbu Həmzə - Mutərrif - Sələmə ibn Kuheyl - Tavus - İbn Abbas:**

**Ömərin belə dediyini eşitdim: "And olsun Allaha, Təməttü həcci Allahın kitabında olsa da, Allah Rəsulu (s) yerinə yetirsə də, mən onu qadağan edirəm." O, Həcc zamanı Ümrə əməlini nəzərdə tuturdu.[329]**

Əllamə əl-Əlbani deyir:

**صحيح الإسناد**

**Sənədi səhihdir.[330]**

Maraqlıdır, elə deyilmi? Allah Qurani-Kərimdə Təməttü həccinin yerinə yetirilməsini əmr edir, Allah Rəsulu (s) bunu yerinə yetirir və səhabələrinə də göstəriş verir, lakin Ömər özünə Allahın əmrinə qarşı çıxmaq və Peyğəmbərin (s) sünnəsini qadağan etmək səlahiyyəti götürmüşdür. Maraqlıdır ki, o özü etiraf edir ki, bu iş Həcc əməllərində bidətdir, yəni yenilikdir. Buna baxmayaraq, o işinə davam etmişdir. Bundan da dəhşətlisi Əbu Musanın öz ardıcıllarına Ömərin bidəti qarşısında Quran və sünnənin tərk etmələrinə göstəriş verməsidir!

Bu hadisə sözügedən böyük səhabələrin Allahın Qanunlarının üzərindən istədikləri şəkildə keçməkdə necə həyasızlıq etdiklərini ortaya çıxarır. Sadəcə öz rəhbərlərini razı salmaqdan ötrü Quran və sünnənin hökmlərini asanlıqla tərk edirdilər. Ömər kimi şəxslər isə öz bidətləri ilə Allahın Qanunlarını sıxışdırıb çıxarmaqda heç bir problem görmür və gözünü qırpmadan həyata keçirdirdilər. Hər bir halda, bu hədisi təqdim etməkdə əsas məqsəd Ömərin bidətçi olduğunu göstərmək idi və həmd olsun Allaha ki, o özü də bunu açıq-aşkar təsdiq etmişdir.[331]

---

[329] Əhməd ibn Şueyb ən-Nəsai, əl-Muctəba min əs-Sünən, c.5, s.153, №2736

[330] Həmin mənbə

[331] Ömərin məsələsinin dindən döndükləri üçün Kövsər hovuzundan uzaqlaşdırılan səhabələrin vəziyyətindən daha ciddi olduğu görünür. Dəlillər göstərir ki, Ömər onlardan daha betər dəstədə olacaq. O səhabələr ən azı Peyğəmbərin (s) sağlığında Quran və sünnə üzərində, həqiqi iman və tövhid üzərində idilər. Onlar sadəcə Peyğəmbərin (s) ölümündən sonra bidət əməlləri nəticəsində dindən çıxdılar. Bunun əksinə olaraq, Peyğəmbərin





Bidəti açıq-aşkar olan digər böyük səhabə əhli-sünnənin üçüncü xəlifəsi Osman ibn Əffandır. Ömərin ölümündən sonra Osman onun bidətlərini davam etdirdi. Necə ki, İmam Müslim bu barədə yazır:

**حدثنا محمد بن المثنى وابن بشار قال ابن المثنى حدثنا محمد بن جعفر حدثنا شعبة عن قتادة قال قال عبدالله ابن شقيق كان عثمان ينهى عن المتعة وكان علي يأمر بها فقال عثمان لعلي كلمة ثم قال علي لقد علمت أنا قد تمتعنا مع رسول الله صلى الله عليه و سلم فقال أجل ولكنا كنا خائفين**

**Muhəmməd ibn əl-Musənna və İbn Bəşşar - Muhəmməd ibn Cəfər - Şubə - Qətadə - Abdullah ibn Şəqiq:**

**Osman Təməttü həccini qadağan edir, Əli isə insanlara ona əməl etməyi əmr edirdi. Nəticədə Osman Əliyə bir söz dedi. Sonra Əli dedi: "Sən bilirsən ki, biz Allah Rəsulu (s) ilə Təməttü həccini yerinə yetirirdik." O cavab verdi: "Doğrudur, lakin biz o zaman qorxurduq."**[332]

Osman hansı qorxudan danışırdı görəsən? Peyğəmbər (s) və səhabələri Təməttü həcci edəndə heç bir qorxu yox idi. Hətta bu bidətin yaradıcısı olan Ömər də tarixə bu cür gülməli şəkildə dəyişiklik etməyə cəhd etməmişdi. Əlavə olaraq, Ömər özü bu işi bidət adlandırmışdı. Beləliklə, Osmanın müdafiə üçün heç bir imkanı yox idi. İmam Əhməd yazır:

**حدثنا عبد الله حدثني أبي ثنا محمد بن جعفر ثنا شعبة عن الحكم عن على بن الحسين عن مروان بن الحكم انه قال شهدت عليا وعثمان رضي الله عنهما بين مكة والمدينة وعثمان ينهى عن المتعة وان يجمع بينهما فلما رأى ذلك على رضي الله عنه أهل بهما فقال لبيك بعمرة وحج معا فقال عثمان رضي الله عنه تراني أنهى الناس عنه وأنت تفعله قال لم أكن أدع سنة رسول الله صلى الله عليه و سلم لقول أحد من الناس**

**Abdullah (ibn Əhməd) - atası (Əhməd ibn Hənbəl) - Muhəmməd ibn Cəfər - Şubə - əl-Həkəm - Əli ibn əl-Hüseyn - Mərvan ibn əl-Həkəm:**

**Mən Əli ilə Osmanı -** ***Allah hər ikisindən razı olsun*** **- Məkkə ilə Mədinənin arasında gördüm. Osman Təməttü həccini və onları (Həcc və Ümrəni) birləşdirməyi qadağan edirdi. Əli (r.a) bunu gördükdə, hər iksi üçün ehram bağladı və dedi: "Ləbbeyk bi Umrə və Həcc". Osman (r.a) dedi: "Görürsən ki mən bunu camaata qadağan edirəm, sən isə yenə də edirsən". O (Əli) cavab verdi: "Mən kiminsə sözünə görə heç vaxt Allah Rəsulunun (s) sünnəsini tərk etmərəm".**[333]

(s) sağlığında Ömər ibn əl-Xəttabın imanı barədə ciddi şübhələr var. Məsələn, o, Allah Rəsulunu (s) sayıqlamaqda ittiham edən səhabələrin başçısı idi. Həqiqi mömin bu işi görməzdi. Hər bir halda, əhli-sünnə qardaşlarımız təkid edirlər ki, Ömər həqiqi iman əhli olub. Buna baxmayaraq, onlar Peyğəmbərin (s) ölümündən sonra Ömərin bidətçi olmasını inkar edə bilməzlər.

[332] Müslim ibn əl-Həccac, əs-Səhih, c.2, s.896, №1223 (158)

[333] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.1, s.135, №1139





Əssəlamu əleykə, ya Əmirəl-muminin Əli ibn Əbi Talib! Ömərin bidətindən ötrü Peyğəmbər (s) sünnəsini tərk edən Əbu Musadan fərqli olaraq, Əli (ə) bunu tərk etməmişdi.

Həmçinin, Ömərin bidətini davam etdirməklə kifayətlənməyən Osman özü də İslama yenilik gətirmişdi. İmam Əbu Davud (ö.275 h.q.) yazır:

**حدثنا محمد بن سلمة المرادي ثنا ابن وهب عن يونس عن ابن شهاب قال أخبرني السائب بن يزيد أن الأذان كان أوله حين يجلس الإمام على المنبر يوم الجمعة في عهد النبي صلى الله عليه و سلم وأبي بكر وعمر [رضي الله عنهما] فلما كان خلافة عثمان وكثر الناس أمر عثمان يوم الجمعة بالأذان الثالث فأذن به على الزوراء (الزوراء موضع بسوق المدينة) فثبت الأمر على ذلك**

**Muhəmməd ibn Sələmə əl-Muradi - İbn Vəhb - Yunus - İbn Şihab - əl-Saib ibn Yezid:**

**Peyğəmbər (s), Əbu Bəkr və Ömərin zamanlarında Cümə gününün birinci azanı imam minbərdə oturanda oxunurdu. Ancaq Osmanın xəlifəliyi dövründə insanlar çoxaldığı üçün o, əz-Zəvra (Mədinə bazarında bir yer idi) üzərində oxunan üçüncü azan əlavə etdi. Beləliklə, bu iş beləcə davam etdi.[334]**

Əl-Əlbani deyir:

**صحيح**

**Səhihdir.[335]**

Başqa sözlə desək, Peyğəmbərin (s) dövründə ilk azan o, minbərdə oturanda oxunurdu. Daha sonra, ikincisi - yəni, əslində iqamə oxunurdu ki, bu da son idi. İmam əl-Mübarəkfuri (ö.1282 h.q.) belə şərh edir:

**والمعنى كان الأذان في العهد النبوي وعهد أبي بكر وعمر أذانين أحدهما حين خروج الإمام وجلوسه على المنبر والثاني حين إقامة الصلاة فكان في عهدهم الأذانان فقط ولم يكن الأذان الثالث والمراد بالأذانين الأذان الحقيقي والإقامة**

**"Peyğəmbər, Əbu Bəkr və Ömərin dövründə iki azan oxunurdu" cümləsinin mənası budur ki, azanlardan biri imam gəlib minbərdə oturanda, ikincisi isə namazın iqaməsində oxunurdu. Onların vaxtında azan iki idi, üçüncüsü yox idi. İki azan deyildikdə, azanın özü və iqamə nəzərdə tutulur.[336]**

Bu həqiqi sünnə idi. Ancaq Osman isə bazarın yanında oxunan üçüncü bir azan icad etmişdi. Buna həmçinin, "ilk azan" da deyirdilər, çünki əsl azandan öncə oxunurdu. İmam İbn Xuzeymə (ö.311 h.q.) yazır:

---

334 Əbu Davud əs-Sicistani, Sünən, c.1, s.352, №1087
335 Həmin mənbə
336 Əbül-Əla əl-Mubarəkfuri, Tuhfətul-əhvazi bi şərh Camiut-Tirmizi, c.3, s.39





أن سلم بن جنادة حدثنا : و كيع عن ابن أبي ذئب عن الزهري عن السائب بن يزيد قال كان الأذان على رسول الله صلى الله عليه و سلم أبي بكر و عمر أذانين يوم الجمعة حتى كان زمن عثمان فكثر الناس فأمر بالأذان الأول بالزوراء

**Sələm ibn Cunadə - Vəki - İbn Əbi Zaib - əz-Zuhri - əs-Saib ibn Yezid:**

**Allah Rəsulu (s), Əbu Bəkr və Ömərin dövrlərində Cümə günü iki azan oxunurdu. Bu hal Osmanın dövrünə qədər belə davam etdi. O isə əhalinin sayı artıdğı üçün ilk azanın əz-Zəvrada deyilməsini əmr etdi.[337]**

Əl-Əlbani yazır:

إسناده صحيح

**Sənədi səhihdir.[338]**

Əl-Mübarəkfuri yazır:

قال الحافظ في رواية وكيع عن ابن أبي ذئب فأمر عثمان بالأذان الأول ونحوه للشافعي من هذا الوجه ولا منافاة بينهما لأنه باعتبار كونه مزيدا يسمى ثالثا وباعتبار كونه جعل مقدما على الأذان والإقامة يسمى أولا

**Əl-Hafiz dedi: Vəkinin İbn Əbi Zəiibdən nəql etdiyi rəvayətdə (əz-Zəvrada oxunan) ilk azanı Osmanın əmr etdiyi deyilir. Əş-Şafei də buna bənzər şəkildə nəql etmişdir. Bu ikisi arasında ziddiyyət yoxdur. Belə ki, bu azan əlavə olduğu üçün üçüncü (azan) adlandırılmışdı. Azan və iqamədən əvvəl oxunduğu üçün isə birinci (azan) deyilmişdir.[339]**

Bununla belə, əhli-sünnənin bəzi öndəgedən alimləri Osmanın yeni azanının bidət olduğunu bildirmişlər. İmam İbn Əbi Şeybə (ö.235 h.q.) bunlardan birini belə nəql edir:

حدثنا ابن علية عن برد عن الزهري قال كان الأذان عند خروج الامام فأحدث أمير المؤمنين عثمان التأذينة الثالثة على الزوراء ليجتمع الناس.

**Bizə İbn Uləyyə Burddan, o da əz-Zühridən onun belə dediyini nəql etmişdir: "Azan (ilk olaraq) imam (məscidə) gələndə oxunurdu. Ancaq Möminlərin Əmiri Osman camaatı toplamaq üçün əz-Zəvrada oxunan üçüncü azanı icad etdi.[340]**

Əl-Hafiz (ö.852 h.q.) birinci ravinin tərcümeyi-halında yazır:

إسماعيل بن إبراهيم بن مقسم الأسدي مولاهم أبو بشر البصري المعروف بابن علية ثقة حافظ

**İsmail ibn İbrahim ibn Miqsam əl-Əsədi - onların azad edilmiş quludur - Əbu Bişr əl-Bəsri: İbn Uleyyə kimi məşhurdur. Siqədir, hafizdir.[341]**

Digər ravi barədə isə aşağıdakıları bildirmişdir:

---

[337] Muhəmməd ibn Xuzeymə, Səhih, c.3, s.137, №1774
[338] Həmin mənbə
[339] Həmin mənbə
[340] Əbu Bəkr Abdullah ibn Əbi Şeybə, əl-Müsənnəf, c.2, s.48, №6
[341] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.90, №417





برد بن سنان أبو العلاء الدمشقي نزيل البصرة مولى قريش صدوق رمي بالقدر

**Burd ibn Sinan, Əbu əl-Əla əd-Diməşqi, Bəsrədə məskunlaşmışdı, Qureyşin azad edilmiş quludur: Səduqdur, qədərə inanmaqda təqsirləndirilmişdir.**[342]

Beləliklə, rəvayətin sənədi həsəndir. Əz-Zühri özü isə İmam əz-Zəhəbinin (ö.748 h.q.) də bildirdiyi kimi, böyük əhli-sünnə imamıdır:

محمد بن مسلم بن عبيد الله بن عبد الله بن شهاب بن عبد الله بن الحارث بن زهرة بن كلاب بن مرة بن كعب بن لؤي بن غالب، الامام العلم، حافظ زمانه أبو بكر القرشي الزهري المدني نزيل الشام .روى عن ابن عمر، وجابر بن عبد الله شيئا قليلا، ويحتمل أن يكون سمع منهما، وأن يكون رأى أبا هريرة، وغيره

**Muhəmməd ibn Müslim ibn Ubeydullah ibn Abdullah ibn Şihab ibn Abdullah ibn əl-Haris ibn Zuhrə ibn Kilab ibn Murrə ibn Kəb ibn Luəyy ibn Ğalib: alimlərin alimi, öz dövrünün hafizidir. Əbu Bəkr əl-Qurəşi əz-Zuhri əl-Mədəni. Suriyada yaşamışdır. İbn Ömər və Cabir ibn Abdullahdan az sayda rəvayət nəql etmişdir. Ona görə də mümkündür ki, onların hər iksindən eşitsin. O cümlədən, Əbu Hüreyrə və digərlərini görməsi də mümkündür.**[343]

Bu böyük imam Osmanın əməlini yenilik, bidət hesab edirdi.

Bundan əlavə, İbn Əbi Şeybə daha da mühüm bir rəvayət nəql etmişdir:

حدثنا شبابة قال حدثنا هشام بن الغاز عن نافع عن ابن عمر قال الأذان الأول يوم الجمعة بدعة.

**Şubabə - Hişam ibn əl-Ğaz - Nafe - İbn Ömər:**

**"Cümə günü oxunan birinci azan bidətdir."**[344]

Əl-Hafiz birinci ravi barədə deyir:

شبابة بن سوار المدائني أصله من خراسان يقال كان اسمه مروان مولى بني فزارة ثقة حافظ رمي بالإرجاء

**Şubabə ibn Səvar əl-Mədaini. Əslən Xorasandandır. Onun (əsl) adının Mərvan olduğu deyilmişdir. Bəni-Fəzarənin azad edilmiş quludur. Siqədir, hafizdir, mürciəlikdə ittiham edilmişdir.**[345]

İkinci ravi barədə yazır:

هشام بن الغاز بن ربيعة الجرشي بضم الجيم وفتح الراء بعدها معجمة الدمشقي نزيل بغداد ثقة

**Hişam ibn əl-Ğaz əl-Curəşi əd-Diməşqi. Bağdadda yaşamışdır. Siqədir.**[346]

Sonuncu ravi də əl-Hafizə görə etibarlı ravidir:

نافع أبو عبد الله المدني مولى ابن عمر ثقة ثبت فقيه مشهور

---

[342] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.123, №654
[343] Şəmsuddin əz-Zəhəbi, Siyəru əlamin-nubəla, c.5, s.326, №160
[344] Əbu Bəkr Abdullah ibn Əbi Şeybə, əl-Müsənnəf, c.2, s.48, №3
[345] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.410, №2741
[346] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.S.268, №7331





**Nafe; Əbu Abdullah əl-Mədəni. İbn Ömərin azad edilmiş quludur. Siqədir, səbtdir, məşhur fəqihdir.**[347]

Deməli, rəvayətin sənədi səhihdir. Böyük səhabələrdən biri olan İbn Ömər Osmanın yeni əlavə etdiyi azanı bidət hesab edirdi.

İbn Əbi Şeybə bu rəvayəti dəstəkləyən başqa bir rəvayət də nəql etmişdir:

**حدثنا وكيع قال حدثنا بن الغاز قال سألت نافعا مولى ابن عمر عن الأذان الأول يوم الجمعة فقال :قال ابن عمر :بدعة.**

**Bizə Vəki rəvayət etdi və dedi: bizə İbn əl-Ğaz rəvayət etdi və dedi: İbn Ömərin azad edilmiş qulu olan Nafidən cümə gününün ilk azanı barədə soruşdum. O cavab verdi: İbn Ömər demişdir: "Bu, bidətdir".**[348]

Burada bizim üçün yeni ravi Vəkidir. Gəlin görək əl-Hafiz onun barəsində nə deyib:

**وكيع بن الجراح بن مليح الرؤاسي بضم الراء وهمزة ثم مهملة، أبو سفيان الكوفي ثقة حافظ عابد**

**Vəki ibn əl-Cərrah ibn Məlih ər-Ruvasi, Əbu Süfyan əl-Kufi: siqədir, hafizdir, abiddir.**[349]

Beləliklə, bu rəvayətin də sənədi səhihdir.

Bununla belə, əl-Mübarəkfuri Osmanın bu işinə haqq qazandırmağa çalışmışdır:

**وروى ابن أبي شيبة من طريق ابن عمر قال الأذان الأول يوم الجمعة بدعة فيحتمل أن يكون قال ذلك على سبيل الانكار ويحتمل أنه يريد أنه لم يكن في زمن النبي صلى الله عليه وسلم وكل ما لم يكن في زمنه يسمى بدعة لكن منها ما يكون حسنا ومنها ما يكون بخلاف ذلك وتبين بما مضى أن عثمان أحدثه لإعلام الناس بدخول وقت الصلاة**

**İbn Əbi Şeybə İbn Ömərin "Cümə günü oxunan ilk azan bidətdir", - dediyini rəvayət etmişdir. Mümkündür ki, o narazılığını bildirmək üçün belə demişdir. Həmçinin, mümkündür ki, bunun Peyğəmbər (s) zamanında mövcud olmadığını və Peyğəmbər (s) dövründə olmayan hər bir şeyin bidət olmasını nəzərdə tutmuşdur. Bununla belə, onlardan (bidətlərdən) bəziləri yaxşıdır (bidətul-həsənə), bəziləri isə yox. Əvvəlki bəhsimizdən də məlum olduğu kimi, Osman bunu camaata namaz vaxtını elan etmək üçün icad eləmişdi.**[350]

Deməli, bütün bunlardan sonra bu əməlin yaxşı bidət olması ortaya çıxır. Eləmi? Bəs Allah Rəsulunun (s) aşağıdakı sözlərini nəzərə alsaq necə olacaq?

**شر الأمور محدثاتها وكل محدثة بدعة وكل بدعة ضلالة وكل ضلالة في النار**

[347] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.239, №7111
[348] Əbu Bəkr Abdullah ibn Əbi Şeybə, əl-Müsənnəf, c.2, s.48, №7
[349] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.ps.283-284, №7441
[350] Əbül-Əla əl-Mubarəkfuri, Tuhfətul-əhvazi bi şərh Camiut-Tirmizi, c.3, s.40





**Ən şər işlər (dinə) əlavə olunan yeniliklərdir. Hər bir yenilik isə bidət, hər bidət də zəlalətdir. Hər bir zəlalət isə cəhənnəmdədir.[351]**

Əl-Əlbani demişdir:

**صحيح**

**Səhihdir.[352]**

Osmanın əməli "yenilik" və "bidət" idi. Bu da öz növbəsində, həmin bidəti gətirəni də, onun davamçılarını da Cəhənnəmə aparan bir "zəlalət" idi.

Səhabələr arasında digər bidətçi isə Müaviyə ibn Əbi Süfyan idi. İmam əl-Mübarəkfuri bunu təsdiq edir:

**وروى ابن أبي شيبة في المصنف بإسناد صحيح عن ابن المسيب قال أول من أحدث الأذان في العيد معاوية**

**İbn Əbi Şeybə öz "əl-Musənnəf" əsərində səhih sənədlə İbn əl-Museyyibdən belə nəql edir: "Bayramlarda azan yeniliyini gətirən ilk şəxs Müaviyə idi."[353]**

İmam Əliyə (ə) qarşı onunla bir cərgədə olan xanım Aişə də bidət iş gördüyünü etiraf etmişdir. İmam İbn Əbi Şeybə yazır:

**حدثنا أبو أسامة حدثنا إسماعيل بن أبي خالد عن قيس قال قالت عائشة لما حضرتها الوفاة ادفنوني مع أزواج النبي صلى الله عليه وسلم فإني كنت أحدث بعده.**

**Bizə Əbu Üsamə nəql edib dedi: bizə İsmayıldan, o da Qeysdən nəql edib dedi: Aişə vəfat edən vaxt belə dedi: “Məni Peyğəmbərin xanımlarının yanında dəfn edin. Mən Peyğəmbərdən sonra (xoşagəlməz və ya bidət) bir iş gördüm”.[354]**

Həmçinin:

**حدثنا أبو أسامة قال حدثنا إسماعيل عن قيس قال: قالت عائشة لما حضرتها الوفاة: ادفنوني مع أزواج النبي عليه السلام فإني كنت أحدثت بعده حدثا.**

**Bizə Əbu Üsamə nəql edib dedi: bizə İsmayıldan, o da Qeysdən nəql edib dedi: Aişə vəfat edən vaxt belə dedi: “Məni Peyğəmbərin xanımlarının yanında dəfn edin. Mən Peyğəmbərdən sonra bidət bir iş gördüm”. [355]**

Əl-Hafiz birinci ravi haqqında yazır:

**حماد بن أسامة القرشي مولاهم الكوفي أبو أسامة مشهور بكنيته ثقة ثبت ربما دلس وكان بأخرة يحدث من كتب غيره**

[351] Əhməd ibn Şueyb ən-Nəsai, əl-Muctəba min əs-Sünən, c.3, s.188, №1578
[352] Həmin mənbə
[353] Əbül-Əla əl-Mubarəkfuri, Tuhfətul-əhvazi bi şərh Camiut-Tirmizi, c.3, s.62
[354] Əbu Bəkr Abdullah ibn Əbi Şeybə, əl-Müsənnəf, c.3, s.230, №4
[355] Əbu Bəkr Abdullah ibn Əbi Şeybə, əl-Müsənnəf, c.8, s.708, №16





**Həmmad ibn Usamə əl-Qurəşi - onların azad edilmiş quludur - əl-Kufi, Əbu Usamə künyəsi ilə məşhurdur. Siqədir, səbtdir, bununla belə tədlis etmişdir. Ömrünün sonlarında başqalarının kitablarından rəvayət edərdi.[356]**

Bizim gətirdiyimiz rəvayətdə isə tədlisdən söz gedə bilməz. Belə ki, o hədisi birbaşa İsmayıldan eşitdiyini (أبو أسامة قال حدثنا إسماعيل) demişdir.

İsmayıl barədə isə əl-Hafiz yazır:

**إسماعيل بن أبي خالد الأحمسي مولاهم البجلي ثقة ثبت**

**İsmayıl ibn Əbi Xalid əl-Əhməsi - onların azad etdikləri quldur - əl-Bəcəli: siqədir, səbtdir.[357]**

Nəhayət, sonuncu ravi barədə deyir:

**قيس بن أبي حازم البجلي أبو عبد الله الكوفي ثقة**

**Qeys ibn Əbi Hazim əl-Bəcəli, Əbu Abdullah əl-Kufi: siqədir.[358]**

Beləliklə, hədisimiz səhihdir. İmam əl-Hakim (ö.403 h.q.) yazır:

**حدثنا أبو العباس محمد بن يعقوب ثنا أبو البحتري عبد الله بن محمد بن بشر العبدي ثنا إسماعيل بن أبي خالد عن قيس بن أبي حازم قال قالت عائشة رضي عنها : وكانت تحدث نفسها أن تدفن في بيتها مع رسول الله صلى الله عليه وسلم وأبي بكر فقالت : إني أحدثت بعد رسول الله صلى الله عليه وسلم حدثا أدفنوني مع أزواجه فدفنت بالبقيع**

**Əbül-Abbas Muhəmməd ibn Yaqub - Əbul-Bəhtəri Abdullah ibn Muhəmməd ibn Bişr əl-Əbdi - İsmayıl ibn Əbi Xalid - Qeys ibn Əbi Hazim:**

**Aişə (r.a) - o, öz evində Allah Rəsulu (s) və Əbu Bəkrlə birlikdə dəfn edilməsini vəsiyyət edərdi - dedi: "Mən Peyğəmbərdən sonra bidət bir iş gördüm. Məni Peyğəmbərin xanımlarının yanında dəfn edin." Beləliklə, onu Bəqidə dəfn etdilər.[359]**

Əl-Hakim yazır:

**هذا حديث صحيح على شرط الشيخين**

**Bu hədis iki şeyxin (əl-Buxari və Müslimin) şərtlərinə əsasən səhihdir.[360]**

İmam əz-Zəhəbi də onunla razılaşır:

**على شرط البخاري ومسلم**

**Əl-Buxari və Müslimin şərtlərinə əsasəndir.[361]**

Aşkardır ki, məşhur səhabələr də daxil olmaqla, müxtəlif səhabələrin yenilik və bidətlərinin siyahısı sonsuzdur. Biz yalnızca onların çox az bir hissəsini nəql etdik ki,

[356] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, ps.236-237, №1492
[357] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.1, s.93, №439
[358] İbn Həcər əl-Əsqəlani, Təqribut-təhzib, c.2, s.32, №5583
[359] Əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn, c.4, s.7, №6717
[360] Həmin mənbə
[361] Həmin mənbə





kitabımızın həcmi çox olmasın. Bundan əlavə, təqdim etdiyimiz az sayda misalların kitabın məqsədinə kifayətedici dərəcədə xidmət etdiyinə inanırıq.

Bəzi əhli-sünnə qardaşlarımızın ağlasığmaz xətalarından biri də budur ki, biz onlara müxtəlif səhabələrin dinə gətirdikləri bidətləri ifşa edən əhli-sünnə rəvayətlərini təqdim etdikdə, qarşılığında bizə aşağıdakı rəvayəti cavab olaraq qeyd edirlər:

**حدثنا عبد الله حدثني وهب بن بقية الواسطي أخبرنا خالد بن عبد الله عن حصين عن المسيب بن عبد خير عن أبيه قال قام علي فقال خير هذه الأمة بعد نبيها أبو بكر وعمر وأنا قد أحدثنا بعدهم أحداثا يقضى الله تعالى فيها ما شاء**

**Abdullah (ibn Əhməd) - Vəhb ibn Bəqiyyə əl-Vasiti - Xalid ibn Abdullah - Hüseyn - əl-Musəyyəb ibn Əbdi-Xeyr - atası (Əbdi-Xeyr):**

**Əli ayağa duraraq dedi: "Peyğəmbərdən sonra bu ümmətin ən xeyirlisi Əbu Bəkr və Ömərdir. Biz onlardan sonra bidət işlər gördük. Allah-Taala onlar (bidət işlərimiz) barədə özü istədiyi kimi hökm verəcək.**[362]

Əl-Ərnaut deyir:

**إسناده صحيح**

**Sənədi səhihdir.**[363]

Həmçinin, bir başqa yerdə oxuyuruq:

**حدثنا عبد الله حدثني أبو بحر عبد الواحد البصري ثنا أبو عوانة عن خالد بن علقمة عن عبد خير قال قال علي رضي الله عنه لما فرغ من أهل البصرة إن خير هذه الأمة بعد نبيها صلى الله عليه و سلم أبو بكر وبعد أبي بكر عمر وأحدثنا أحداثا يصنع الله فيها ما شاء**

**Abdullah (ibn Əhməd) - Əbu Bəhr Əbdül-Vahid əl-Bəsri - Əbu Əvanə - Xalid ibn Əlqəmə - Əbdi-Xeyr:**

**Əli (r.a) Bəsrə əhli ilə işini bitirdikdən sonra buyurdu: Həqiqətən Peyğəmbərdən (s) sonra bu ümmətin ən xeyirlisi Əbu Bəkr, ondan sonra isə Ömərdir. Biz isə bidət işlər gördük və Allah bunlar barədə özü istədiyi kimi hökm verəcək.**[364]

Şeyx əl-Ərnaut deyir:

**إسناده صحيح**

**Sənədi səhihdir.**[365]

---

[362] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.1, s.115, №926 və c.1, s.125, №1032
[363] Həmin mənbə
[364] Əhməd ibn Hənbəl, əl-Müsnəd, c.1, s.125, №1031
[365] Həmin mənbə





Bu şəxslər demək istəyirlər ki, əgər siz gətirdiyiniz hədislər əsasında bəzi səhabələrin bidətçi olduğunu deyirsizsə, onda Əli ibn Əbi Talibi (ə) də bidətçi elan etməlisiniz. Maraqlıdır ki, onlar bununla kimi inandırmağa çalışırlar? Əhli-sünnə qardaşlarını yoxsa şiə? Əgər bu rəvayəti şiəyə qarşı istifadə edirlərsə, bu çox ümidsiz bir cəhddir. Belə ki, kitabın müəllifi olan Əhməd ibn Hənbəlin şiə rical elminə görə halı məchuldur.[366]

Beləliklə, bu kitabda qeyd olunan hər bir şey avtomatik olaraq sənəd baxımından qüvvədən düşür. Rəvayəti nəql edən Əhməd ibn Hənbəlin oğlu barədə də rical kitablarımızda məlumat yoxdur.[367] Əbdi-Xeyr də onlar kimi məchuldur.[368] Qeyd edilmiş hər iki sənəddəki müxtəlif ravilər də zəif ravilərdir. Nəticə olaraq, rəvayət həddən artıq zəif və əslində uydurmadır. Ayətullahul-üzma ət-Tüstəri deyir:

**ثم إن الذهبي نقل روايتهم عنه، عن المسيب بن عبد خير، عن أبيه سمع عليا يقول: ألا أن خير هذه الأمة بعد نبيها أبو بكر وعمر .ولابد أنهم وضعوها عليه.**

**Daha sonra əz-Zəhəbi onların rəvayətini ondan, o da əl-Musəyyəb ibn Əbdi-Xeyrdən, o da atasından rəvayət edir ki, Əlinin belə dediyini eşitdim: "Həqiqətən, Peyğəmbərdən (s) sonra bu ümmətin ən xeyirlisi Əbu Bəkr və Ömərdir." Şübhə yoxdur ki, onlar bunu uydurmuş və ona (Əliyə) nisbət vermişlər.[369]**

Deməli, şiə rical şərtlərinə əsasən, bu rəvayət uydurmadır və şiə əleyhinə dəlil hesab edilə bilməz.

Bununla belə, onlar əhli-sünnə standartlarına əsasən də zəifdirlər. Belə ki, onun mətni Səqəleyn, Xəlifəteyn və s. kimi bir çox səhih rəvayətlərə ziddirlər.[370] Nəzərə alaq ki, Səqəleyn hədisi özünün bir çox səhih və həsən sənədləri ilə bu rəvayətdən çox-çox mötəbərdir. Belə olduqda, Əbdi-Xeyrin rəvayətinin mətni özündən daha səhih rəvayətə zidd olduğu üçün münkər və müvafiq olaraq da zəif hesab edilir.

Bundan əlavə, əvvəlki fəsillərdə qeyd etdiyimiz kimi, "Səhih Müslim"dəki etibarlı rəvayətə görə, Əli həm Əbu Bəkri, həm də Öməri yalançı, vəfasız və xain

[366] Muhəmməd əl-Cəvahiri, əl-Müfid min mucəmur-ricalil-hədis, s.42, №855
[367] Əli ən-Namazi əş-Şəhrudi, Müstədrəkat ilmur-ricalil-hədis, c.4, s.475, №8043
[368] Muhəmməd əl-Cəvahiri, əl-Müfid min mucəmur-ricalil-hədis, s.306, №6304
[369] Muhəmməd Təqi ət-Tüstəri, Qamusur-rical, c.11, s.165, №8553
[370] Biz bunların əksəriyyətini əvvəlki "Ən üstün səhabə: Əli" və "Əlinin xilafətə Əbu Bəkrdən daha layiq olması barədə" kitablarımızda analiz etmişik.





hesab edirdi. Belə olduqda, biz onların ümmətin ən xeyirliləri olduğunu necə deyə bilərik? Əmirəl-muminin (ə) bu barədə daha agah idi.

Buraya qədər qeyd etdiklərimiz bir daha sübut edir ki, Peyğəmbərin öz ümməti üçün Əhli-beytə (ə) tabe olmağın zəlalətdən qoruması barədə xəbərdarlıq etməsi diqqətə alınmalı məsələ idi. Səqəleyn hədisinə tabe olmaqdan boyun qaçıran səhabələr daha sonra haqq yoldan çıxaraq bidətçi oldular. Əgər onlar özlərinə ali rəhbər və hidayətedici olaraq Peyğəmbərin (s) itrətini götürsəydilər, "Səqəleyn" hədisinin zəmanəti ilə Quran və sünnə üzərində qalacaqdılar. Biz də öz növbəmizdə səhabələrin baha başa gələn bu xətalarından dərs çıxarmalı və ömrümüzün sonunadək Allaha doğru yolumuzda sabitqədəm qalmalıyıq.





## Ədəbiyyat siyahısı

1. Əbdül-Əziz ibn Abdullah ibn Baz, Məcmu fətava əl-Əllamə Əbdül-Əziz ibn Baz

2. Əbdül-Əziz ibn Mərzuq ət-Tureyfi, ət-Təhcil fi təxric ma ləm yuxrəcu min əl-əhadis vəl-asar fi İrvaul-ğəlil (Riyad: Məktəbətul-rüşd lil-nəşr vət-təuzi, 1-ci nəşr, 1422 h)

3. Abdullah ibn Muhəmməd ibn Əbi Şeybə İbrahim ibn Osman ibn Əbi Bəkr ibn Əbi Şeybə əl-Kufi əl-Ubsi, Müsənnəf İbn Əbi şeybə fil-əhadis vəl-asar (Darul-fikr: 1-ci nəşr, 1409 h.q) [təhqiq: Prof. Səif əl-Ləham]

4. Əbdür-Rəhman ibn Yəhya ibn Əli ibn Muhəmməd əl-Mualimi əl-Ətmi əl-Yəməni, ət-Tənkil bi ma fi təanibul-Kəbsəri min əl-əbatil, (əl-Məktəbul-İslami; 2-ci nəşr, 1406 h.q.) [təhqiq: Muhəmməd Nasiruddin əl-Əlbani, Zuheyr əş-Şəviş və Əbdür-Rəzzaq Həmzə]

5. Əli əl-Namazi əş-Şəhrudi, Müstədrəkat ilm ricalul-hədis (Tehran: Heydəri; 1-ci nəşr, 1414 h.q.)

6. Əli ibn Husaməddin əl-Müttəqi əl-Hindi, Kənzül-ümmal fi sünənül-əqval və əfal (Beyrut: Müəsissətur-risalə; 1989 h.q.)

7. Əbu Abdullah Əhməd ibn Hənbəl əş-Şeybani, əl-Müsnəd (Misir: Müəssisə Qurtubə) [təhqiq: Şueyb əl-Ərnaut]

8. Əbu Abdullah Əhməd ibn Hənbəl əş-Şeybani, əl-Müsnəd (Müəsissətur-risalə; 1-ci nəşr, 1421 h.q.) [təhqiq: Şueyb əl-Ərnaut, Adil Mürşid və digərləri]

9. Əbu Abdullah Muhəmməd ibn Abdullah əl-Hakim ən-Nisaburi, əl-Müstədrək ələs-səhiheyn (Beyrut: Darul-kutubil-ilmiyyə; 1-ci nəşr, 1411 h.q.) [təhqiq: Mustafa Əbdül-Qadir Əta]

10. Əbu Abdullah Muhəmməd ibn Əhməd əl-Ənsari əl-Qurtubi, əl-Cami li-əhkamul-Quran (Beyrut: Dar ihyaul-turasil-ərəbi; 1405 h.q.)

11. Əbu Abdullah Muhəmməd ibn Əhməd ibn Osman əz-Zəhəbi, Mizanul-itidal fi nəqdur-rical (Beyrut: Darul-marifə) [təhqiq: Əli Muhəmməd əl-Bəcəvi]





12. Əbu Abdullah Muhəmməd ibn Əhməd ibn Osman əz-Zəhəbi, Müxtəsərul-uluv lil-Aliyyul-Azim (əl-Məktəbul-İslami; 2-ci nəşr, 1412 h.q.) [təhqiq: Muhəmməd Nasiruddin əl-Əlbani]

13. Əbu Abdullah Muhəmməd ibn İsmayıl ibn İbrahim ibn Muğirə əl-Buxari əl-Cufi, əl-Camius-səhih (Beyrut: Dar İbn Kəsir; 3-cü nəşr, 1407 h.q.) [təhqiq: Dr. Mustafa Dib al-Bəğa]

14. Əbu Əbdür-Rəhman Əhməd ibn Şueyb ən-Nəsai, əl-Müctəba min əs-sünən (Hələb: Məktəbul-mətbuatul-İslamiyyə; 2-ci nəşr, 1406 h.q.) [təhqiq: Muhammad Nasiruddin əl-Əlbani]

15. Əbu Əbdür-Rəhman Muhəmməd Nasiruddin əl-Həcc Nuh əl-Əlbani, əs-Səmərul-mustətab fi fiqhus-sunnə vəl-kitab (Ğaras lil-Nnəşr vət-təuzi; 1-c nəşr, 1422 h.q.)

16. Əbu Əbdür-Rəhman Muhəmməd Nasiruddin əl-Həcc Nuh əl-Əlbani, Silsilətül-əhadisis-səhihə və şəyhun min fiqhihə və fəvaidihə (Riyad: Məktəbətl-məarif lil-nəşr vət-təuzi; 1-ci nəşr, 1415 h.q.)

17. Əbu Əbdür-Rəhman Muhəmməd Nasiruddin əl-Həcc Nuh əl-Əlbani, Səhihul-camius-səğir və ziyadətuhu (əl-Məktəbul-İslami)

18. Əbu Əbdür-Rəhman Muhəmməd Nasiruddin əl-Həcc Nuh əl-Əlbani, Mənzilətus-sunnə fil-İslam (Küveyt: Darus-sələfiyyə; 4-cü nəşr, 1404 h.q.)

19. Əbu İsa Muhəmməd ibn İsa əs-Suləmi ət-Tirmizi, əl-Camius-səhih sünənut-Tirmizi (Beyrut: Dar ihyaut-turasil-ərəbi) [təhqiq: Muhəmməd Nasiruddin əl-Əlbani]

20. Əbu Ubeyd əl-Bəkri, Fəslul-məqal şərhu kitabul-əmsal (Beyrut: Müəssisətur-risalə; 1-ci nəşr, 1971 m.) [təhqiq: İhsan Abbas]

21. Əbu Ubeyd əl-Qasim ibn Səlam əl-Hərəvi, Ğəribul-hədis (Heydərabad: Məclisu dairətul-məarifil-usmaniyyə; 1-ci nəşr, 1384 h.q.)

22. Əbu Əhməd Abdullah ibn Adiy əl-Cürcani, əl-Kamil fi duafair-rical (Darul-fikr lil-təbaat vən-nəşr vət-təuzi; 3-cü nəşr, 1409 h.q.)





23. Əbül-Abbas Əhməd ibn Əbdül-Həlim ibn Teymiyyə əl-Hərrani, Minhacus-sünnətin-nəbəviyyə (Müəssisə Qurtubə; 1-ci çap, 1406 h.q.) [təhqiq: Dr. Muhəmməd Rəşad Səlim]

24. Əbül-Əla Muhəmməd ibn Əbdür-Rəhman ibn Əbdür-Rəhim əl-Mübarəkfuri, Tuhfətul-əhvazi bi-şərh Camiut-Tirmizi (Beyrut: Darul-kutubil-ilmiyyə; 1-ci çap, 1410 h.q.)

25. Əbül-fəzl Əhməd ibn Əli ibn Muhəmməd ibn Əhməd ibn Həcər əl-Əsqəlani əş-Şafei, İthaful-məhərat bil-fəvaidil-mubtəkərət min ətraful-əşirə (Mədinə: Mərkəz xidmətus-sunnə vəs-sirətun-nəbəviyyə; 1-ci çap, 1415 h.q.)

27. Əbül-fəzl Cəmaluddin Muhəmməd ibn Mukrəm ibn Mənzur əl-Afriqi əl-Misri, Lisanul-ərəb (Beyrut: Dar Sadir; 1-ci nəşr)

28. Əbül-fida İsmayıl ibn Ömər ibn Kəsir əl-Qurəşi əd-Diməşqi, Təfsirul-Quranil-Əzim (Daru Teybə lil-nəşr vət-təuzi; 2-ci nəşr, 1420 h.q.) [təhqiq: Sami ibn Muhəmməd Sələmə]

29. Əbül-fida İsmayıl ibn Ömər ibn Kəsir əl-Qurəşi əd-Diməşqi, əl-Bidayə vən-nihayə (Dar ihyait-turasil-ərəbi; 1-ci nəşr, 1408 h.q.) [təhqiq: Əli Şiri]

30. Əbül-fida İsmayıl ibn Ömər ibn Kəsir əl-Qurəşi əd-Diməşqi, Qisasul-ənbiya (Darul-kutubil-hədisə; 1-ci nəşr, 1388 h.q.) [təhqiq: Mustafa Əbdül-Vahid]

31. Əbül-Həsən Əhməd ibn Abdullah ibn Salih əl-İcli əl-Kufi, Marifətus-siqat (Mədinə: Məktəbətud-Dar; 1-ci nəşr, 1405 h.q.)

32. Əbül-Hüseyn Əhməd ibn Faris ibn Zəkəriyyə, Mucəm məqayisul-luğə (Qum: Məktəbul-Əlamil-İslami; 1404 h.q.) [təhqiq: Əbdüs-Səlam Muhəmməd Harun]

33. Əbül-Qasim Əli ibn əl-Həsən ibn Hibətulla ibn Abdullah, İbn Əsakir əş-Şafei, Tarixu-Mədinəti-Diməşq (Beyrut: Darul-Fikr; 1-ci çap, 1417 h.q.) [təhqiq: Əli Şiri]

34. Əbül-Qasim əl-Hüseyn ibn Muhəmməd ibn əl-Müfəzzəl ər-rağib əl-İsfəhani, Təfsir ər-Rağib əl-İsfəhani və müqəddimətu (Külliyətul-ədəb, Camiətu Tənta; 1-ci çap, 1412 h.q.) [təhqiq: Dr. Muhəmməd Əbdül-Əziz Bəsyuni]





35. Əbül-Qasim Carullah Mahmud ibn Ömər əz-Zəməxşəri, əl-Kəşşaf (Beyrut: Darul-kitabil-ərəbi; 1407 h.q.)

36. Əbül-Qasim Süleyman ibn Əhməd ibn Əyyub ət-Təbərani, Mucəmul-kəbir (Mosul: Məktəbətul-ulum vəl-hukm; 2-ci nəşr, 1404 h.q.) [təhqiq: Həmadi ibn Əbdül-Məcid əl-Sələfi]

37. Əbu Bəkr Abdullah ibn Əbi Şeybə, Müsnəd İbn Əbi Şeybə (Riyad: Darul-Vətən; 1-ci çap, 1418 h.q.) [təhqiq: Adil ibn Yusuf əl-Əzazi və Əhməd ibn Fərid əl-Məzidi]

38. Əbu Bəkr Əhməd ibn əl-Hüseyn ibn Əli ibn Musa əl-Beyhəqi, Sünənul-kubra (Məkkə: Məktəbətu Darul-Baz; 1414 h.q.) [təhqiq: Muhəmməd Əbdül-Qadir Əta]

39. Əbu Bəkr Muhəmməd ibn İshaq ibn Xuzeymə əs-Sələmi ən-Nisaburi, Səhih (Beyrut: əl-Məktəbul-İslami; 1390 h.q.) [təhqiq: Muhəmməd Nasiruddin əl-Əlbani və Dr.Muhəmməd Mustafa əl-Əzami]

40. Əbu Davud Süleyman ibn əl-Əşəs əs-Sicistani əl-Əzdi, Sünən (Darul-Fikr) [təhqiq: Muhəmməd Nasiruddin əl-Əlbani]

41. Əbu Həfs Ömər ibn Şahin, Tarixu Əmsaus-siqat (Darus-sələfiyyə; 1-ci çap, 1404 h.q.)

42. Əbu Hatim Muhəmməd ibn Hibban ibn Əhməd ət-Təmimi əl-Busti, Kitabus-siqat (Heydərabad: Məclusu Dairəul-Məarifil-Usmaniyyə; 1-ci çap, 1398 h.q.)

43. Əbu Cəfər Əhməd ibn Muhəmməd ibn Sələmə ibn Əbül-Malik ibn Səlmə əl-Əzdi əl-Həcəri əl-Məsri ət-Təhavi, Şərh Müşkilil-asar (Müəssisətur-risalə; 1-ci çap, 1415 h.q.) [təhqiq: Şueyb əl-Ərnaut]

44. Əbu Cəfər Muhəmməd ibn Cərir ibn Yezid ibn Kəsir ibn Ğalib əl-Amuli ət-Təbəri, Camiul-bəyan fi təvilul-Quran (Darul-Fikr; 1415 h.q.) [təhqiq: Sidqi Cəmil əl-Əttar]

45. Əbu Mənsur Muhəmməd ibn Əhməd əl-Əzhəri, Təhzibul-lüğət (Beyrut: Daru ihyait-turasil-ərəbi; 1-ci çap, 2001 m.)





46. Əbu Səadət əl-Mubarək ibn Muhəmməd, İbn Əsir əl-Cəziri, ən-Nihayə fi ğəribul-hədis vəl-asar (Beyrut: əl-Məktəbətul-ilmiyyə; 1399 h.q.) [təhqiq: Tahir Əhməd əz-Zəvi və Mahmud Muhəmməd ət-Tənahi]

47. Əbu Yalə Əhməd ibn Əli ibn Musənna əl-Mosuli ət-Təmimi, əl-Müsnəd (Dəməşq: Darul-məmun lit-turas; 1-ci çap, 1404 h.q.) [təhqiq: Dr. Hüseyn Səlim Əsəd]

48. Əbu Yusuf Yaqub ibn Süfyan əl-Fəsəvi, əl-Marifə vət-tarix (Beyrut: Darul-kutubil-ilmiyyə) [təhqiq: Xəlil əl-Mənsur]

49. Əbu Zəkəriyya Yəhya ibn Şərəf ən-Nəvəvi, ŞƏrh Səhih Müslim (Beyrut: Darul-kitabil-ərəbi; 1407 h.q.)

50. Şihabuddin Əbül-fəzl Əhməd ibn Əli ibn Muhəmməd Həcər əl-Əsqəlani əş-Şafei, əl-Mətalibul-aliyə bi-zəvaidil-məsanidis-səmaniyyə (Riyad: Darul-Asimə; 1-ci çap, 1420 h.q.) [təhqiq: Abdullah ibn Zəfir ibn Abdullah əş-Şəhri]

51. Şihabuddin Əbül-fəzl Əhməd ibn Əli ibn Muhəmməd Həcər əl-Əsqəlani əş-Şafei, Təqribut-təhzib (Beyrut: Darul-məktəbətul-ilmiyyə; 2-ci çap, 1415 h.q.) [təhqiq: Mustafa Əbdül-Qadir Əta]

52. Şihabuddin Əbül-fəzl Əhməd ibn Əli ibn Muhəmməd Həcər əl-Əsqəlani əş-Şafei, Hadius-sari müqəddimə Fəthul-bari (Beyrut: Dar ihyait-Turasil-ərəbi; 4-cü çap, 1408 h.q.)

53. Əhməd ibn Əbi Bəkr ibn İsmayıl əl-Busiri, İthaful-xiyərətil-məhəra bi-zəvaidil-məsanidil-əşəra, (Riyad: Darul-vətən; 1-ci çap, 1420 h.q.)

54. Əl-Qazi Əbül-fəzl İyad ibn Musa ibn İyad əl-Yəhsubi əs-Sibti əl-Maliki, Məşariqul-ənvar əla sihahul-asar (əl-Məktəbətul-atiqə və Darut-turas)

55. əl-Qazi Əbu İshaq İsmayıl ibn İshaq ibn İsmayıl ibn Həmmad ibn Zeyd əl-Əzdi əl-Bəsri əl-Bağdadi əl-Maliki əl-Cəhzəmi, Fəzlu səlat ələn-nəbi (Beyrut: əl-Məktəbul-İslami; 3-cü nəşr, 1397 h.q.) [təhqiq: Muhəmməd Nasiruddin əl-Əlbani]

56. Dr. Ruhi Baalbaki, əl-Məvrid: Müasir ərəbcə-ingiliscə lüğət {A Modern Arabic-English Dictionary} (Beyrut: Darul-ilm lil-malayin; 7-ci çap, 1995 m.)





